# AZƏRBAYCAN MƏKTƏBİ

***Elmi-nəzəri, pedaqoji jurnal***

**2017**
**№ 3 (679)**
***(may-iyun)***

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1065, Bakı şəhəri,*
*Yasamal rayonu, Azad Mirzəyev küç., 236*

*Telefon/Faks*
*(012) 538-82-65*
*(012) 538-82-67*

*Rekvizitlər:*
*Kapital Bankın Gənclik Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**

## BU NÖMRƏDƏ

## *İ n n o v a s i y a l a r*



## *M e t o d i k a, q a b a q c ı l t ə h s i l*



## *A r x i v i m i z d ə n*




**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 05**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**

# AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİNİN 100 İLLİK YUBİLEYİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

2018-ci il may ayının 28-də müsəlman Şərqində ilk parlamentli respublikanın – Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 illiyi tamam olur.

Qədim və zəngin dövlətçilik ənənələrinə malik Azərbaycan xalqı keçmişinin müəyyən dövrlərində tarixin hökmü ilə böyük imperiyalar tərkibinə qatılmaq məcburiyyətində qalmışdır. Azərbaycan Xalq Cümhuriyyəti məhz dünyanın siyasi nizamının yenidən qurulduğu bir vaxtda, XIX əsrin axırları və XX əsrin əvvəllərində Azərbaycanın yaşadığı parlaq mədəni yüksəliş mərhələsinin məntiqi yekunu kimi meydana çıxmışdır.

XIX əsrin birinci yarısından etibarən maarifçilik ideyalarının yayılması ilə Azərbaycanda baş vermiş köklü ictimai-siyasi və mədəni dəyişikliklər yeni tipli teatrın, məktəbin və mətbuatın yaranmasını təmin etməklə milli özünüdərkin gerçəkləşməsi üçün zəmin hazırladı. Abbasqulu ağa Bakıxanov və Mirzə Fətəli Axundzadə ilə başlayan bu yolu yeni tarixi mərhələdə Həsən bəy Zərdabi, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Əli bəy Hüseynzadə və digər görkəmli şəxsiyyətlər davam etdirərək milli məfkurənin təşəkkülü və inkişafına mühüm təsir göstərirdilər. Həmin dövrdə güclü sahibkarlar təbəqəsinin formalaşdığı neft şəhəri Bakı, eyni zamanda, milli ruhlu ziyalılar nəslinin yetişdiyi ictimai-siyasi fikir mərkəzinə çevrilmişdi. Rusiyanın Dövlət dumalarına və Müəssislər məclisinə seçilmiş azərbaycanlılar müstəmləkədən azad, demokratik dövlət sistemi yaratmağa hazır idilər.

Bununla yanaşı, Rusiyada çarizmin süqutundan sonra bolşeviklərin hakimiyyəti ələ keçirməsi ilə keçmiş imperiya ərazisində mürəkkəb geosiyasi vəziyyət yaranmışdı. Dünyanın aparıcı dövlətlərinin Bakı neftinə marağının siyasi çarpışmaları daha da gərginləşdirdiyi belə bir şəraitdə Azərbaycanın tərəqqipərvər siyasi elitası müstəqil milli dövlətçiliyin yaradılması naminə birləşdi.

1918-ci il may ayının 28-də Azərbaycanın müstəqilliyini bəyan edən İstiqlal bəyannaməsi qəbul edildi. Yeni qurulan Azərbaycan Xalq Cümhuriyyəti öz üzərinə götürdüyü çətin tarixi vəzifəni imkanlarının ən son həddində çalışaraq şərəflə yerinə yetirdi. Azərbaycanın ilk Parlamenti və Hökuməti, dövlət aparatı təşkil edildi, ölkənin sərhədləri müəyyənləşdirildi, bayrağı, himni və gerbi yaradıldı, ana dili dövlət dili elan edildi, dövlət quruculuğu sahəsində ciddi tədbirlər həyata keçirildi. Ölkənin ərazi bütövlüyü və milli təhlükəsizliyi təmin edildi, qısa müddətdə yüksək döyüş qabiliyyətli hərbi hissələr yaradıldı, milli tələblərə və demokratik prinsiplərə uyğun dövlət orqanları quruldu, maarifin və mədəniyyətin inkişafına xüsusi diqqət yetirildi, Azərbaycanın ilk universiteti təsis olundu, təhsil milliləşdirildi, xalqın sonrakı illərdə mədəni yüksəlişi üçün zəmin hazırlayan, ictimai

fikir tarixi baxımından müstəsna əhəmiyyətli işlər görüldü.

Mövcudluğunun ilk günlərindən xalq hakimiyyəti və insanların bərabərliyi prinsiplərinə əsaslanan Azərbaycan Xalq Cümhuriyyəti bütün ölkə vətəndaşlarına eyni hüquqlar verərək irqi, milli, dini, sinfi bərabərsizliyi ortadan qaldırdı. Cümhuriyyət parlamentinin il yarımlıq fəaliyyəti boyunca qəbul etdiyi qanunlar milli dövlətin müstəqilliyinin möhkəmləndirilməsinə, siyasi və iqtisadi inkişafa, mədəniyyət və maarif sahələrində sürətli irəliləyişə imkan verdi. Azərbaycan Xalq Cümhuriyyəti daim sülhsevər siyasət apararaq bütün dövlətlərlə qarşılıqlı əməkdaşlıq əlaqələri yaratmağa və bir-birinin hüquqlarına hörmət prinsipləri əsasında münasibətlər qurmağa cəhd göstərirdi. Dünya birliyi tərəfindən tanınmış Xalq Cümhuriyyətinin fəaliyyəti sayəsində Azərbaycanın beynəlxalq hüququn subyekti olması 1920-ci ilin aprel ayındakı bolşevik işğalından sonra Azərbaycanın bir dövlət kimi dünyanın siyasi xəritəsindən silinməsinin qarşısını aldı.

Azərbaycan Xalq Cümhuriyyəti təcavüzə məruz qaldığı üçün qarşıya qoyduğu məqsədlərə tam müvəffəq ola bilmədən süquta uğrasa da, onun şüurlarda bərqərar etdiyi müstəqillik ideyası unudulmadı. Azərbaycan xalqı ötən dövr ərzində milli dövlətçilik atributlarının bir çoxunu qoruyub saxlaya bildi. Ümummilli lider Heydər Əliyevin respublikada uğurla gerçəkləşdirdiyi siyasət xalqımızın tarixi-mədəni yaddaşını özünə qaytararaq milli mənlik şüurunu inkişaf etdirdi, azərbaycançılıq məfkurəsi işığında müstəqillik arzularının güclənməsi və yaxın gələcəkdə yenidən həqiqətə çevrilməsinə zəmin yaratdı.

1991-ci ildə müstəqilliyinin bərpasına nail olarkən müasir Azərbaycan Respublikası özünün qədim dövlətçilik ənənələrinə sadiq qaldığını göstərdi, Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisi olmaqla onun üçrəngli bayrağını, gerbini, himnini qəbul etdi. Xalqımız Cümhuriyyətin istiqlalını dünyaya yaydığı 28 May gününü həmin vaxtdan Respublika Günü olaraq təntənə ilə qeyd edir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, milli dövlətçilik salnaməsini müstəsna dərəcədə zənginləşdirmiş Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyinin layiqincə keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illik yubileyi respublikada dövlət səviyyəsində geniş qeyd edilsin.
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.
3. Azərbaycan Respublikasının Milli Məclisinə Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin yaranmasının 100 illik yubileyi münasibətilə xüsusi iclasın keçirilməsi tövsiyə edilsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının**
**Prezidenti**
**Bakı şəhəri, 16 may 2017-ci il**



# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN TƏHSİLİNİN MİLLİLƏŞDİRİLMƏSİ STRATEGİYASI

**Cəfər Cəfərov,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor***

*Təhsil sahəsi xalqımızın bu günü, millətimizin, dövlətimizin gələcəyi üçün ən vacib bir sahədir.*

***Heydər Əliyev***
***Ümummilli lider***

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin görkəmli dövlət xadimi kimi fəaliyyəti ictimai həyatın bütün sahələrində – iqtisadiyyatda, mədəniyyətdə, elm və təhsildə, təsərrüfatda, ictimai şüurda sərbəstlik, azadlıq və müstəqillik ideyalarının formalaşdırılmasına yönəlmişdir. Bu ideyaların həyata keçməsi Azərbaycanın müstəqil dövlət kimi formalaşmasının ideya bazasını təmin etmişdir. Ulu öndərin zəngin nəzəri irsində və fəaliyyətində təhsil məsələləri də önəmli yer tutur.

Böyük rəhbər bütün fəaliyyəti boyu təhsil sahəsinə diqqət və qayğısını əsirgəməmiş, cəmiyyətdə yüksək bilikli, intellektual və elitar təbəqənin formalaşmasına çalışmışdır. Görkəmli dövlət xadimi deyirdi: “Hər bir dövlət əgər istəyirsə ki, öz ölkəsinin inkişafını təmin etsin, öz millətinin elmini, mədəniyyətini dünya standartlarına çatdırsın, o mütləq, hər şeydən çox, təhsilə fikir verməlidir, təhsilin inkişafına səy göstərməlidir, təhsil üçün bütün imkanları yaratmalıdır”.

Təsadüfi deyildir ki, Heydər Əliyevin respublikaya birinci dəfə rəhbərlik etdiyi 1969–1982-ci illər həm də Azərbaycan elminin, təhsilinin intibah dövrü kimi xatırlanır. Ulu öndərin şəxsi təşəbbüskarlığı, qətiyyəti və iradəsi nəticəsində həmin illərdə 700-dən artıq məktəb binası tikilərək istifadəyə verilmişdir. Bu illərdə respublikada ali təhsil müəssisələrinin sayı 12-dən 17-yə, burada təhsil alan tələbələrin sayı isə 70 mindən 100 minə çatmışdır. Böyük rəhbərin 70-ci illərdə minlərlə azərbaycanlı gəncin respublikamızın hüdudlarından kənarda yüksək ali təhsil almasına, ixtisaslı kadr kimi yetişməsinə hər cür kömək göstərməsi də onun xeyirxahlığının bariz ifadəsidir. Respublikaya birinci rəhbərliyi dövründə 10 mindən artıq gənci keçmiş SSRİ respublikalarının ali məktəblərinə təhsil almağa göndərən Heydər Əliyev yüksək ixtisaslı və peşəkar kadrların hazır-

lanması, dövlət idarəçiliyi sisteminin sağlamlaşdırılması məsələlərinə ciddi fikir vermişdir.

O illərdə Heydər Əliyev Azərbaycanda bir sıra yeni ixtisaslar üzrə – informasiya texnologiyaları, beynəlxalq hüquq, beynəlxalq münasibətlər, aviasiya və s. mütəxəssis hazırlayan ali məktəblərin olmadığını nəzərə alaraq minlərlə azərbaycanlı gəncin Moskva, Kiyev, Minsk və başqa şəhərlərdəki nüfuzlu ali məktəblərə göndərilməsini təmin etmişdir.

Ümummilli lider Heydər Əliyev həmişə təhsilə, tərbiyəyə strateji sahə kimi baxmışdır: "Təhsil sahəsi xalqımızın bu günü, millətimizin, dövlətimizin gələcəyi üçün ən vacib bir sahədir". Heydər Əliyev insan hüquq və azadlıqlarının təminatı baxımından vətəndaşların təhsil hüququnun reallaşdırılmasına böyük önəm vermişdir. Təhsil hüququ 1995-ci il 12 noyabrda ümumxalq səsverməsi yolu ilə qəbul olunmuş Konstitusiyada təsbit edilmişdir. Dövlət vətəndaşların pulsuz icbari, ümumi və orta təhsil almaq hüququnu təmin edir. Konstitusiyanın bu müddəası Azərbaycan Respublikasında təhsil fəaliyyətinin əsas prinsipidir.

Ulu öndər Heydər Əliyev hər bir şagirdin fənləri mükəmməl bilməsini vacib sayırdı. O deyirdi: "Bizim uşaqlarımız, gənclərimiz hər bir fənni bilməlidirlər və xüsusən o fənlərdə ki, ixtisaslaşmaq istəyir, onu daha da yaxşı bilməlidirlər... Amma orta məktəblər üçün bizim bir neçə şərtlərimiz vardır, onları həyata keçirməlidirlər. Ana dilini bilməlidirlər, ədəbiyyatımızı bilməlidirlər, bizim tariximizi bilməlidirlər, bizim mədəniyyətimizi bilməlidirlər". Təhsilin məzmunca milli müstəqilliyimizin prinsiplərinə uyğunlaşdırılmasında humanitar fənlərin, xüsusən Azərbaycan dilinin, tarixinin və ədəbiyyatının tədrisinin mahiyyətcə yeniləşməsini də dahi rəhbər çox vacib şərt saymışdır.

Milli təhsilimizin böyük hamisi ilk gündən bu sistemdə islahatların təkamül yolu ilə aparılması tərəfdarı kimi çıxış etmişdir: "Təhsil sistemi elə bir sistemdir ki, burada heç bir inqilabi dəyişiklik ola bilməz. Ümumiyyətlə, bizim həyatımızın bütün sahələrində dəyişikliklər təkamül xarakteri, tədrici dəyişikliklər xarakteri daşıyır… Təhsil qanunu elə bir qanundur ki, təhsil islahatları elə islahatlardır ki, iqtisadiyyatdan, maliyyədən, başqa sahələrdən fərqli olaraq, bunda bütün cəmiyyətin iştirakı lazımdır".

1998-ci ildə imzaladığı "Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası haqqında" sərəncamda müstəqil Azərbaycanın təhsil sistemində beynəlxalq standartlara uyğun islahatların həyata keçirilməsi, təhsilin inkişafı və onun maddi-texniki bazasının möhkəmləndirilməsi, Avropa təhsil məkanına inteqrasiyanın təmin edilməsi kimi mühüm vəzifələr önə çəkilmişdir. 15 iyun 1999-cu il tarixdə ulu öndər tərəfindən təsdiq olunmuş "Azərbaycan Respublikasında Təhsil İslahat Proqramı"nın əsas mahiyyətini isə təhsil sistemində islahatların təkamül yolu ilə getməsi, dünya təhsil sisteminin Azərbaycanın milli xüsusiyyətləri ilə əlaqələnməsi məsələləri təşkil edir.

Dövlət başçısı kimi Heydər Əliyevin "Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında" 13 iyun 2003-cü il tarixli fərmanı isə təhsil sisteminin əsaslı şəkildə təkmilləşdirilməsinə,

idarəetmənin müasir prinsiplər üzrə təşkilinə, onun beynəlxalq standartlara uyğunlaşdırılmasına və dünya təhsil sisteminə inteqrasiyasına zəmin yaratmışdır. Ulu öndərin layiqli davamçısı Prezidentimiz İlham Əliyev təhsil sahəsində yeniliyə, inkişafa nail olmaq və intellektuallığı artırmaq üçün bir çox fərmanlar, sərəncamlar imzalamışdır.

Azərbaycan Respublikası Konstitusiyasının qəbul olunması ilə müstəqillik yolunda ilk addımlarını atan Azərbaycan bütün sahələrdə, o cümlədən təhsil sahəsində ümumi siyasətin zəruri prioritet istiqamətlərini müəyyənləşdirdi. Ulu öndər Heydər Əliyev ölkənin təhsil sahəsində milli siyasətin müəyyənləşdirilməsi ilə bağlı öz töhfələrini verdi. O, Azərbaycanın inkişaf etdirilməsi və müasir dünyadakı mövqeyinin möhkəmləndirilməsi məqsədilə Təhsil İslahatı Komissiyasının iclasında çıxış edərək bildirdi ki, "İndi bizdə təhsil sistemində islahatların məqsədi ondan ibarətdir ki, Azərbaycanın təhsil sistemi dünya təhsil sisteminin standartları ilə uyğunlaşsın".

Həmin dövrdə qəbul olunmuş İslahat Proqramında bu fikir prioritet istiqamət kimi əsas götürülməklə fəaliyyətlərin əsasına gətirildi. Artıq ilk dəfə olaraq dövlətin islahatçılıq fəaliyyətinin didaktik əsasını təşkil edən prinsiplər qəbul edildi. "Demokratikləşdirmə, humanistləşdirmə, inteqrasiya, diferensiallaşdırma, fərdiləşdirmə, humanitarlaşdırma prinsiplərinə əsaslanmaq yeni təhsil sisteminin" mühüm vəzifələrindən biri kimi İslahat Proqramına daxil edildi və islahatların aparıldığı dövrdə praktik olaraq həmin prinsiplərin reallaşdırılması istiqamətində işlər görüldü. Bu ideya aparıcı bir xətt kimi davam etdirilməklə 2009-cu ildə Təhsil Qanununda bir daha təsbit olundu.

Təbii ki, hər bir milli təhsilin mərkəzində məktəb, təhsil sektorları dayanır. Bu baxımdan ümummilli liderimiz Heydər Əliyevin məktəb haqqında fikirlərini xatırlatmaq yerinə düşər: "Məktəbdə insanın dünyagörüşünün bünövrəsi qoyulur, onun xarakteri formalaşır, ideya dayaqlarının, mənəvi və əxlaqi dayaqların təməli yaradılır. Məktəbin təsiri altında əqidəliliyi, əməyə məhəbbət, yüksək mənəviyyat və humanizm, vətənpərvərlik və beynəlmiləlçilik kimi zəruri keyfiyyətləri tərbiyə edilir. Məktəbdə insanın baxışları, arzu və istəkləri formalaşır, onun rəhbər tutduğu mənəvi meyarlar bir çox cəhətdən müəyyənləşir".

Nadir zəka sahibi olan Heydər Əliyev həmişə yeniliyin, qabaqcıl təcrübənin öyrənilməsinə maraq göstərmiş, müdrik kəlamları ilə onu təsdiqləmişdir: "Dünya təcrübəsindən Azərbaycanın milli xüsusiyyətlərinə uyğun olan prinsiplər, qaydalar təhsil sistemimizə tətbiq edilməlidir. Biz dünyanın bütün ölkələrində – Qərbdə də, Şərqdə də əldə olunmuş nailiyyətləri dərindən öyrənməli və onlardan Azərbaycan üçün müsbət xarakter daşıyan cəhətləri ölkəmizin təhsil sisteminə tətbiq etməliyik".

Azərbaycan təhsilinin inkişafı, yüksəlişi orta məktəb üçün pedaqoji kadrlar hazırlayan ADPU-nun professor-müəllim və tədris yardımçı heyətinin üzərinə böyük yük qoyur, əsas hədəflərə doğru getməyin vacibliyini qətiləşdirir. 2015-ci ilin noyabr ayından Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu ADPU-ya birləşdirildikdən və Azərbaycan Dövlət Pedaqoji Kolleci universitetin tərkibinə verildikdən

sonra bu ali məktəbin həyatında zamanın tələblərinə uyğun yeniləşmə işlərinin aparılması zərurəti aydın duyulurdu. Odur ki, universitetdə aparılacaq islahat işlərinin əsas istiqamətləri belə müəyyənləşdirildi: təhsilin təşkili və tədris prosesinin keyfiyyətinin yüksəldilməsi; elmi işlərin təkmilləşdirilməsi və inkişafı istiqamətində lazımi tədbirlər görülməsi; insan resurslarının inkişafı, kadr və struktur islahatlarının həyata keçirilməsi; maddi-texniki bazanın təkmilləşdirilməsi və infrastrukturun inkişafı.

Nəzərdə tutulan islahat işlərinin səmərəli şəkildə həyata keçirilməsini təmin etmək, idarəçiliyi təkmilləşdirmək üçün universitetdə təxirəsalınmaz struktur dəyişiklikləri həyata keçirildi. Çağdaş idarəçilik prinsiplərinin tələblərinə uyğun olaraq, keçmiş kadrlar şöbəsinin əvəzinə, funksiya və səlahiyyətləri xeyli genişləndirilmiş insan resursları şöbəsi, tədris hissəsinin əvəzinə isə tədrisin idarə olunması və təhsil texnologiyaları mərkəzi yaradıldı.

Ali məktəblə orta məktəblər arasında əməkdaşlıq əlaqələrinin genişləndirilməsi, bu əlaqələrin keyfiyyətinin yüksəldilməsi, pedaqoji təhsil sahəsində təlim-tərbiyənin və tədrisin keyfiyyətinin yüksəldilməsinə nail olmaq üçün Azərbaycan Dövlət Pedaqoji Universitetində Bakı şəhərinin ümumtəhsil məktəblərinin direktorları ilə görüşlər keçirilir. Bilikli, savadlı, bacarıqlı gənclərin ADPU-ya cəlb edilməsinə nail olmaq üçün ADPU-da “Açıq qapı günü” keçirilir.

Azərbaycan Dövlət Pedaqoji Universitetində tədris prosesinin təkmilləşdirilməsi, təhsilalanların və təhsilverənlərin birgə fəaliyyətinin yeni metod və vasitələrlə keyfiyyətli nəticələr əldə edilməsinə istiqamətləndirilməsi məqsədilə bir sıra layihələr həyata keçirilir. Belə layihələrdən biri də “Ustad dərsləri” layihəsidir. ADPU-da həyata keçirilən “Ustad dərsləri” layihəsində ümumtəhsil məktəblərində çalışan, iş təcrübəsi və tədris nəticələri ilə fərqlənən müəllimlərin tədris etdikləri fənlər üzrə ADPU-da uyğun fənnin tədrisi metodikasından ustad dərsləri aparmaları nəzərdə tutulur. Hazırda həyata keçirilən bu layihəyə qabaqcıl təcrübəsi, yaradıcı fəaliyyəti, innovativ düşüncə tərzi ilə ölkə pedaqoji mühitində tanınan, orta ümumtəhsil məktəbi müəllimlərinin mövcud bazasında adları yer alan əməkdar müəllimlər, 2008-2015-ci illərdə keçirilmiş “Ən yaxşı müəllim” müsabiqəsinin qalibləri, orta məktəb müəllimlərinin diaqnostik qiymətləndirilməsi zamanı yüksək nəticələr əldə edən, müxtəlif təltiflərə layiq görülən, həmçinin “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsili üzrə Dövlət Proqramı” üzrə təhsil almış müəllimlər cəlb ediliblər.

Təhsil Nazirliyinin “Twining” layihəsi çərçivəsində hazırlanan yeni akkreditasiya qaydalarının pilot qiymətləndirilməsinin həyata keçirilməsi üçün seçilən 3 ali təhsil müəssisəsindən biri Azərbaycan Dövlət Pedaqoji Universitetidir. Bu məqsədlə tədris ilinin sentyabr, oktyabr və noyabr aylarında universitetdə Təhsil Nazirliyinin Akkreditasiya və Nostrifikasiya İdarəsinin əməkdaşları, layihə üzrə Finlandiyadan və Estoniyadan gəlmiş ali təhsil ekspertlərinin iştirakı ilə təlimlər keçirilmiş və sonda ADPU-nun özünüqiymətləndirmə sənədi hazırlanaraq layihə rəhbərliyinə təqdim olunmuşdur. Plana əsasən, cari ilin 11-13 aprel tarixlərində ADPU-da Özünütəhlil hesabatı

üzrə Qiymətləndirmə Qrupu fəaliyyətə başlamış və ADPU-nun özünüqiymətləndirmə sənədi xarici ekspertlərin də cəlb olunacağı qrup tərəfindən dəyərləndirilmişdir.

Bütün bunlardan başqa, “Sağlam təhsil-sağlam millət” layihəsi çərçivəsində sağlam təhsil prinsiplərinin inkişafı üçün Azərbaycan Dövlət Pedaqoji Universitetində “Sabah qrupları”nda və həmçinin universitetin İbtidai təhsil fakültəsində ibtidai siniflər üçün pedaqoji kadr hazırlığında sağlam təhsil prinsiplərinin nəzərə alınması və zəruri tədbirlərin həyata keçirilməsi istiqamətində işlər görülür. Belə ki, “Sağlam təhsil – sağlam millət” layihəsinə uyğun olaraq gələcək ibtidai sinif müəllimlərini Sağlam təhsil sinifləri ilə əyani şəkildə tanış etmək məqsədilə İbtidai təhsil fakültəsinin nəzdində “Sağlam təhsil pedaqogikası mərkəzi” və “Sağlam təhsil auditoriyası” yaradılmışdır.

Təhsil Nazirliyinin “Sağlam təhsil – sağlam millət” layihəsinin tədqiqi vəziyyətinin monitorinqinin nəticələrinə dair hesabat ibtidai təhsil fakültəsində “Uşaq anatomiyası, fiziologiyası və gigiyenası”, “Həyat bilgisi və onun tədrisi metodikası”, “Fiziki tərbiyə və onun tədrisi metodikası”, “Pedaqogika”, “İbtidai təhsilin pedaqogikası”, “Tibbi biliklərin əsasları” fənlərini tədris edən müəllimlərin iştirakı ilə müzakirə olunmuş, tədqiqatın nəticələrindən müvafiq mühazirə və praktik məşğələlərdə istifadə etmək tövsiyə olunmuşdur. “İbtidai sinif müəllimliyi” ixtisasında həmin fənlərin tədrisində gələcək ibtidai sinif müəllimlərinə məktəblilərin sağlamlığı və sağlam təhsil texnologiyaları ilə bağlı daha geniş məlumatların verilməsi nəzərdə tutulmuşdur.

Gələcəyin qurucuları olan yeni nəslin milli ideologiyaya yiyələnməsi məktəbdən başlayır və bu işin düzgün təşkili ölkə üçün həyati əhəmiyyətə malikdir. Ona görə də ümummilli liderimiz tövsiyə edirdi: “Milli ideologiyamızı hər yerdə tətbiq etmək üçün məktəblərdə Azərbaycan xalqının tarixinin tədrisinə çox ciddi fikir vermək lazımdır. Gənclərimiz öz tarixini, öz tarixi keçmişini gərək yaxşı bilsinlər”. Eyni ciddi vəzifələri ulu öndər Azərbaycanın dövlət atributlarının, dilinin, ədəbiyyatının, mədəniyyətinin öyrənilməsi sahələrinə də aid etmişdir.

Hazırda Prezident İlham Əliyevin rəhbərliyi ilə Azərbaycanda təhsil sisteminin inkişafı üçün məqsədyönlü işlər görülür. Əminliklə deyə bilərik ki, Azərbaycan Dövlət Pedaqoji Universitetində aparılan islahat zəngin ənənəyə, ümumbəşəri dəyərlərə və beynəlxalq təcrübəyə əsaslanır. Kollektivimiz təhsil quruculuğu işini uğurla başa çatdıracaq, ümummilli lider Heydər Əliyevin müdrik tövsiyələrini bütünlüklə həyata keçirəcək.

# BİZİM UNİVERSİTETDƏ KOLLOKVİUMLAR YENİ TƏLİM SƏVİYYƏSİNİN TƏMİNATIDIR




**Xalıq Yahudov,**
***Azərbaycan Texniki Universitetinin rektor əvəzi***



**Eldar Qocayev,**
***Azərbaycan Texniki Universitetinin Fizika kafedrasının müdiri, professor***

**Naxçıvan Səfərov,**
***pedaqogika üzrə elmlər doktoru***

Sənaye istehsalının indiki yüksəlişi ilə müşayiət olunan cəmiyyətin inkişafının müasir mərhələsində çoxlu sayda yüksək savadlı mühəndis kadrların hazırlanmasına ehtiyac vardır. Bu tələbin yerinə yetirilməsində əsas alət ali məktəbdir; o, iqtisadiyyatın və bütün ictimai həyatın inkişafının vacib tənzimləyicisi kimi çıxış edir.

Ali ixtisas təhsilinin əsas məqsədi yüksək ixtisaslı, uyğun səviyyəli və istiqamətli mütəxəssisin hazırlanması, əmək bazarında rəqabətədavamlı, öz ixtisasını sərbəst bilən və müştərək iş sahələrində öz ixtisasını dünya standartları səviyyəsinə çatdırmağa cəhd edən, ixtisas artımı ilə daimi məşğul olan, sosial və ixtisas mobilliyi ilə fərqlənən, həyati bacarıqların formalaşması üçün tələb olunan kompetensiyalara yiyələnmiş şəxsiyyətin yetişdirilməsidir.

Müasir dövrdə Azərbaycanın ali təhsilinin ən vacib alt sistemlərindən biri mühəndis təhsilidir. Mühəndis təhsili təkcə təhsil sferasının yox, həm də ölkənin iqtisadiyyatının açarı olan sahədir. Sübut etməyə ehtiyac yoxdur ki, Azərbaycanın mühəndis korpusunun tərkibindən, onların səriştəsindən ölkənin elmi-texniki inkişafının tempi, təhlükəsizliyi, istehsalının inkişafı, nəhayət, beynəlxalq nüfuzu çox asılıdır. Müasir şəraitdə mühəndis təhsilinin əsas məsələsi müasir dünya iqtisadiyyatının tələblərinə cavab verən mühəndislərin hazırlanmasını təmin etməkdən ibarətdir.

Azərbaycan təhsil sistemində mövcud olan təxirəsalınmaz məsələlərin, o cümlədən araşdırdığımız problemlərin həlli üçün bir sıra dövlət sənədləri qəbul edilmişdir.

Ümummilli liderimiz Heydər Əliyev və Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev mühəndis təhsili və təhsil sistemində mövcud olan digər problemlərin həlli ilə bağlı bir sıra qərarlar, fərmanlar, sərəncamlar imzalamışlar. Son dövrlərdə qəbul edilmiş sənədlərdən biri Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"dır [1].

Strategiyanın strateji istiqamətlərinin hədəflərinə müasir ali peşə təhsili sistemində təhsil prosesinin səmərəliliyinin yüksəldilməsi üçün yeni üsul və vasitələrin axtarışı, təlim nəticələrinin qiymətləndirilməsi qaydalarının təkmilləşdirilməsi problemləri daxil edilmişdir. Təhsil standartlarına cavab verən yeni pedaqoji texnologiyaların işlənməsi və tətbiqi, universitetlərin fəaliyyətində prioritet təşkil etməsi önə çəkilmişdir.

Yüksək nəticələr əldə etmək üçün təlim pedaqoji texnologiya meyarlarına cavab verməlidir [5].

**Cədvəl 1**

Pedaqoji texnologiya meyarları

| **Meyarlar** | **Meyarların məzmunu** |
|---|---|
| Sistemlilik - texnologiyanın ən vacib keyfiyyətidir, müəyyən qayda ilə təşkil olunmuş komponentlər çoxluğunun keyfiyyətidir | |
| *Kompleksilik* | Proseslərin çoxfaktorluluğu və məzmun rəngarəngliyi texnologiyalarının kompleksliliyinə gətirib çıxarır ki, bu da bütün elementlərin koordinasiyasını və qarşılıqlı fəaliyyətini tələb edir |
| *Tamlıq (inteqrativlik)* | Elementlərin özünəməxsus xassələrini saxlamaqla texnologiyada inteqrativ keyfiyyətin mövcudluğunu nəzərdə tutur |
| Elmilik- pedaqoji texnologiya pedaqoji məsələnin elmi cəhətdən əsaslandırılmış həllidir, elmin və praktikanın uğurlarının sintezidir | |
| *Konseptuallıq* | Pedaqoji prosesə baxışlar sistemi, üzərində fəaliyyətin təşkil edildiyi ideyalar və prinsiplər əsasında əldə edilir |
| *İnkişafetdirici xarakter* | Müasir pedaqoji texnologiyaların inkişafetdirici xarakterini əks etdirir |
| Struktura malik olmaq- sistemin dayanıqlığını və etibarlılığını təmin edən, daxildən müəyyən qayda ilə təşkilinin (məqsədlər, məzmun), elementlərin sistemyaradan əlaqələrinin (konsepsiya, metodlar), dayanıqlı qarşılıqlı fəaliyyətin (alqoritmin) mövcudluğunu əks etdirir | |
| *İyerarxiya və varislik* | Təşkilat səviyyələrinin qarşılıqlı tabeçiliyi və koordinasiyası |
| *Məntiqlilik* | Texnologiyanın formal-təsviri aspekti hərəkətlərin məntiqində və dəqiqliyində ifadə olunur |
| *Alqoritmlilik* | Müəyyən nizamla baş verən ayrı-ayrı məzmun sahələrinə bölünmə |
| *Prosesuallıq* | Müvəqqəti alqoritm: planlaşdırma və s. mərhələləri |
| *Variativlik və yumşaqlıq* | Texnologiyanın icrası şərtlərindən asılı olaraq alqoritmin elementlərinin sırasının, dövrünün dəyişdirilməsi |
| İdarəolunma-diaqnostik məqsəd qoyuluşunun, planlaşdırmanın, düzəliş məqsədi ilə metod və vasitələrin dəyişdirilməsinin mümkünlüyünü nəzərdə tutur | |
| *Diaqnoz qoyma imkanı* | Diaqnostik məqsədlərin ifadə olunmasında, prosesin gedişi haqqında informasiyanın alınmasında, onun ayrı-ayrı mərhələlərinə nəzarətdə, nəticələrin monitorinqində ifadə olunur |
| *Proqnoz vermək imkanı* | Məqsədə çatmanın zəmanətliliyi |
| *Səmərəlilik* | Nəticənin sərfiyyata nisbəti optimal olmalıdır |
| *Optimallıq* | Minimum sərfiyyatla maksimal nəticənin əldə edilməsi |
| *Təkrar bərpa imkanı* | Texnologiyanın başqa subyektlər tərəfindən bərpa olunma imkanı |

Təlim texnologiyalarına qoyulan metodoloji tələblər pedaqoji prosesin pedaqoji texnologiya olma meyarları kimi formalaşır. Elmi-pedaqoji ədəbiyyatda həmin meyarlar yuxarıdakı cədvəl şəklində ümumiləşdirilmişdir:

Məqaləmizin məqsədi idarəolunma meyarı ilə daha çox bağlıdır. İdarəolunmanın düzgün təşkilinə şərait yaradılması və həmin meyara necə əməl edilməsinin yoxlanması üçün əsas vasitə kollokviumdur. Kollokvium vasitəsilə pedaqoji texnologiyanın idarəolunma meyarına uyğunluğunu yoxlamaq üçün təlim prosesinin gedişinə diaqnoz qoymaq, proqnoz vermək, prosesin səmərəliliyini, optimallığını, təkrar bərpa imkanını qiymətləndirmək olar. Mövcud elmi-pedaqoji ədəbiyyatda kollokvium ali məktəblərdə təlim prosesinə nəzarət vasitələrindən biri kimi səciyyələndirilir [6].

Əvvəlcə kollokvium haqqında pedaqoji ədəbiyyatda olan fikirləri şərh edək:

Kollokvium (lat.colloquium - danışıq, söhbət) 1) təlim məşğələ formalarından biridir, bilik səviyyəsini müəyyənləşdirmək üçün müəllimin tələbə ilə apardığı söhbətdir. 2) Məruzələrin müzakirə olunduğu elmi yığıncaqdır.

Kollokvium xüsusi növ təlim məşğələsidir. Orada müəllimin rəhbərliyi ilə mühazirədə tələbələrin öyrəndiyi müxtəlif məsələlər müzakirə edilir. Kollokvium həm də nəzarət formasıdır, şifahi imtahanın bir növüdür. Kollokvium qısa müddətdə qrupda öyrənilən kurs üzrə bütün tələbələrin bilik səviyyələrini aşkara çıxarmaq imkanı verir.

Tələbə kollokvium zamanı öz fikrini müdafiə edir və bunun üçün xüsusi arqumentlər gətirir; keçilən mühazirələrdə öyrənilən materialı nə dərəcədə dərin mənimsədiyini nümayiş etdirir.

Kollokviumlar müxtəlif formalarda - bilet çəkərək imtahana hazırlıq məşqi kimi də, yazılı da aparıla bilər.

Ali məktəblərdə aparılan təlim məşğələlərinin bir forması olan kollokviumun məqsədi tələbələrin biliklərinin artırılması və yoxlanmasıdır.

Kollokviumun üstünlükləri nədən ibarətdir?

1. Kollokviumun aparılması prosesində müəllim ayrılıqda hər bir tələbənin tədris materialını mənimsəmək imkanı haqqında məlumat alır.

2. Bu nəzarət vasitəsi yaddaşı, düşüncəni, fikrini konkretləşdirib yazmaq qabiliyyətini inkişaf etdirir, kollokvium tələbələrin məntiqini və elmi düşüncəsini artırır.

Əldə edilmiş biliklərə nəzarətin səmərəli təşkili təlim prosesində zəruri mərhələlərdən biridir. Əldə edilmiş biliklərə nəzarət kadr hazırlığının keyfiyyətinə ciddi təsir göstərir. Təlimin planlaşdırılan və əldə edilən səviyyələri arasındakı münasibəti təyin etmək, tələbələrin uğurlarını qiymətləndirmək, onların biliklərindəki boşluqları aşkara çıxarmaq üçün biliklərə nəzarət vacibdir. Bu nəzarət vasitəsilə istifadə edilən təlim metodlarının üstünlüklərini və çatışmazlıqlarını aşkara çıxarmaq və həmçinin ali məktəb müəllimlərinin işlərini müqayisə etmək mümkün olur.

Aydındır ki, təlim-tərbiyə prosesinin səmərəliliyi və deməli, kadr hazırlılığının keyfiyyəti birbaşa nəzarətin düzgün təşkilindən asılıdır. Kollokvium vasitəsilə tələbələrin tədris materialını necə mənimsəmələri, əldə etdikləri bilikləri praktikada necə tətbiq etdikləri haqqında informasiya almaq olar.

Kollokviumun nəticələrinə uyğun olaraq tədris prosesinin təşkilinə uyğun düzəlişlər edilir. Nəzəri səviyyədə biliklərə nəzarət sis-

temi qənaətbəxş səviyyədə işlənsə də, ali məktəblərdə nəzarətin praktiki reallaşdırılmasında nəzəri təkliflər heç də həmişə nəzərə alınmır və nəticədə nəzarətin səmərəliliyi aşağı düşür. Nəzarətdə əsas tələb onun sistemli olmasıdır. Sistemlilik dedikdə, məqsədlərlə üsullar, vasitələr və nəzarət mərhələlərinin uyğunluğu nəzərdə tutulur. Bu, nəzarətin funksiyalarının səmərəli şəkildə reallaşması ilə nəticələnir.

Kollokviumun aşağıdakı funksiyalarını göstərirlər [5,6]:

Diaqnostik funksiya. Bu funksiya tələbə hazırlığında mövcud olan boşluqları üzə çıxarır. Diaqnostikadan alınan nəticələr əsasında təlim prosesinin təkmilləşdirilməsi haqqında qərar qəbul edilir. Diaqnostika həm də boşluqların səbəblərini müəyyənləşdirir, tədris materialının mənimsənilməsi prosesində ortaya çıxan çətinliklərin xarakteri haqqında informasiya formalaşdırır.

Öyrətmə funksiyası. Bu funksiya böyük əhəmiyyətə malikdir. Tələbə nəzarət tapşırıqlarını yerinə yetirərkən öyrənilən materialı təkrarlayır və möhkəmlədir, əldə edilən bilikləri dəqiqləşdirir və tamamlayır. Çünki nəzarətsiz təlim işini rasionallaşdırmaq, özbaşına bilik əldə etmək çətindir. Ardıcıl nəzarətin təsiri ilə tələbələr fənni daha ciddi və daha dərin öyrənirlər.

İnkişafetdirici funksiya. Bu funksiya ciddi gərgin əqli fəaliyyət tələb edir. Bu funksiyanın təsiri ilə tələbənin diqqəti itiləşir, yaddaşı məşq edir, fikri fəaliyyəti inkişaf edir. Tələbədən mənimsədiyi biliklərin dərindən başa düşülməsi, yeni sahələrə tətbiq olunması və sistemləşdirilməsi tələb olunur. Tələbənin mənimsədiklərini ümumiləşdirməyi və sübutlar gətirməyi öyrənməsi vacibdir.

Tərbiyələndirici funksiya şəxsiyyətin emosional sferasına təsir göstərir. Müəllim tələbənin şəxsi təlim fəaliyyətini qiymətləndirir ki, bu da onda gördüyü işə cavabdehlik hissi tərbiyə edir. Müəllimin həyata keçirdiyi savadlı nəzarət tələbəni obyektiv özünənəzarətin vacibliyini anlamağa təhrik etməlidir.

Metodiki funksiya aşağıdakından ibarətdir. Nəzarətin nəticələri müəllimin özünün işini təkmilləşdirmək üçün istifadə olunmalıdır. Nəzarətin köməyi ilə tədris metodikasını qiymətləndirmək olur; metodikanın zəif və güclü tərəfləri aşkar edilir. Nəticədə, metodik funksiya optimal təlim prosesi seçməyə imkan verir.

Nəzarətin səmərəliliyi pedaqogikada işlənmiş aşağıdakı prinsiplərə əməl etməyə imkan verir [9]:

Elmilik prinsipi tələbələrin biliyini qiymətləndirmək üçün əsaslandırılmış vasitələrin istifadə olunmasını nəzərdə tutur. Ənənəvi nəzarət netodlarını tələbələrin biliyini obyektiv qiymətləndirmək üçün tətbiq etmək mümkün olmur, çünki onlarda elmi əsaslandırılmış keyfiyyət kriteriyaları yoxdur. Buna görə də müəllimlər ənənəvi nəzarət vasitələri ilə yanaşı müasir vasitələrdən istifadə edirlər.

Səmərəlilik prinsipi müəllim tərəfindən minimum zaman, əmək və vasitə sərfi ilə nəzarətin məqsədlərinin tam reallaşdırılmasını nəzərdə tutur. Nəzarət metodu obyektiv nəticələr alınmasını təmin edirsə, o, ən səmərəli hesab edilir.

İyerarxiklik prinsipi nəzarətin məzmununun müəyyən seçim sisteminin yaradılmasını nəzərdə tutur. Material toplusunun hamısını yoxlamaq mümkün deyildir. Ona görə verilmiş materialı ümumi məqsəddən çıxış edərək əhəmiyyətinə görə növlərə ayırırlar.

Sistemlilik prinsipi tələbələrin biliyinə nəzarətin tədris prosesinin planlaşdırılmış gedişinə uyğun həyata keçirilməsini nəzərdə tutur. Nəzarətin sistemliliyi ilkin mərhələlərdə səhvləri aşkara çıxarmağa və onları düzəltməyə kömək edir, onları aradan qaldırmaq üçün tədbir imkan verir. Ardıcıl aparılmayan yoxlamalar nəzarət funksiyalarının yarımçıq yerinə yetirilməsinə səbəb ola bilər, tədrisin keyfiyyəti pisləşə bilər.

Obyektivlik prinsipi tələbələrin təlim işinin uğurlarının və çatışmazlıqlarının obyektiv qiymətləndirilməsini nəzərdə tutur. Bundan başqa həmin prinsip tələbələrin biliyinin dərinliyini və əldə etdikləri bacarıqları müəyyənləşdirir. Nəzarətin obyektivliyi prinsipi nəzarətin məqsədlərinin yoxlanılan biliklərin məzmununa uyğunluğunu aşkara çıxarmağa imkan verir.

Çoxtərəflilik prinsipi tələbələrin mənimsədikləri bilikləri başqa situasiyalara da tətbiq edə bilmələrinə nəzarəti nəzərdə tutur. Göstərir ki, alınan informasiyadan praktik məsələlərin həllində istifadə edə bilirmi. Tələbə ümumelmi bacarıq və vərdişləri mənimsəyibmi.

Fərdilik prinsipi hər tələbənin ayrılıqda təlim fəaliyyətinə nəzarət etməyə imkan verir. Bu halda bütün tələbələrə həcm və biliyin tamlığı baxımından eyni cür tələblər qoyulur. Lakin hər tələbənin fərdi keyfiyyətlərini diqqətdə saxlamaq lazımdır.

Pedaqoji taktika prinsipi nəzarətin sakit, işgüzar şəraitdə aparılmasını nəzərdə tutur; bütün tənqidlər və göstərişlər, qiy-mətlərin elan edilməsi səmimi və taktiki formada icra olunmalıdır.

Göründüyü kimi, kollokviumun funksiyaları və prinsipləri pedaqoji texnologiya meyarlarına çox uyğundur. Deməli, kollokviumun düzgün təşkili təlimin pedaqoji texnologiya səviyyəsində reallaşdırılmasına imkan yaradır.

Ali məktəbdə təlim mərhələləri müəyyən təlim məqsədlərinə çatmaq üçündür, həmin mərhələdə yoxlama tapşırıqlarına tələbələrin mənimsəməli olduqları materialları daxil edirlər.

Pedaqoji ədəbiyyatda [7] təlim məqsədlərini aşağıdakı səviyyələrə ayırırlar:

1. Yaddasaxlama və yeni situasiyada işlətmə. Tələbə işlədilən terminlərin mənasını bilməlidir; öyrənən öyrəndiyi tədris fənnində istifadə olunan əsas anlayış və təriflərlə işləyə bilməlidir.

2. Dərketmə. Tələbə mühazirədə eşitdiyi və dərslərdə deyilən terminləri, anlayışları və tərifləri başa düşür və izah edir.

3. Məlum situasiyada biliklərin tətbiq edilə bilməsi. Tələbə tanış situasiyada terminləri, anlayışları və tərifləri tətbiq edə bilir,

4. Məlum olmayan situasiyada biliklərin tətbiq edilə bilməsi. Tələbə kreativ, yaradıcı düşüncə ilə əldə etdiyi bilikləri yeni situasiyada istifadə edə bilər və öyrəndiyi metodları tanış olmayan situasiyalara ötürə bilər.

5. Analiz. Tələbə müzakirə məntiqində səhvləri və çatışmazlıqları görür, məsələnin qoyuluşundakı artıqları və çatışmayanları düzəldə bilir, səbəb-nəticə münasibətlərini müəyyənləşdirə bilir.

Azərbaycan Texniki Universitetində son dərs ilinə qədər kollokviumlar aparılsa da, onun bütün funksiyaları yerinə yetirilmirdi və nəticədə kollokviumların nəticələri formal xarakter daşıyırdı. Bu ali təhsil müəssisələrində hazırlanan "Kollokvium haqqında Əsasnamə" və Rektorun 6 nömrəli, 13 oktyabr tarixli sərəncamı kollokviumun yuxarıda şərh etdiyimiz elmi-pedaqoji ədəbiyyatda əksini tapan prinsip və funksi-

yalarını əsas tutmaqla təlimdə daha yüksək səviyyəni hədəf alır və onu təmin edir. Fikrimizi təsdiqləmək üçün “Kollokvium haqqında Əsasnamə” nin əsas müddəalarını və sərəncamın müddəalarını şərh etməyə çalışaq.

KOLLOKVİUM HAQQINDA
ƏSASNAMƏ

Giriş

Tələbələrin təhsil işinin təşkilində kollokvium mühüm yer tutur. Kollokvium fənn proqramının ayrı-ayrı modulları üzrə təlim nəticələrinin keyfiyyətinə dövri nəzarət məqsədi ilə keçirilir. Kollokviumun nəticələri materialın mənimsənilmə səviyyəsini müəyyən edir. Bu isə mühazirə və praktik dərslər üzrə təlim fəaliyyətinin təkmilləşdirilməsinə imkan verir.

Əsas müddəalar

- Akademik dövrdə (semestr ərzində) fənn üzrə kollokviumların 3 dəfə keçirilməsi məcburidir. Kollokviumda iştirak etməyən tələbəyə “0” sıfır bal yazılır.
- Fənn proqramının bir kollokviuma müvafiq hissəsi 30-35% (20-40 sual) təşkil edir.
- Kollokvium biletinə kollokviumun proqramını əhatə edən 3 sual daxil edilir. Bilet qısa cavab tələb edən nəzəri və praktiki xarakterli suallardan təşkil olunur.
- Kollokviumun proqramına aid suallar və zəruri ədəbiyyat tələbələrə əvvəlcədən təqdim olunur.
- Kollokviumlara hazırlıq vaxtı tələbənin fənn üzrə sərbəst iş saatlarının miqdarına aid edilir.
- Kollokvium fənlərin akademik təqviminə əsasən, adətən, cari semestrin 6-cı, 10-cu, 14-cü həftələri üzrə keçirilir. Bu zaman tələbənin müxtəlif fənlər üzrə kollokvium təqvimləri üst-üstə düşməməlidir.
- Kollokvium, bir qayda olaraq, dərsdən kənar, tədris işləri üzrə prorektorun (fakültə dekanının) icazəsi ilə dərs saatlarında da keçirilə bilər.

Sərəncamın başlanğıcında onun “birinci kurs tələbələri üçün sessiya imtahanlarının yazılı formada keçirilməsi qərarının icrasını və tələbələrin yazılı imtahan formasına hazırlıqlarını təmin etmək, fikirlərini qısa və aydın şəkildə çatdırmaq vərdişlərini aşılamaq məqsədi ilə” verildiyi ifadə edilir. Birinci kurs tələbələri son dərs ilinə qədər imtahanlarını test üsulu ilə vermişlər. Onlarda fikirlərini yazılı şəkildə qısa və aydın çatdırmaq vərdişi yox dərəcəsindədir. Sərəncamla kollokviumun funksiyalarına yeni vacib funksiyalar əlavə edilir:

6. Fikirlərin yazılı şəkildə qısa və aydın çatdırılması vərdişinin formalaşdırılması.

Bu vərdiş tələbələrin uğurla imtahan vermələri, sistemli bilik əldə etmələri və sonrakı özünütəhsili üçün vacibdir.

Sərəncamın birinci maddəsində kollokviuma imtahan (aralıq) statusu verilir. Bununla kollokviuma bir vacib funksiya da əlavə edilir:

7. Tələbənin yekun imtahan qiymətinin müəyyənləşdirilməsi.

Belə ki, kollokviumda iştirak etməyən tələbəyə “0” (sıfır) bal yazılır. Pedaqoji ədəbiyyatda kollokviumun semestr ərzində 2 dəfə keçirilməsi də məqbul hesab edilir. Lakin sərəncamda yazılan “semestr ərzində fənn üzrə kollokviumların (aralıq imtahanların) 3 dəfə keçirilməsi məcburidir” ifadəsi onun pedaqoji dəyərini artırır, kollokvium nəzarətinin kəsilməzliyini təmin edir. Deməli, kollokvium vasitəsilə hər bir dərsə nəzarət imkanı yaranır.

Sərəncamın 6-cı maddəsində yazılır: “Kollokviumların keçirilməsi üçün kafedra

müdirinin rəhbərliyi ilə fənn müəllimi tərəfindən suallar hazırlanır və ən azı bir həftə əvvəl tələbələrə çatdırılır. Bu zaman kollokviumun proqramı fənn üzrə təsdiq olunmuş sillabusa ciddi riayət edilməklə tərtib edilməlidir. Növbəti kollokviumların sualları əvvəlkiləri də əhatə etməlidir. Həmin suallar sonradan keçiriləcək imtahan sualları ilə üst-üstə düşməlidir".

Bu maddənin dəyərini yüksəltmək üçün aşağıdakıları təklif edirik:

1. Sillabusu tərtib edərkən hər bir mühazirə mövzusunun altındakı yarımmövzular kollokvium sualları və sonradan imtahan sualları olmalıdır. Semestr ərzində fənnin məzmunu həmin yarımmövzular şəklində öyrənilməlidir. Bu yolla hazırlaşan tələbə həm kollokviumlarda (aralıq imtahanlarda), həm də yekun imtahanda yarımmövzulardan ibarət suallarla rastlaşacaq. Belə hazırlaşan tələbə sualın cavabını nə ilə başlamaq, nədə qurtarmaq haqqında düşünməyəcək və nəticədə cavabı daha konkret, dolğun olacaqdır. Nəticədə, yuxarıda sadalanan təlim məqsədləri yerinə yetiriləcəkdir.

2. Sərbəst iş olaraq həmin yarımmövzuların bir neçəsinin tələbənin öz xətti ilə yazmasını və öyrənməsini tələb etmək lazımdır. Beləliklə, sərbəst işin qəbulu da məlum kollokvium-imtahan suallarını öyrənməyə xidmət edir.

3. Məşğələ dərslərində konkret yarımmövzunu soruşmaqla tələbənin biliyini qiymətləndirmək olar.

4. Kollokviumun sərəncama uyğun keçirilməsi yuxarıda sadaladığımız təlim prinsiplərinə əməl edilməsini təmin edir. Sonrakı kollokviumun suallarının özündən əvvəlki kollokviumların suallarını da əhatə etməsi təlimin vacib mərkəzi prinsipi olan varislik prinsipinə əməl edilməsini təmin edir. Varislik prinsipi isə bütün elm sahələrində inkişaf zəmanəti olan sinergizmin təminatçısıdır.

Azərbaycan Texniki Universitetində həyata keçirilən geniş funksiyalı yazılı kollokvium onun ənənəvi nəzarət, diaqnostik, qiymətləndirmə, metodiki funksiyalarından daha çox öyrətmə funksiyasına şərait yaradır, tələbəni öyrənməyə təhrik edir. Tələbəni öyrətmək isə universitetin başlıca vəzifəsidir. Deməli, kollokvium siyasəti universitetin əsas vəzifəsini yerinə yetirməyə hesablanmışdır və uğurla həyata keçirilir.

Fizika kafedrasında kollokviumlar "Əsasnamə" və sərəncamın tələblərinə uyğun keçirilir, kafedranın dərslərində bu inkişaf aydın görünür. Əvvəlki illərdən fərqli olaraq, tələbələrin əksəriyyəti mühazirəni yazır, sərbəst iş verir, laboratoriya və məşğələ dərslərində daha fəal iştirak edirlər. Kollokviumlardakı cavabları da onların yeni qaydaları öyrəndiklərini göstərir.

Beləliklə, Azərbaycan Texniki Universitetində Rektorun sərəncamı ilə həyata keçirilən funksiyaları genişləndirilmiş kollokviumlu təlim prosesi pedaqoji texnologiya meyarlarına uyğundur və müasir tələblərə uyğun mühəndis kadrı hazırlığına zəmanət verir.

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.

2. "Ali təhsil pilləsinin dövlət standartı və proqramı" Azərbaycan Respublikası Nazirlər Kabinetinin 23 aprel 2010-cu il tarixli qərarı (№75).

3. "Ali təhsil müəssisələrinin bakalavriat

və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları” Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 24 dekabr 2013-cü il tarixli qərarı (№ 348).

4. “Kredit sistemi ilə təhsil alan tələbələrin biliyinin qiymətləndirilməsi haqqında Əsasnamə” Azərbaycan Respublikası təhsil nazirinin 1060 nömrəli 11.09.2008-ci il tarixli əmri.

5. Беспалько В. Слагаемые педагогической технологии. М.: Педагогика, 1989.

6. Копылов А. Коллоквиум как средство контроля над результатами обучения в высшей школе. // Аспирант и соискатель, 2011, № 2.

7. Кларин М. Инновационные модели обучения в зарубежных педагогических поисках. М.: Арена, 1994.

8. Селевко Г. Педагогические технологии на основе активизации, интенсификации и эффективного управления УВП. М.: НИИ школьных технологий, 2005.

9. Челышкова М.Б. Теория и практика конструирования педагогичческих тестов. М.: Логос, 2002.

**Х.Яхудов,**
**Э.Годжаев,**
**Н.Сафаров**

**Коллоквиумы гарантия нового обучения в нашем университете**

**Резюме**

В данной статье анализируется сущность коллоквиума, как средство контроля над результатами обучения в высшей школе. Перечисляются функции и принципы коллоквиума. Показывается, что перечисленные функции и принципы соответствуют критериям педагогической технологии.

Приводятся поручение и положение о проведении коллоквиума в Азербайджанском Техническом Университете. Разъясняется смысл новых функций, исходящих из поручения о коллоквиуме. Показывается, что коллоквиум проведенный письменно на основе данного поручения поднимает уровень обучения предметов и повышает качество подготовки инженерных кадров.

**Kh.Yahudov,**
**E.Gojayev,**
**N.Safarov**

**Colloquiums ensure new training levels in university**

**Summary**

This article analyzes the essence of the colloquium as a means of controlling the results of studies in higher education. The functions and principles of the colloquium are listed. It is shown that the listed functions and principles meet the criteria of pedagogical technology.The commission and the regulations on holding a colloquium at the Azerbaijan Technical University are given. The meaning of the new functions arising from the commission on the colloquium is explained. It is shown that the colloquium conducted in writing on the basis of this instruction raises the level of teaching subjects and improves the quality of training of engineering personnel.



*2



# MUSİQİ VƏ CƏMİYYƏT

**Elxan Bəylərov,**
***psixologiya üzrə elmlər doktoru***


**Bahar Ələkbərova,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun psixologiya və yaş fiziologiyası şöbəsinin dissertantı***



Məqalədə kainatın universal dili olan musiqinin cəmiyyətin inkişafına təsiri müxtəlif aspektlərdən təhlil olunmuşdur. Musiqinin insana psixoloji təsirinin və musiqinin müxtəlif mədəniyyətlərdə cəmiyyətə təsirinin psixoloji əsasları nəzərdən keçirilmişdir. Fərqli musiqinin insan fəaliyyətinin müxtəlif sahələrinə, onun şəxsiyyət kimi formalaşmasına təsirinin psixoloji məsələləri şərh edilmişdir. Musiqinin insanın digərləri ilə və kainat ilə bütünləşdirən ən təsirli vasitə olduğu xüsusi qeyd edilmişdir.

***Açar sözlər:*** *musiqi,insan, harmoniya, cəmiyyət, dəyərlər, ritm.*
***Ключевые слова:*** *музыка, человек, гармония, общество, ритмы.*
***Key words:*** *music, human, harmony, society, worth, rhtyhm.*

Estetik tərbiyənin qüvvətli təsir gücünə malik vasitələrindən biri olan musiqi cəmiyyətin və dövrün əsas ideyalarını, insanların münasibətlərindəki ən mühüm cəhətləri ifadə edir. Musiqi təlimi, musiqi vasitəsilə tərbiyə problemi həmişə pedaqoqların, psixoloqların, tədqiqatçıların musiqi pedaqogikası sahəsində çalışan mütəxəssislərin tədqiqat obyekti olmuşdur. Hazırda bütün dünyada musiqi təhsili sahəsində müqayisəli tədqiqatlar aparılır, musiqi aləmində və musiqi təhsilində Qərb və Şərq problemi qoyulur. Müxtəlif mədəniyyətlərin dərk edilməsinin inkişafında musiqi tərbiyəsinin rolu geniş müzakirə obyektidir. Ona görə də təhsil işçilərinin geniş kütləsinin musiqini dərk etməsi və musiqi vasitəsilə tərbiyə olunmasına cəmiyyətin problemi kimi baxılmalıdır.

Musiqi haqqında düşünərkən müxtəlif suallar meydana gəlir: Musiqi nədir? O nə vaxt və necə yaranmışdır? Onun insanlara təsirinin səbəbi nədir? Bu təsirin keyfiyyət və kəmiyyət fərqi nədən asılıdır? İnsanın zövqünün formalaşmasında musiqinin rolu və əhəmiyyəti nədir? İnsanları ritmlərə, musiqiyə, mahnıya, ilanı ofsunçunun, sürünü çobanın tütəyinin səsinə bağlayan nədir? İnsanları, müxtəlif heyvanları, quşları və digər canlıları musiqiyə cəlb edən nədir? Bitkilər musiqini duyurmu? Cansız hesab etdiyimiz varlıqlar da musiqidən təsirlənirmi?

İrrasional təfəkkürə köklənərkən düşünürük ki, küləyin, səhərin, dənizin, çayların, meşənin, qayaların, daşların da öz musiqisi var. Musiqi kainatın ümumi - universal dilidir!

Musiqinin yaranması və inkişafında başqa amillərin də rolu olmuşdur. Məsələn, insanlar əvvəlcə təbiətdə olan səsləri, məsələn: küləyin, yağışın, çayın, şəlalənin,

şimşəyin səsini, heyvanların və quşların müxtəlif hallarda çıxardığı səsləri dinləmiş, təlqin etmiş, zəruri hallarda onlardan olduğu kimi və ya bir qədər dəyişdirərək istifadə etmişlər. İndi də bəzi ovçular ov zamanı heyvanların səslərini təqlid edərək, onları özlərinə tərəf çağırırlar. Bəstəkar O.Rəcəbov qaratoyuğun oxumasını dinləyərək “Qaratoyuğun nəğməsi”, bəstəkar Ştraus meşənin səslərini dinləyərək “Venesiya meşəsinin səsləri” adlı musiqi əsərini bəstələmişlər.

Səsləri təlqin edərkən insanlar ağız və əldən, qarğıdan, buynuzdan, misdən, ağac parçalarından və s. hazırlanmış vasitələrdən istifadə edirdilər. Bu vasitələr ilk musiqi alətlərinin “əcdadları” olmuşlar. Bəzi məlum faktların mövcudluğu deyilənlərin əsassız olmadığını təsdiqləyir.

Dəqiq bəlli olan budur ki, insanlar çox qədim zamanlardan körpələrini yatırarkən, işləyərkən, tək və ya qrup halında müəyyən hisslərini, əhvali-ruhiyyələrini ifadə edərkən, mərasimlərdə, döyüşdə ritmdən, melodiyadan və musiqidən istifadə etmişlər. İnsanlar tədricən səslər içərisində daha ahəngliləri seçmiş, ucalıq baxımından onları yüksək və aşağılığına görə fərqləndirməyi öyrənmişlər.

Qədim yunan əsatirlərinə görə musiqini insanlara incəsənəti himayə edən tanrı - Apallon bəxş etmişdir. Məlumdur ki, bir çox qabiliyyətlər insanlara, həqiqətən də peyğəmbərlər vasitəsilə Allah tərəfindən verilib. Davud peyğəmbərə zirehin hazırlanması, gözəl səslə oxumaq, Süleyman peyğəmbərə küləyi ram etmək, quşların dilini bilmək qabiliyyətinin məhz Allah tərəfindən verildiyi səmavi kitablarda, o cümlədən Qurani-Kərimdə də təsbit edilmişdir. (... Allah Davuda həm hökmranlıq, həm də hikmət (peyğəmbərlik) verdi və ona istədiyini (zireh düzəltmək, quşların dilini bilmək, gözəl səslə oxumaq) öyrətdi ... (2.Əl-Bəqərə, 251) [1].

Qədim tarixdən musiqinin insana qeyri-adi təsiri barədə çoxsaylı nümunələr məlumdur. “Odisseya” epik poemasında göstərilir ki, musiqinin və nəğmənin təsiri altında Odisseyin yarasında qanaxma dayanır. Qədim yunan əsatirlərinin qəhrəmanı Axill öz qəzəb tutmalarını lirada çalmaqla və nəğmə ilə ram edirmiş. Digər qəhrəman Orfey isə öz nəğməsi ilə həm insanların sərtliyini yumşaldır, həm də vəhşi heyvanları və quşları ram edirdi.

Assuriyalıların məbədlərinin divarlarında, Misir abidələrində, qədim dövrlərə aid bir çox barelyeflərdə, yonma və döymə işlərində müxtəlif həyat səhnələrini əks etdirən mənzərələrdə musiqi ifasının təsvirləri verilmişdir. Mərasimdə musiqi ifası, hökmdarın musiqi dinləməsi, ordu səfərinin musiqi ilə müşayiəti və s.

Teymurləng haqqında belə rəvayət var ki, o, bir ud çalana ölüm hökmü çıxarır. İfaçı son arzusu kimi hökmdar üçün ud çalmaq istədiyini bildirir və elə bir hava çalır ki, çox nadir hadisə baş verir. Teymurləng: “Onu dayandırın, yoxsa sarayda bir başı papaqlı qalmayacaq”, - deyə qışqırır və ölüm hökmünü sürgünə dəyişərək ifaçını şəhərdən qovdurur.

Spartanın sərt hökmdarı Likurq ordusu üçün hərbi mahnıları özü bəstələyirdi. Onun ordusu döyüş qabağı nizami sıralara mütləq şeypur və nağaraların sədası altında düzülərmiş.

Bir hökmdar elan edibmiş ki, oğlunun ölüm xəbərini ona kim desə, onu edam etdirəcək. Oğlunun ölüm xəbəri gələndə heç kəs bunu şaha deyə bilmir. Vəzir ud çalana müraciət edir. O gəlib şahın hüzurunda elə yanıqlı bir hava çalır ki, hökmdar: “Sən elə çalırsan ki, sanki oğlum ölmüşdür. Əgər belədirsə, edam ediləcəksən!” - deyir. İfaçı: “Bunu mən demədim, ud dedi”, - deyərək udu yerə vurub sındırır. Musiqi ilə bağlı maraqlı rəvayətlər çoxdur.

Tarixin ilk yazılı abidələrində isə artıq musiqinin əhəmiyyəti, ondan yüksək səviyyədə və peşəkarlıqla istifadə barədə məlumatlar verilib. Çin natural fəlsəfəsinin kitabəsi olan “Lyuyşi çuntcyu”da (b.e.ə. III

əsr) musiqiyə cəmiyyətdə nizam və mədəniyyətin simvolu kimi yanaşılır. Hesab edilirdi ki, musiqi nizamsızlıq mühitində müəyyən bir quruluş, iyerarxik nizam yaratmaqla ictimai həyatın ahəngdarlığını təmin edir. Çin fəlsəfəsində təbiətdə və cəmiyyətdə olan təlatümləri, müvazinətsizliyi "yan" və "in" enerjilərinin tarazlığının pozulması ilə əlaqələndirirdilər.

Musiqi qədim Çində tərbiyə işinin əsas tərkib hissələrindən və öyrənilməsi vacib olan elmlərdən sayılırdı. Çində hesab edilirdi ki, əsil-nəcabətli şəxs (tzyun-tzı) bütün yüksək ləyaqət keyfiyyətlərinə malik olmalıdır. Belə şəxslərin ən mühüm zahiri əlamətlərindən biri də üzərində musiqi alətləri gəzdirmələri idi. Məşhur Çin filosofu Konfutsi həyatı üçün ölüm təhlükəsi olan anlarda tsina alətində çalaraq ölümə qarşı soyuqqanlılıq, möhkəm iradə və yüksək ruhi müvazinət nümayiş etdirirmiş.

Qədim yunan mədəniyyətində musiqi yalnız digər incəsənət, fəaliyyət və həyat sahələri ilə vəhdətdə tətbiq edilirdi. Onlar hesab edirdilər ki, bu əlaqə və bağlılıqlardan təcrid edilmiş şəkildə musiqi yekcins və primitiv olur. Yunanların fikrincə, musiqi rəqslə, ritmlərlə və nəğmələrlə vəhdətdə insanları tanrılara yaxınlaşdırmaq xüsusiyyətinə malikdir. Musiqi - rəqslər vasitəsi ilə plastika və təsviri incəsənətlə, sözlər vasitəsi ilə isə poeziya və natiqliklə əlaqələnərək özünəməxsus təsirlər yaradır.

Platon və Aristotel musiqi incə-sənətini ən mühüm və təsirli tərbiyə vasitəsi hesab etmişlər və onun əhəmiyyəti, xüsusiyyəti, digər incəsənət sahələrindən fərqi barədə maraqlı fikirlər yürütmüşlər. Onların fikrincə, ritm və harmoniya bütün vasitələrdən daha çox insanın qəlbinin dərinliklərinə nüfuz edir və onun ruhi aləminə, mənəvi dünyasına güclü təsirlər edir.

Platona görə ölkədə səslənən musiqiyə, onun ladına və ritmlərinə əsasən dövlətin gücü, qüdrəti barədə fikir yürütmək mümkündür. Həm də əksinə, ölkənin gücü – qüdrəti onda səslənən musiqinin ladını və ritmlərini şərtləndirir. Fikrimizcə, cəmiyyətdə üstünlük təşkil edən musiqi həm də ondakı mənəvi dəyərlər, psixoloji mühit və sərvət meyillərini səciyyələndirir. Platon, Pifaqor, Aristotel və b. görə, dövlət üçün, ciddi və həyalı musiqidən uzaqlaşmaq mənəviyyatın və dəyərlərin pozulmasına, tənəzzülünə aparan ən pis yoldur. Bayağı ritm və ladlar vasitəsi ilə insanların ruhlarına – mənəviyyatına abırsızlıq və ədəbsizlik təməlləri köçürülür. Çünki musiqi ritmləri və ladları insanın ruhuna sirayət edərək onu özünə uyğunlaşdırır. Platon və digər görkəmli filosoflar hesab edirdilər ki, dövlətdə yalnız insanları ictimai tələblər səviyyəsinə yüksəltməyə xidmət edən və onlarda ictimai mühitlə həmahəng olan daxili aləmi formalaşdırmağa xidmət edən musiqilər təbliğ edilməli və səsləndirilməlidir. Musiqi insana onun vahid dünyanın bir hissəsi olduğu fikrini aşılamalıdır.

Aristotel hesab edirdi ki, musiqi insanın ictimai həyatla həmahəngliliyini təmin etməyə xidmət etməlidir [5]. O, "Mimesis" təlimində insanların daxili dünyası haqqında fikirlərini inkişaf etdirmiş, incəsənət əsərləri vasitəsi ilə bu daxili aləmə təsir etmək imkanlarını şərh etmişdir. Mimesis - incəsənətin gerçəkliyi ifadə və əks etdirməsi prinsipidir. Bu təlim əsasında musiqi zövqünə dair konsepsiya işlənmişdir. Bu konsepsiyaya görə qədim yunan faciələrini dinləyənlərin ruhları musiqinin təsiri altında xəstəlik affektlərindən azad olur, təmizlənirdi. Hesab edilirdi ki, insan hər hansı bir xəstəlik iztirabından və ya səhhət narahatlığından əziyyət çəkirsə, onun ruhu bu səbəbdən ictimai həyatdan təcrid olunur və daha çox fərdiləşir. Aristotelə görə dərin, səmimi həyəcanlanma ruhu affektlərdən təmizləyir, təcridlikdən çıxarır və fərdilikdən yüksəldərək ictimai ümumiliyə qovuşdurur.

Aristotel insan psixikasında bu və ya digər istiqamətə dəyişiklikləri şərtləndirən musiqi ladlarının təfərrüatlı təsvirini vermişdir.

O göstərmişdir ki, bir ladda səslənən musiqi insanı süstləşdirdiyi, yazıqlaşdırdığı, acizləşdirdiyi halda, digər ladda səslənən musiqi insanı həyəcanlandırır, coşdurur və məğrurlaşdırır. Filosof hesab edirdi ki, məğrurluq, ərlik və ciddiliklə səciyyələnən doriya ladı insan psixikasına tarazlaşdırıcı, tənzimləyici təsir göstərir. Friqiq ladı insana müvazinətsizlik və oyanıqlıq təsiri, lidik ladı yazıqlıq, yumşaqlıq, boşluq təsiri göstərir. Ləyaqətli vətəndaşların tərbiyə edilməsi üçün musiqilərin əsasən doriya ladında bəstələnməsi, ifa edilməsi və dinlənilməsi tövsiyə edilirdi. Onun dövründə digər ladlarda olan musiqiləri dinləmək gənclərə yasaq edilmişdi.

Pifaqora görə mədəni davranış etiketlərindən biri də insanın bütün həyati təzahürlərin təbii ritmlərini düzgün ayırd etməyi bacarması və müvafiq fəaliyyəti üçün (mahnıda, rəqsdə, musiqi alətində ifada, davranışında, yerişində, fikirlərində, nitqində və s.) düzgün ritmi seçə bilməsidir. İnsan, eyni zamanda təbiət hadisələrinin və təbii təzahürlərin də ritmlərini düzgün ayırd etməyi bacarmalıdır. Müəyyən ritmlə, tezliklə düşən su damcısı ilə polad relsləri də qırmaq mümkündür.

Pifaqor və ardıcılları insanın hiss və duyğularına-ehtiraslara, ruhi vəziyyətlərə, qıcıqlandırıcılığa, qəzəbə, digər təzahürlərə və ruhi fəsadlara tənzimləyici və ya əksinə, pozucu təsir göstərən melodiya və ritmləri müəyyənləşdirmiş və onlardan məqsədyönlü şəkildə istifadə etmişlər.

Demokrit infeksion xəstəliklər zamanı musiqi dinlənilməsini tövsiyə edirdi. Musiqinin əhvali-ruhiyyəni, onun da öz növbəsində immuniteti yüksəltməsi təbiidir. “Tövrat”a görə, Davud peyğəmbər kifarda çalıb oxumaqla Saul şahı qüssə və kədər mərəzindən sağaltmışdır.

Tarixi inkişafın bütün mərhələlərində musiqinin fərdlərə və cəmiyyətə təsiri aktual mövzulardan biri olmuşdur. Şərq ezoterizminin fəlsəfi-mistik ədəbiyyatının əsasını təşkil edən sufi poeziyası orta əsrlərdə musiqi və rəqslə sıx şəkildə bağlı idi.

Sufi fəlsəfəsində hesab edilir ki, musiqidə kainatın ritmləri və qanunauyğunluqları təcəlla edir. Bu səbəbdən mürşüdlər musiqi vasitəsi ilə insanı və kainatı dərk etməyin yollarını axtarırdılar. Hesab edilir ki, əgər kainatda ahəng varsa və o, daimi hərəkətdədirsə, deməli, fasiləsiz olaraq səslənməlidir.

Professor M.Abdullayeva “Klassik poeziya: ezoterik xəzinə” əsərində bu məsələləri tədqiq etmişdir. Əsərdə qeyd edilir ki, Pifaqor hər şeyi rəqəmlərlə əlaqələndirirdi. O, riyaziyyatdan başqa musiqi elminin öyrənilməsinə də çox əhəmiyyət vermişdir. Pifaqora görə, bütün şeylərin sirri rəqəmlərin tərkibindədir. O, uca Allahı külli ahəngin mənbəyi hesab edirdi. Həft-tar (yeddi tel)-Heptacorde deyilən lira yeddi teli üzərində qurulan yeddi müqəddəs hal və məqam, işığın içində bulunan yeddi rəngə, yeddi ulduza, varlığın yeddi halına qarşılıqdır. Varlığın bu yeddi halı, cismani və ruhani həyatın ən kiçiyindən ən böyüyünə qədər, bütün göylərində meydana gəlmiş və üzə çıxmışdır. Əgər halların nəğmələri hünərli tərzdə qəlbə daxil olarsa, ruhun ahəngini düzənləyər və həqiqət əsintisiylə uyumlu bir tərzdə titrəşər [1].

Şərq ezoterikasında insanın mistik qavrama orqanlarına çakra (mənası “çarx”) deyilir. Çakralar orqanizmin enerji mənbələri hesab edilir və iki əsas funksiya daşıyır. Birinci funksiyası kainatın enerji vibrasiyasına əsasən, ətraf aləmlə enerji mübadiləsidir

- rənglərdən, musiqi notlarından, səslərin ahəngindən tutmuş Yerin hər cür xassələrinə, təbiətin bütün ünsürlərinə (od, su, torpaq, metal, külək və s.), insanlara, canlılara, planetlərə, bürclərə, noosferə və ali şüura qədər [1] .

Məlumdur ki, Azərbaycan muğamında yeddi "rəng" var. Hər "rəng" müxtəlif notlarla başlayır. Müəllif ehtimal edir ki, muğamın şöbələrinin rəng adlandırılması müəyyən səs və rəng dalğalarının müvafiq tezlikləri arasındakı uyğunluqla bağlıdır. M.Füzulinin "Yeddi cam" əsərində ud alətinin dili ilə deyilir ki, hər şeyi xəlq edən bütün sirlərdən agahdır və yalnız onun istəyi ilə sirlər açıla bilər [1].

Filoloq, alim M.Abdullayeva qeyd edir ki, "İsgəndərnamə"nin "Əflatunun nəğmələr yaratması" hissəsində musiqinin canlılara - insanlara və heyvanlara təsirindən, musiqi vasitəsilə qüsur və xəstəliklərin müəyyənləşdirilməsi, diaqnostika və müalicədən danışılır. Burada Nizami səmadan gələn musiqini eşidib onu səsləndirən filosofun musiqi vasitəsilə diaqnostika etmək bacarığını qeyd edir [1]. Müasir tibbdə də musiqidən bir çox məqsədlərlə, o cümlədən uyuşdurucu kimi də istifadə edirlər. Cərrah Topçubaşovun musiqidən uyuşdurucu kimi istifadə etməsi barədə fikirlər mövcuddur.

Professor M.Abdullayevaya görə, Vişudha çarxı mavi işıq saçır. Kundalini enerjisi bu çakraya daxil olaraq oradakı passiv vibrasiyaları, səs dalğalarını oyadır. Bu vibrasiyalar kainat musiqisini insan üçün açır və insan qulaqları ilə deyil, ürəyinin dərin qatları ilə ilahi musiqini duyur. Bu musiqini eşidənin varlığı ilə kainat arasında, mikro ilə makro arasında rezonans yaranır. "Kosmik harmoniya kosmik eşqin axırıdır. Musiqi də kosmik harmoniyanın bir aspektidir. Gözəl musiqini yaradan səslərin ahəngidir. Bir-biri ilə ahəngdar olanlar bir-birini çəkir. Beləliklə, ali həqiqət səslərdə, notlarda, rənglərdə maddiləşib insanların qavrama orqanlarına təsir edərək, ruhani formasiyaya, ruhani təkamülə təkan verir. Səslər, obrazlar, rənglər eyni bir həqiqətin-universal vahidin müxtəlif aspektlərdən ifadə formasıdır. İrrasional idrakın zirvəsinə qalxdıqca səslərin (obrazların, rənglərin) dalğa tezliyi-vibrasiyalar da yüksəlir, yəni daha zərif və harmonik olur. "Yüksək vibrasiya tezliyi qövsi-qüzehin bütün rənglərini saf ağ rəngə çevirir, notları elə yüksəyə qaldırır ki, əbədiliyi tutub saxlamağa qadir olan səssizliyə çatır" [1].

Sufilər səslər, rənglər haqqında ezoterik biliklərindən fiziki bədəni diaqnostika etmək, sağaltmaq və sağlamlaşdırmaq, mistik qavrama orqanlarına təsir göstərmək, ruhani transformasiya və s. məqsədlərlə istifadə edirdilər [1].

Məlumdur ki, kainat və onda baş verən proseslərin özləri ritmik və harmonikdir, başqa sözlə, musiqilidir. Musiqi kainatın bu xüsusiyyətini adekvat ifadə etdikdə və insanların duyacaqları tərzdə səsləndikdə onların qəlblərini müvafiq ritm və harmoniyaya kökləyir. Beləliklə, insanla kainat arasında səsləşmə - simfoniya yaranır və nəticədə onların arasında bir ümumiləşmə, birləşmə - bütövləşmə baş verir.

Adi orta statistik qabiliyyətlərə malik insan təbii gedişat, xüsusi təlim və ya digər səbəblərdən dünyanın təbii pozitiv ladlarına köklənə bilər, müvafiq əhvali-ruhiyyəyə və ya davranış tərzinə yiyələnə bilər. Bu məqsədə xidmət edən təlim vasitəsi kimi kainat qanunauyğunluqlarına uyğun bəstələnmiş musiqilərdən istifadə edilməlidir. Belə musiqiləri ya təbiətin özündən, ya da

kainatı həssaslıqla duyan müdrik, kamil insanların bəstələrindən dinləmək lazımdır. Təlatümlü, gərgin və intensiv gündəlik həyat gerçəkliyində insanlar asanlıqla “kökdən” düşürlər. Onların ruhi aləmi kökdən düşmüş aləti, davranışları, münasibətləri, hərəkət tərzləri isə köklənməmiş alətin ifasını xatırladır. Bu halda səslər tam pozulmaya qədər saxtalaşa bilir.

Təbiətə uyaraq onunla anlaşıqlı yaşayan yunanlar musiqilərində kainatın musiqisini canlandırırdılar. Onların həyat və fəaliyyətlərinin əksər məqamları lira, avlos, fleyta, mahnı, rəqslərlə, poeziya ilə müşayiət edilirdi.

Platona (Əflatun) görə, əsl musiqi duyumu simləri bir-birinə uyğun kökləməyi bacarmaqda, səsləri düzgün ayırd edib səsləndirməkdə deyil, öz ruhunu, qəlbini və həyatını ritm və harmoniyanın qanunlarına tabe etdirmək, uyğunlaşdırmaqdır. Platon deyirdi: “Musiqi tərbiyəsi almış şəxs hər bir işdə boşluqları, xətaları və keyfiyyətsizliyi yüksək həssaslıqla duyur”. Məhz bu səbəbdən qədim Yunanıstanda musiqiyə sevinc, həzz mənbəyi kimi deyil, “tərbiyənin əsas vasitələrindən biri kimi” yanaşılırdı. Burada musiqi teatr tamaşalarında, xalq bayramlarında, adi gündəlik həyatda səslənirdi. Şairlər şeirlərini adi qaydada söyləmirdilər, özləri lira və ya kifarda müşayiət edərək avazla oxuyurdular.

Yunanlar incəsənəti himayə edən Appolonu, bir qayda olaraq kifar aləti ilə birlikdə təsvir edirdilər. Onlar kainatın möhtəşəm musiqisini bütün musiqilərin başlanğıcı hesab etdiklərindən bəstələnən musiqilərin də bu əsas musiqi ilə səsləşməsini vacib hesab edirdilər.

Hələ Peyğəmbərimizin (s.ə.s.) dövründə Quran ayələrinin avazla oxunması ənənəsi yaranmışdı. XIII əsrdə Parisin Noterdam kilsəsində bir neçə səslə oxuyan nəğmə - xor məktəbi fəaliyyət göstərirdi. İntibah dövründən başlayaraq musiqi insanların gündəlik həyatına daxil olmuşdur. İmkanı olan hər evdə müəyyən bir musiqi alətinin olması adi hal idi.

XVIII əsrin musiqisi nurlu, təlatümsüz, sakit, harmonik, təbiətlə həmahəng, sonsuzluqda həll olunmuş və dövrünə uyğun musiqi olmalı idi.

XIX əsrin musiqisi romantik oyanıqlıq hissi doğuran, kədərli həyəcanlılıq, sirli və nurlu kədər ifadə edirdi. Bu dövrün musiqisində faciəvilik bir qayda olaraq mərdanə optimizm və inqilabi pafosla müvazinətlənirdi.

XX əsrin modernist bəstəkarları “parçalanmış ritmlərə” müraciət edərək zamanların rabitə əlaqəsinin qopuqluğunu – zamanın ruhunu ifadə edirdilər. Bu musiqilər, bir qayda olaraq, yaxınlaşan faciənin duyumunu və ya həyəcan, gərginlik, çıxılmazlıq, məhkumluq hissini ifadə edir.

Musiqi əsərləri vasitəsi ilə eyni bir hissin dəfələrlə təkrarı insanın emosional fonduna daxil olur, onun ruhani mahiyyətini zənginləşdirir. Onun özünün rastlaşmadığı vəziyyətləri başa düşmək imkanı yaradır onun davranışlarına təsir göstərir. İncəsənətin insanı ruhaniləşdirməsi təzahürünün mahiyyətini elə bu amil təşkil edir. Musiqinin dərk olunmasının bir çox sirli məqamları var. Xüsusi hazırlığı olmayan insanlar sonata-simfonik formalı musiqiləri ilk dinlədiklərinə nisbətən təkrar dinləmələrdə daha çox zövq alırlar.

Eşitmə analizatorunun fiziologiyası elədir ki, heç də hər səslər çeşidi həzz verə bilməz. Həmişə elə musiqilər də olub ki, yalnız az sayda peşəkarlar tərəfindən qəbul edi-

lib və sevilib. Musiqinin əsas təsir gücü müəyyən səs ardıcıllıqlarının möhtəşəm emosional təsirindədir. Musiqi insanların hisslərində, real həyatında az hallarda baş verən ciddi emosional təlatümlərə səbəb olur. Belə təlatümlərin qısamüddətli fiziki gərginliklər və emosional boşalmalarla növbələşməsi insanın normal psixi inkişafı üçün olduqca faydalı və zəruridir. İnsanlar həyatlarında mütəmadi olaraq güclü qıcıqlanmalara məruz qalmadıqda həyatlarını tam dolğunluqla yaşamamış kimi hiss edirlər.

İnsanlar hələ qədim zamanlardan musiqidən özlərində müvafiq əhvali-ruhiyyəni yaratmaq üçün istifadə etmişdirlər. Musiqi ilə yaradılan xüsusi əhval döyüşlərdə yaralıların ağrılarına qarşı dözümlülük, cəsarət, nikbinlik və s. hisslər formalaşdırmaq üçün istifadə edilirdi. Müasir dövrdə bəzi musiqilər insanlarda elə oyanıqlığa səbəb olur ki, onu dinləyənlər olduqları məkanda musiqi alətlərini, mebelləri və digər əşyaları sındırmağa, bir-birini amansızlıqla döyməyə başlayırlar. Eyni zamanda musiqi insanlarda mətanət, mərdlik, mərhəmət, sevgi, minnətdarlıq və s. hissləri də formalaşdırır, şəxsiyyətin pozitiv keyfiyyətlərinin formalaşmasına və təzahürünə səbəb olur. İnsanlar şüurlu şəkildə özlərində bu və ya digər hissləri oyadaraq öz emosional sferalarını tənzimləyirlər. Bu işdə musiqinin əhəmiyyəti və rolu olduqca böyükdür. Musiqi ehtiraslara təsir edən ən güclü vasitələrdən biridir. Napaleon qeyd etmişdir ki, mənəviyyat haqqında yazılmış mətn insanların şüuruna təsir etsə də, onların vərdişlərinə ciddi təsir göstərmir. Musiqi isə birbaşa hisslərə təsir göstərməklə insanların islah olunmalarına xidmət edir.

Lakin cəmiyyətlə bərabər musiqi də dəyişir və dövrə uyğunlaşırdı. Musiqinin və musiqi zövqünün tənəzzül etdiyi bəzi müasir cəmiyyətlərdə birmənalı inkişafdan danışmaq mübahisəli məsələdir. Belə cəmiyyətlərdə musiqi zövqlərinin kütləvi şəkildə korlanması göz qabağındadır. Deməli, cəmiyyətin də durumu buna uyğundur. Cəmiyyətdə münasibətlər və dəyərlərin tənəzzülü səbəbindən onun harmoniyası pozulduqda belə, musiqi hələ bir müddət saf və təmiz qalaraq bu harmoniyanın bərpasına çağırışlar edir. Məsələn,

“Nə əcaib sürü Yahu, bunlar
Öndə rəhbərlik edir meymunlar
Rəqsi təlim ediyor axsaqlar
Əzəmət düşkünüdür alçaqlar
Zövqə biganə səfillər bol-bol
Şeri sənətdə arar bir yeni yol
Yurdu sarmış qabalıq, yaltaqlıq
Yüksəliş varsa, səbəb alçaqlıq”

şeirinin yazıldığı dövrdə Üzeyir bəy musiqisi pozulmuş harmoniyanı bərpa etmək üçün “Leyli və Məcnun”la ağlayır, “O olmasın, bu olsun”la gülür, “Koroğlu”nun uvertürası ilə haray və nalə çəkirdi. Üzeyir bəyin musiqisi öz missiyasını axıra qədər yerinə yetirdi. Azərbaycanda Xalq azadlıq hərəkatı başlayanda “Azadlıq meydanı”nda ilk səslənən musiqi “Koroğlu”nun uvertürası oldu.

Musiqi hər bir millətin tarixinin, dilinin, vətən-məkan təsəvvürlərinin, mental xüsusiyyətlərinin və təməl milli dəyərlərinin müvafiq harmoniya və lad sistemində səslərlə kodlaşmış ifadəsi – genetik yaddaşıdır.

Xalqın musiqi yaddaşı qorunduqca və milli musiqisi mütəmadi səsləndikcə millət köklərinə bağlı şəkildə ayaqda duracaq, yad təsirlərdən təmizlənəcək və dəyərlərini təcavüzlərdən qoruyacaqdır.

Millətin musiqisi və musiqi zövqü korlanarsa, təməl dəyərlərində ciddi pozuntular yaranar. Belə hallar millətlər və xalqlar üçün dönməz proseslərə də səbəb ola bilər.

Günün hər vaxtında mobil telefonlarda, televiziya və radioların bütün kanallarında

dayanmadan musiqi səslənir. Hər kəs istədiyi musiqini məhdudiyyətsiz dinləyə bilir.

İlk muğam müsabiqəsi keçirilən zaman cəmiyyətdə sanki bir durulaşma baş verdi, insanların münasibətlərində əvvəlki dəyərlərin dirçəlişi başladı.

Yaxın keçmişdə bazar günləri saat 14:00-da, muğam saatında evlərdən, bağlardan, avtobuslardan eyni hava səslənəndə bütün ətraf bir ahəngə köklənirdilər. Axşamlar isə bütün insanlar yeni gün ərəfəsində ən gözəl musiqi olan sükutun səsinə qərq olur, mütləq bir ahəngə köklənir və güzaran “kirindən” təmizlənirdilər. Müasir cəmiyyətlərin bir çoxu artıq gecələr belə, ecazkar sükutun, sakitliyin həsrətindədirlər, bəlkə də artıq onu heç xatırlamırlar. Bu isə insanın musiqi dünyasında manqurdlaşmaya səbəb ola bilir. Susmağı bacarmayan gözəl danışa bilməz, sükutdan zövq almayan musiqini anlamaz.

Musiqi insan üçün böyük həzz və zövq mənbəyidir. Onun yüngül əyləncə vasitəsinə çevrilməsi cəmiyyətin dəyərsizləşməsinin ən təhlükəli göstəricisidir. Musiqi əyləncə vasitəsi kimi istifadə edildikdə o bəsitləşir, məzmunsuzlaşır, bayağılaşır və cəmiyyətə, xüsusilə zövqü hələ formalaşmamış gənclərə düşük dəyərlər, mənəviyyatsızlıq və düşkünlük aşılayır.

Nikbin, ruhlandırıcı “sağlam” musiqiləri mütəmadi dinlədikdə insanın həyat tərzi də bu ahəngə köklənir, onda müsbət dəyişikliklər baş verir. Lakin ifrata varmaq olmaz: “Bir inci saflığı varsa da suda, artıq içiləndə dərd verir su da”. Gözəl musiqi ifrat dərəcədə dinlənildikdə adiləşir.

Bəzi mənbələrdə musiqi, bəstəkar və cəmiyyət münasibətləri kontekstində tarixi inkişafın 3 mərhələsi ayırd edilir.

1-ci mərhələ:

a) musiqi sayca az olan “seçilmişlər” üçün əlçatan idi;

b) bəstəkarları barmaqla sayılacaq qədər az olardı və onlar xüsusi istedada malik şəxslər idi, geniş cəmiyyətdə tanınmırdılar;

c) musiqi, əsasən, saraylarda səslənirdi;

d) musiqilər, əsasən, lirik idi.

2-ci mərhələ:

a) musiqi müəyyən qruplara, sosial təbəqələrə əlçatan oldu;

b) bəstəkarların sayı xeyli artdı və onlar cəmiyyətdə tanınan peşəkarlar idi;

c) musiqi müəyyən vaxtlarda, xüsusi zallarda və salonlarda səslənirdi;

d) musiqilər müxtəlif məzmunlu olmaqla, müəyyən bir əhvali-ruhiyyəni ifadə edirdi;

3-cü mərhələ:

a) musiqi, demək olar ki, hamı üçün əlçatan oldu;

b) bəstəkarların sayı bilinmir və əksəriyyətini heç kəs tanımır;

c) musiqi hər zaman və hər yerdə səslənir;

d) bir çox hallarda musiqinin mahiyyəti və mənası bilinmir.

Zənnimizcə, düzgün musiqi tərbiyəsinin yolları müxtəlif olsa da, bu yollar başlanğıcını xalq musiqisindən götürməli, formalaşdıracağı dəyərlər sistemində bayağı, saxta səslər olmamalı və bu sistem milli-mənəvi, ümumbəşəri dəyərlərlə ahəng təşkil etməlidir.

Müstəqil olmadığımız zamanlarda belə, milli və mənəvi yaddaşımız, dəyərlərimiz, təcrübəmiz və tariximiz, ruhani xalq mahnılarımızda, onlardan qaynaqlanan musiqilərimizdə yaşadılmış, nəsildən nəslə ötürülərək qorunmuşdur. Çar Rusiyası və SSRİ-nin müstəmləkəçilik və assimilyasiya texnoloqları, ideoloqları türk xalqlarını manqurdlaşdırmağa yönəlmiş siyasətlərində dilimizə, folklorumuza, qədim və müasir ədəbiyyatımıza, tariximizə, torpaqlarımıza təcavüzlər etmişlər. Lakin musiqi və mahnılarımızdakı həqiqətləri başa düşüb, dərk edə bilmədiklərindən ona toxunmamışdılar.

Sapı özümüzdən olan baltalar M.Müşfiqin, H.Cavidin, Ə.Cavadın dilini, yazılarındakı sətiraltı mənaları anlasalar da, Ü.Hacıbəylinin "dilini", muğamların harayını, halayını, naləsini, nərəsini, sevincini, kədərini başa düşmürdülər. Çünki qəlbində, əslində, xəyanət olanlar musiqimizin dilini bilmir, dinləsələr də başa düşmürdülər. Quran ayələri pak qəlbləri doğru yola yönəldib, azğınların çaşqınlığını artırdığı kimi milli musiqimiz də yalnız qəlbi pak olanları duyğulandırır, məramını və təsirini onlara sirayət etdirirdi.

Yazılana, danışılana nəzarət edib yazarları, danışanları məhv etsələr də musiqimizin fəlsəfəsini başa düşmədilər. Musiqimiz özlüyümüzü qoruyub saxlamaqda öhdəsinə düşən missiyanı yerinə yetirirdi. M.Müşfiq: "oxu tar, oxu tar!" naləsi ilə repressiya tonqalına atılaraq tarı qorudu. Tar musiqisində, səsində dəyərlərimizi – hiss və duyğularımızı, sevinc və kədərimizi, fərəh və qəzəbimizi yaşadaraq bizi millət kimi ayaqda saxladı. Tar görəndə yadımıza M.Müşfiq, tar səslənəndə yadımıza kimliyimiz düşür.

Dövlət xadimi, yazıçı və dramaturq Şıxəli Qurbanovun yalnız bir dəfə təşkil edə bildiyi Novruz bayramında musiqimiz bir axşam boyu tarixi yaddaşımızı silkələyərək tüğyan etdi. Novruzla bağlı dəyərlərimiz o gecə sanki dirilik suyu içdi. O, böyük və bərəkətli bir gecə idi. Şıxəli Qurbanov özünü bir bayram axşamına Qurban verərək əbədiləşdi. Yaddaşlarda silinməyən bir iz qoydu.

Muğamlarımız hər gün və hər yerdə səslənərək yatmış, uyumuş ruhları oyatdı və cəmiyyət yavaş-yavaş özünə gəlməyə başladı. Bu hadisənin real tarixi əhəmiyyəti zaman keçdikcə daha aydın və hərtərəfli dərk ediləcək və aydınlaşacaq. Göstərilən dəstək və təəssübkeşlik nəticəsində muğamımız dirçələrək xalqımızın təbliğat və təşviqat vasitəsi kimi Qərbə və Şərqə tərəf yürüdü. Özü ilə bərabər həqiqətlərimizi də irəli apardı, yüksəltdi və yaydı. Bu işdə bir qədər də davamlı və müvəffəq olsaq, muğamın açdığı cığırla özümüz də, vaxtı çatanda ordumuz da itirilmiş torpaqlarımıza doğru irəliləyə biləcək. 2016-cı ilin aprel döyüşləri bunu təkzibedilməz şəkildə təsdiq etdi.

Bizim danılmaz üstünlüyümüz dilimizin, dinimizin, ədəbiyyatımızın və zəngin musiqimizin olmasıdır. Qloballaşma proseslərinin tərəddüdlərindən, müasir dövrün təbii fəlakətlər, böhranlar və inqilablar burulğanından, nəhəng dövlətlərin təzyiq və təhdidlərindən ləyaqətlə çıxmağımız üçün dinimiz, dilimiz və musiqimiz milli mühafizə sisteminin ən həssas və etibarlı dayaqlarıdır.

Xalq mahnısı yalnız o zaman xalqın mahnısı olur ki, ifa edənin də, dinləyənin də ruhunun bu mahnıya ehtiyacı olsun. Uşaqlar xalq mahnıları xəzinəsindən bəhrələnərkən eyni zamanda xalq dilinin gözəlliyini, ifadəliliyini mənimsəyir, xalq poeziyasının dərinliyini və canlılığını duyurlar.

Musiqini bir incəsənət əsəri kimi dinləməkdən ötrü müvafiq musiqinin, peşəkar və mahir ifaçısının olması ilə yanaşı, dinləyicidə də musiqini qəbul etməyə köklənmiş qəlbin və dinləmə prosesinə təmərküzləşmiş diqqətin olması da zəruridir.

Əsl sənət əsəri bəstəkar və ifaçıların fiziki, mənəvi və yaradıcılıq sahələrinin ən yüksək səviyyədə mərkəzləşməsinin məhsuludur. Belə bir əsər dinləyicidən də müvafiq konsentrasiya tələb edir. Heç bir sənət əsəri musiqi qədər gərgin və tam təmərküzləşmiş diqqət tələb etmir və bu səbəbdən onun qədər də təsir etmir. Tamaşa edilən rəsmdən, oxunan şeirdən diqqət yayındıqda, həmin yerə yenidən qayıtmaq

mümkündür. Musiqidə isə hər şey ani və təkrarolunmaz olur.

XX əsr bəşəriyyət tarixində ictimai münasibətlər, mədəniyyət, elmi-texniki tərəqqi ilə yanaşı musiqi yaradıcılığı və ona münasibət baxımından da əsaslı dəyişikliklərin təməlini qoydu. Peşəkarların musiqilərində dinləyicilərin adət etdiyi bir çox həqiqətlər son dövrün gerçəklikləri ilə şübhə altına alındı.

Bəşəriyyət və musiqi tarixi göstərir ki, bəzi dövrlərdə insanlar yaşadıqları tarixin memarı, hadisələrin fəal iştirakçısı olurlar. Bu zaman tarixi şərait özü keçici və dəyişkən olana vaxt və fürsət vermir. Belə olduqda, bütün güzəran və sosial amillər əsas məqsədə tabe edilir, insanlar ayrı-ayrılıqda və cəmiyyət bütövlükdə ciddi musiqilərə meyil edir.

Tolstoy qeyd edirdi ki, insanların maddi tələbatlardan daha çox incəsənətə ehtiyacları var. Bu ehtiyac rəssamların, musiqiçilərin və pedaqoqların istək və arzularından deyil, həyatın və cəmiyyətin öz zərurətindən qaynaqlanır.

Bəziləri hesab edir ki, ciddi musiqi mürəkkəbdir və onu hamı başa düşmür. O, darıxdırıcı, üzücü, dəbdən düşmüş, aktuallığını itirmiş və dövrünü bitirmişdir.

Müasir dövrdə musiqi və cəmiyyət kontekstində aşağıdakı ziddiyyətlər mövcuddur:

- klassik musiqi anlaşıqlı olsa da, aktual deyil;
- müasir musiqi aktual olsa da, anlaşıqlı deyil;
- müasir dövrdə musiqi, əsasən əyləncə vasitəsidir.

Qeyd etmək lazımdır ki, tarixin heç bir dövründə musiqinin əsas və ya yeganə məqsədi əyləndirmək olmayıb. “Böyük” əsərlər öz dövrünün və ya ümumiyyətlə, bəşəriyyətin ümumi problemlərinə yönəlməklə yanaşı, yarandıqları dövr üçün anlaşıqlı və aktual olmuş, bütün sonrakı dövrlər üçün də müasir qalmışlar.

Müasir dövrdə bəstəkarların, musiqi janrlarının və əsərlərinin say çoxluğu bütün əvvəlki dövrlərin toplamı ilə müqayisə edilə bilər. Ciddi musiqilərin yaradıcıları və dinləyiciləri isə həmişə olduğu kimi indi də azlıqdadır. Bu seçilmişlərin qisməti və müqəddəratıdır. Klassik musiqi müasir musiqidən üstün və daha tələbedilən olduğu qədər də, kütləvi musiqidən bu mənada geri qalır.

Klassik musiqi bir qayda olaraq insanlığın və cəmiyyətin önəmli problemlərinə həsr edilir. Psixoloji tədqiqatlar göstərir ki, gənclər, bir qayda olaraq, belə problemlərlə intensiv və dərindən məşğul olurlar. Belə olan halda gənclərin əksəriyyətinin klassik musiqiyə laqeydliyi təəccüb doğurur. Bunun səbəblərindən biri odur ki, gənclər klassik musiqini onun mahiyyətinə varmadan, yaşlı nəslin əyləncəsi hesab edirlər.

İnsanın musiqi tərbiyəsinin kamil olması üçün onun musiqi ilə ünsiyyəti rəqs, mahnı, musiqili tamaşa, orkestr konsertləri və musiqi ədəbiyyatı da daxil olmaqla hərtərəfli olmalıdır.

Hər bir şeyin sürətlə dəyişdiyi bir zamanda insanlar məzuniyyət, ezamiyyət, təhsil, əmək fəaliyyəti və s. səbəbdən yaşayış yerlərini müxtəlif müddətə, bəzən də ömürlük dəyişməli olurlar. İnsanlar qısa bir zamandan sonra o yerdə şüurlu və ya təhtəlşüur şəkildə təsəvvüründəki doğma evinin – ocağının ab-havasını, mühitini və ya obrazını canlandırmağa çalışır. Özünü, bir anlıq da olsa, evində və evindəki kimi hiss etmək istəyir. Doğma ocaq və əzizlərimiz haqqında mahnı bu təəssüratları ən dolğun və kövrək şəkildə canlandırır.

Musiqi daşıyıcısı və səsləndirici vasitələrinin sayca çox az və imkanlarının məhdud olduğu vaxtlarda uzun müddət qəribçilik çəkmiş insanların doğma

musiqilərini dinləyərkən necə həyəcanlandıqları yaşlı nəslin yaxşı yadındadır. İndi insanların qəribçiliyi nisbətən asan keçirmələrinin bir səbəbi də, doğma musiqilərini özləri ilə daşıya bilmələridir.

Musiqi insana hər yerdə lazımdır. O, rahatlığı və gözəlliyi təmin edir, ətraf mühitlə əlaqəni ahəngləşdirir, insana kainatın bir parçası - övladı olduğunu xatırladır. Şübhəsiz ki, musiqinin məkanla bir bağlılığı var. Bu əlaqə hələ yaxşı öyrənilməli və tədqiq olunmalıdır. Məsələn, Avropalı üçün Yapon, Çin, Vyetnam, Koreya musiqilərini ayırd etmək çətindir. Çinli isə bunları asanlıqla fərqləndirir. Yapon üçün eyni cür səslənməyinə baxmayaraq, biz Şirvan, Tovuz və Qarabağ aşıq musiqisini, Qarabağ, Şirvan və Bakı muğam üslubunu fərqləndiririk.

Qarabağın kimə məxsus olduğunun təkzibediməz dəlili "Qarabağ şikəstəsi"dir. Onu nə saxtalaşdırmaq, nə də özününküləşdirmək mümkündür.

Bu baxımdan şagirdlərin musiqi təliminin düzgün təşkili və onun məzmunu tərbiyə amilinin əsas tərkib hissələrindən biridir. Ümumtəhsil məktəblərinin ibtidai təhsil səviyyəsində musiqi fənninin tədrisinin ixtisaslı müəllimlərə verilməsi məsələsi də məqsədəuyğun görünür. Böyüməkdə olan nəslin musiqi mədəniyyətinin, estetik zövqünün formalaşdırılması təkcə ümumtəhsil məktəblərində olan musiqi təlimi ilə məhdudlaşmamalıdır. Müxtəlif kütləvi tədbir və mərasimlərdə səslənən musiqilər, teleradio kanallarında gedən musiqili verilişlər bu işə öz töhfələrini verməlidir. Gələcək nəslin mənəvi siması dövlət əhəmiyyətli məsələ olduğundan bu sahədə xüsusi proqram və layihələrin təqdir olunması və dəstəklənməsi də məqsədəuyğundur. Muğam müsabiqələri buna ən yaxşı nümunələrdəndir.

*Rəyçi: prof. O.Rəcəbov*

## İstifadə edilmiş ədəbiyyat

1. QURAN. Qafqaz Müsəlmanları idarəsinin sifarişi ilə. Bakı: Azərnəşr, 1991.

2. Abdullayeva M. Klassik poeziya: ezoterik xəzinə. Bakı: Bakı Universiteti, 2009.

3. Лук А. Эмоции и личность. Знание. М.: 1982.

4. http://www.levelmusic.ru/qumu vs-748-1.html. Теоретический анализ становления музыки в истории человечества (15.07.2011).

**Э.Бейлеров,**
**Б.Алекперова**

**Музыка и общества**

**Резюме**

В статье проанализировано влияние музыки на развитие общества с разных аспектов. Просматривались психологическое влияние музыки на человека и психологические основы влияни музыки на общество в различных культурах.

Комментировались психологические задачи влияния разнобразной музыки на различные области человеческой деятельности, а также на формирование его как личность особенно отмечалось, что музыка является важным аспектом в духовной жизни человека.

**E.Baylarov,**
**B.Alekperova**

**Music and society**

**Summary**

In the article music is given as the universal language of the universe and were analyzed its effects of the development of society from various viewpoints. The psychological impacts of music on man and its influence in the different cultures of society have been considered in the article.

In the article were explained psychological issues of music also impacts of various music to the different fields of human activity and its influence to the formation of his personality. İn the article has been highlighted that music is the most effective means of integrating with others, and to the universe.



# TƏDQİQATÇILIQ MOTİVASİYA YARADIR

**Səbinə Ağayeva,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, riyaziyyat üzrə fəlsəfə doktoru***

Məqalədə fənlərin tədrisində tədqiqatçılıq vərdişləri, onun şagirdlərdə motivasiya yaratmasından bəhs edilir. Görkəmli Azərbaycan alimlərinin xidmətləri yada salınır. Riyazi biliklərin həyatda, praktikada yerini bir daha təsdiq edir.

***Açar sözlər:*** *tədqiqatçılıq, motivasiya, elmi əsərlər, metodika elmi, sələflər.*
***Ключевые слова:*** *исследование, мотивация, научные труды, наука о методике, предшественники.*
***Key words:*** *research, motivation, scientific works, methodology, ancestors.*

Təlim prosesində ümumi metodlarla yanaşı, hər bir fənnə məxsus elmi metodlardan da istifadə olunur. Bunlardan biri də tədqiqatçılıq metodudur.

XXI əsr məktəbi gənc nəsli möhkəm və dərin biliklərlə silahlandırmaqla yanaşı həm də onlarda aldığı biliklərə yaradıcı şəkildə yanaşmaq bacarığını formalaşdırmağı, hər hansı bir məsələ barədə müstəqil fikir söyləmək, mülahizə etmək, nəticə çıxarmaq kimi əməli vərdişlər aşılamağı, şagirdlərdə dərketmə qabiliyyətlərini inkişaf etdirməyi qarşıya qoyur. Bu vəzifənin yerinə yetirilməsi isə müəllimlərdən pedaqogikanın müasir dövr üçün aktual sayılan təlim metodlarının, o cümlədən, tədqiqatçılıq metodunun dərslərdə tətbiqinə imkan yaradır.

Təcrübə göstərir ki,dərslərdə tətbiq edilən müasir təlim metodikası şagirdləri biliklərlə silahlandırmaqla yanaşı onların idrak fəaliyyəti və düşüncə qabiliyyətlərinin inkişafına da təsir edir. Ümumilikdə onlara öz qarşısına böyük məqsəd qoymağı və müstəqil surətdə fikirləşməyi öyrədir. Bunlar isə, şagirdlərdə idrak fəaliyyətinin birtərəfli təkraredici xarakterin aradan qaldırılmasına kömək edir.

Təlimdə ən böyük fikir müstəqilliyi isə tədqiqatçılıq metodunun tətbiqini mümkün edir. Burada ən qiymətli vasitə ilkin - axtarıcılıq və tədqiqatçılıq metoduna arxalanmaqdır. Bu zaman şagird bir növ hazır biliklər almaqdan uzaqlaşır və özü də tədqiqatçı vəziyyətinə salınır. Şagird böyük alimin getdiyi yolu qısaldılmış şəkildə təkrar edir. Onlarda müstəqil problemlər haqqında düşünülməsi, axtarılan məsələ ilə əlaqədar ehtimallar söylənilməsi, ekskursiyalara, mühazirələrə ehtiyac duyulması kimi vərdişlərə meyil oyadır. Lakin tədqiqatçılıq metodu müəllimin şərhinə, dərs ilindəki materialın öyrədilməsinə qarşı qoyulmamalıdır. Bəlkə buna onun yardımçısı kimi baxılmalıdır.

Dərsdəki böyük problemlərdən kiçik bir hissə tədqiqatçılıq üçün ayrılmalıdır. Lakin bu problem sinifdən-sinfə dərinləşdirilməli, sonda nəticəyönümlü işə çevrilməlidir. Müəllim bilməlidir ki, tədqiqat işinin aparılması şagirdlər üçün xeyli mürəkkəb işdir. Tədqiqatçılıq üçün şagirdlərdə müəllim ilkin hazırlıq kimi, elmi təfəkkür üsullarına, müşahidə və eksperiment texnikasına yiyələnmək vərdişləri formalaşmalıdır. Müəllim şagirdlərə hazır biliklər versə də, onların əldə edilməsi yollarından da danışmalıdır. Hətta müəllim qeyd etməlidir ki, bu asan məsələ deyildir. Alimlər nəyisə əldə etmək üçün fərziyyələr yaradır, onları yoxlayar, mülahizələrə cavab verməyə hazır olurlar.

Şagirdlər tədqiqatçılıq üçün səbir və iradənin vacibliyi qənaətinə də gəlirlər. Beləliklə, müəllim şagirdlər qarşısında axtarıcılıq fəaliyyəti yolunun özünü nümayiş etdirir. Onlara elmi təfəkkürün nümunəsini verir və bununla da şagirdlərin fikirlərinin həmişə doğru hərəkəti izləməyə yönəldir. Onları bir növ elmi axtarışın ixtisasçısına çevirir. Bu zaman müəllim onları ixtisasa doğru istiqamətləndirir. Şagirdlərin diqqətini alimlərin fəaliyyətinin elə cəhətlərinə cəlb edir ki, bunlar mərdlik, prinsipiallıq, təmənnasızlıq, məqsədəyönəldilmişlik, məqsədə çatmaqda əzmkarlıq nümunəsi olmağa səsləyir. Bu prosesdə bir sıra pedaqoji inkişaf yolu vardır ki, müəllim onları tutmağı bacarmalıdır.

Biliklərin şərhi prosesində sistemliliyə yol verilməlidir. Ali məktəblərdə mühazirələr vaxtı müəllim yeri gəldikcə şərhini saxlamalı, şagirdlər qarşısında həll olunması tədqiqatçılıq tələb edən suallar qoymalıdır. Onda mühazirə daha maraqlı və canlı olur. Bolonya prosesini dərindən öyrənənlər bunu yaxşı bilirlər. Təhsilalanların fəallığı tədqiqatçılıq meyilinin ilkin mərhələsidir.

Yuxarıda ilkin-axtarıcılıq metodunun adı çəkilmişdir. Bu problemin şərhi onunla bağlıdır ki, qarşıya qoyulan problemi əsasən müəllim həll edir, şagirdlər isə buna qismən qoşulurlar. Ona görə də, bu metod tam axtarış metodu deyil, qismən axtarış metodu kimi pedaqoji ədəbiyyatda çoxdan işlənir.

Tədqiqatçılıq metodu heç də bütün məsuliyyəti şagirdin, yaxud tələbənin üzərinə qoymur. Elmin əldə etdiyi biliklərin ümumiləşdirilmiş şəkildə şagirdlərə, tələbələrə çatdırmaq müəllimin - təhsilverənin üzərinə düşür. Elmi materialı möhkəm öyrənmək, təhsilalanları bacarıq və vərdişlərə yiyələndirmək müəllimin əsas məqsədi olmalıdır.

Müəllim tez-tez sinif qarşısında belə suallarla qarşılaşır: “Bəs siz belə problemlərlə qarşılaşan alimlərin yerində olsaydınız necə edərdiniz?”, “Bəs siz söylənmiş ehtimalın düzgünlüyünü necə yoxlaya bilərdiniz?”. Problemin həllinə müəllim də qoşulmalıdır.

Beləliklə, tədqiqatçılıq işi müəllimin yükünü azaltmır, bəlkə də, elmi rəhbər rolunda onun yükünü bir az da çoxaldır.

Tədqiqatçılıq metodu həm də şagirdlərdə hər hansı problemi araşdırma bacarığı da aşılayır, onu axtarıcılığa meyilləndirir. Şagirdlər isə onun həlli ilə məşğul olurlar. Müəllimin rəhbərliyi ilə müşahidə qabiliyyətinə yiyələnən şagirdlər yavaş-yavaş elmi biliklərə daha artıq maraq göstərir və beləliklə də, müstəqil işləmək yoluna üstünlük verirlər.

Tədqiqatçılıq metodunun tətbiqi fənlərin tədrisində sınaqdan keçmiş təcrübələrdən sayılır. Bu qayda qabaqcıl məktəblərdə dəfələrlə təcrübədən keçirilmişdir. Ölkədə elmin və təhsilin bütün sahələrində əldə edilmiş nailiyyətlərə də tədqiqatçılıq işinin

nəticələri kimi baxılmalıdır. Ona görə də tədris prosesində şərh olunan materiallar təqdim olunarkən, onların tədqiq, yaranma, inkişafetmə tarixinə də nəzər salmağa ehtiyac duyulur. Bu vəziyyət özü şagirdlərdə axtarıcılığa motivasiya yaradır.

Qeyd etmək lazımdır ki, riyaziyyat dərslərində motivasiyanın yaradılmasında inteqrasiyanın rolu əvəzsizdir. Riyaziyyatın hər bir qeydi və düsturunun tərifi, məzmunu şagirdlərin tədqiqatçılıq düşüncəsini möhkəmləndirir.

Təcrübə göstərir ki, ali məktəblərdə tələbələrə, ümumtəhsil məktəblərində şagirdlərə yeniliklərin, kəşflərin, qanunların tarixinə dair şərhlər verilərkən, onların “göydəndüşmə” olmadığına dair şagirdlərə yaş və bilik səviyyəsinə uyğun şəkildə izahat verilməsi də effektli olur.

“Riyaziyyat fənni öz daxilində idraka əsaslanan elmdir, onun özülü də qədimdən yaradıcılıq üzərində qurulub” - demişlər. Bu da ondan irəli gəlir ki, riyaziyyatda hər hansı təklif teorem, düstur vasitəsilə öz əksini tapır. Ona görə də burada intqrasiyanın meydanı başlayır. Çünki burada nitqin işə qarışmasına ehtiyac duyulur. Bundan sonrakı işlər isə, tədqiqatçılıq səriştəsindən asılıdır.

Belə ki, şagirdlər fənnin tədrisində hər bir mövzunun, hər bir bölmənin öyrənilməsində tədqiqat işinin tələb olunduğu qənaətinə gəlməlidirlər. Onların riyazi biliklərin həyati əhəmiyyətini şüurlu şəkildə qavramaları məqsədə çevrilir. Hazırda ölkəmizdə riyaziyyat fənni üzrə təhsil proqramının (kurikulumun) tətbiqi və bununla bağlı dərsliklərin, tədris vəsaitlərinin tərtib edilməsi, tədris materiallarının planlaşdırılması, təlim üsullarının müəyyənləşdirilməsi, müəllim hazırlığının yeni tələblərə uyğun hazırlanması çox böyük zəhmətin, ciddi tədqiqatların nəticəsi kimi qəbul edilməlidir.

Tədqiqatçılıq metodu şagirdlər tərəfindən bu və ya digər dərəcədə müstəqil həll oluna bilən məsələlərlə bağlıdır. Ola bilsin ki, ilk tədqiqatlarında şagirdlər səhvə yol versinlər, onları həmin məsələ üzərində təkrar işləməyə yönəltmək lazımdır. Tədqiqatın əsas cəhətlərindən biri, bəlkə də başlıcası odur ki, şagirdlər təlim prosesinin passiv iştirakçısı olmur. Onlar həyat boyu öyrənməyə hazırlanmalıdırlar.

Qeyd etmək lazımdır ki, riyaziyyat ümumtəhsil məktəblərində tədris olunan ən mühüm və vacib fənlərdən biridir. Dünyanın bütün ölkələrində bu fənnin öyrənilməsi önəmli yer tutur. Zehnin inkişafı üçün əvəzedilməz bir vasitə sayılan riyaziyyat şəxsiyyətin formalaşmasında müstəsna rol oynayır. Belə ki, bu fənn həm şagirdlərdə məntiqi təfəkkürün formalaşmasına, onlarda mühakimə və dərketmə qabiliyyətlərinin yüksəldilməsinə təsir göstərir, həm də müasir insanın hərtərəfli yetişməsi üçün ona riyaziyyatın nə qədər zəruri olduğunu göstərir. Burada şagirdlərin bütün materiallara yaradıcı yanaşması tələb olunur.

Tədqiqatçılıq yolu şagirdlərdə yaradıcı təfəkkürü gücləndirir. Müəllim hər bir mövzunu keçərkən motivasiya yaratmaq məqsədilə şagirdlərin diqqətini həll olunması mümkün olan problemlər üzərində cəmləşdirilir. Bunlar isə şagirdlərdə yeni biliyin öyrənilməsi prosesində müstəqil düşüncə yolu ilə axtarmaq və tədqiq etmək qabiliyyətinin inkişafına zəmin yaradır. Düzdür, bu yolla heç bir şagird elmə yenilik gətirmir. O, necə deyərlər, tədqiq olunmuşla-

rı yenidən "kəşf" edir. Nəticə isə təlimin keyfiyyətinin yüksəldilməsi üçün atılan addımlardır. Şagirdləri bu işlərə maraqlandırmaq üçün, yeri gəldikcə, riyaziyyatın təlimlə əlaqəli inkişafından, xarici ölkələrin, həmçinin vətənimizin görkəmli alimlərinin həyat və yaradıcılıqlarından, elmə gətirdikləri yeniliklərdən danışmaq lazım gəlir. Xüsusən riyaziyyatın metodikası sahəsində xidmətləri olan, məqalə, dərslik, dərs vəsaitləri yazan alimlərin adını çəkib, onları şagirdlərə tanıtmaq vacibdir. Bu zaman riyazi biliklərin həyatla əlaqələndirilməsinə xüsusi fikir verilməlidir. Şagirdlərdə sistemli dünyagörüşünün formalaşması tədqiqatçılığın başlanğıc nöqtəsidir.

Göründüyü kimi, riyaziyyatın tədrisində söhbət yalnız rəqəmlərlə işləməklə bitmir. Rəqəmlərlə işi insanların əməli fəaliyyətindən doğan tələbat kimi dəyərləndirməklə bərabər müxtəlif mövzuların tədrisi zamanı riyazi elmlərin, kəşflərin yaranma tarixi də yada salınmalıdır. Təhsilalanlar bilməlidir ki, tədqiqat işləri dərinləşdikcə fənnə maraq da artır, motivasiya güclənir. I sinifdən XI sinfə qədər tədris olunan riyaziyyata maraq oyadılması əsas məqsəd olmalıdır. Şagirdlər bu müddət ərzində riyaziyyat üzrə böyük alimlərin, pedaqoqların adını, maraqlı kəşflərlə əlaqədar rəvayətləri, həqiqətləri də eşitməli, onlar haqqında müəyyən məlumata yiyələnməlidirlər. Bu səbəbdən də müəllim ən azı respublikamızda riyaziyyatın tədrisi metodikasının inkişaf yoluna bələd olmalı, şagirdlərin diqqətini bu sahədə görülən işlərə cəlb etməyi bacarmalıdır. Təcrübə göstərir ki, görkəmli alimlər və onların fəaliyyətləri motivasiya üçün əsas olur.

Şagirdlərə ilk dərsliklər haqqında bəzi məlumatlar da maraqlıdır. Müəllim dərsdə, dərsdənkənar məşğələlərdə, riyaziyyat gecələrində şagirdlərə çatdırmalıdır ki, Azərbaycan dilində ilk riyaziyyat kitabı 1884-cü ildə Tbilisi şəhərində çap olunmuşdur. İlk dərslik "Hesab" adlanırdı. Onun müəllifi Camal Axundovdur. 1920-ci ilə qədər 14 dərslik və məsələ kitabı nəşr olunmuşdur. Bunlardan biri də böyük bəstəkar Üzeyir Hacıbəyliyə məxsusdur. 1920-ci ildən sonra ali məktəblərimizdə riyaziyyat dərsi ilk dəfə Azərbaycan dilində tədris olundu. Bu dərsləri R.Məlikov və M.Əfəndiyev aparırdı.

R.Məlikovla birlikdə M.Əfəndiyevin fəaliyyətinə az sonra B.Ağayev də qoşuldu. Riyaziyyatın tədrisi metodikasına dair ilk dəfə dissertasiya müdafiə edən də məhz B.Ağayev olmuşdur. Sonra Ə.İbrahimov, K.Xələfov, N.Sadıqov, S.Sadıqov, S.Nəsibov, İ.Əliyev, A.Quliyev bu yolla getmiş, riyaziyyatın tədrisinə dair çoxlu məqalə və kitablar yazmışlar.

Riyaziyyatçılar aləmində yaxşı tanınan professor M.Cavadovun ali məktəb üçün 8 kitabı nəşr edilmişdir. Onun bizim riyazi terminologiyanın yaranmasında və inkişafındakı xidməti də qeyd olunmalıdır. Azərbaycanda riyaziyyat elminin korifeyləri kimi tanınan Zahid Xəlilov, Əşrəf Hüseynov, Haşım Ağayev, Qoşqar Əhmədov və İbrahim İbra-himov riyaziyyatın tədrisi sahəsində böyük xidmətlər göstəriblər.

Şagirdlərə çatdırmaq lazımdır ki, Azərbaycan riyaziyyatçıları həm ali riyaziyyatın, həm də ümumtəhsil məktəblərində riyaziyyatın tədrisinin yüksək səviyyədə qurulmasına çox böyük əmək sərf etmişlər. Onlar çalışmışlar ki, həyatın hər bir sahəsində riyaziyyatın nüfuzedici xarakterini qorusunlar. Onlar bilirdilər ki, bu iş alimlərimizdən çoxcəhətli iş və təşkilatçılıq bacarığı tələb edir. Ona görə də, riyaziyyatın metodikası və tədrisi sahəsində böyük xidmətləri olan B.Ağayev ilə yanaşı T.Abdullayev, Q.Əhmədov, K.Şirinov, M.Sultanov, Ə.Həbibzadə riyaziyyata aid tədris vəsaitləri yazırdılar. Bu işə o zaman üçün yeni nəsil sayılan Ə.İbrahimovu, Ə.Yeqanlını, A.Sadıqovu və başqalarını da irəli çıxarırdı. Şagirdlər bu adları yadda saxlaya bilməsələr də, gələcəkdə eşitdikdə bu adlar onlara tanış gələcəkdir.

Riyaziyyatın inkişafına dair əsərlər sovet dövründə “Riyaziyyat və Mexanika İnstitutunun Əsərləri”ndə, ADU-nun “Elmi əsərləri”ndə, “Fizika və riyaziyyatın tədrisi” məcmu-əsində çap olunurdu. Müstəqillik dövründə ölkəmizdə riyaziyyatın inkişafı sahəsinə dair görülən işlər ayrıca bir tədqiqatın mövzusudur. Hələlik isə onlara izah edilməlidir ki, bu tədqiqatlar sizə gərəkdir. Sələflərimizi xatırlamaq həmişə müsbət hadisədir.

Bütün bunlar isə dərs saatı ərzində müəllim və şagirdlərin məhsuldar işləməsini təmin edir, dərs prosesinin intensivləşməsinə şərait yaradır. Şagirdlər tədris materiallarını yaradıcı şəkildə mənimsəmə vərdişini qazanırlar.

Riyaziyyat tədrisinin inkişaf yoluna nəzər salmaqla riyaziyyat müəllimləri öz işlərini yenidən qura bilirlər. Təlim metodlarını təkmilləşdirməklə dərsdə şagirdlərin fəallaşdırılmasına, onlarda müstəqil işləmə, tədqiqatçılıq vərdişlərinin yaradılmasına, qazanılan bilik və bacarıqların vərdişə çevrilməsinə, tədris prosesində geniş miqyasda istifadə edilməsinə nail olmaq mümkündür. Bütün bunlar isə şagirdlərə həyatdakı hadisələri düzgün qiymətləndirməyi və onlardan doğru nəticə çıxarmaq bacarıqlarını aşılayır. Orta məktəbdə belə silahlanmış gənclər tərəfindən sonralar yeni-yeni istiqamətlər üzrə maraqlı tədqiqatlar aparır və bəzən gözlənilməz nəticələrlə qarşılaşır. Hər bir müəllim bunları nəzərə almalı və parta arxasında oturanlara gələcəyin tədqiqatçıları olmalarına həm özü inanmalı, həm də onları inandırmalıdır.

Təcrübə göstərir ki, düşüncəli və sistemli, həm də ardıcıl olaraq müstəqil çalışan şagird, tələbə nəticədə kiçik tədqiqatçıya çevrilir. Öyrəndiklərini düşüncəli surətdə və sürətlə dərk edir, fikrini nəzəri və əməli cəhətdən əsaslandırmağı bacarır. İndi məktəblərdə “Kiçik Akademiya”lar yaranmışdır. “Kiçik Akademiya”nın əsasnaməsi də vardır. Bu yolla istedadlar üzə çıxarılır, gələcəyin alimləri yetişir.

Təhsilalanlar bilməlidir ki, hər il bütün elm sahələri üzrə yüzlərlə qabaqcıl pedaqoqlar və təhsil işçiləri tədqiqat aparırlar. Onların gərgin əməyi sayəsində ölkədə təhsilin və elmi tədqiqat işlərinin yeni və sürətli inkişaf dövrü daha da fəallaşır və təhsilimiz dünya elminə, təhsilinə inteqrasiya edilir.

***Rəyçi: prof. A.Adıgözəlov***

*3

## İstifadə edilmiş ədəbiyyat

1. Əlizadə A. Azərbaycan akademik elmi son 70 ildə. "Azərbaycan" qəzeti, 2015, 7 noyabr.

2. Hüseynov Ə., Ağayev B. 1920-1957-ci illərdə Azərbaycanda riyaziyyat metodikası və dərs vəsaiti. // Fizika və riyaziyyat tədrisi, 1957, № 3.

3. Ağayev B. Respublikamızda riyaziyyat tədrisi metodikasının inkişafı. // Fizika və riyaziyyat tədrisi, 1967, № 3.

4. Ağayev B. Azərbaycanda riyaziyyatın inkişafına dair. Fizika və riyaziyyat tədrisi, 1967, № 3.

5. İsmayılov Ə. Şagirdlərdə riyaziyyata maraq tərbiyəsi təcrübəsindən. // Fizika və riyaziyyat tədrisi, 1976, № 4.

6. Həmzəyev M. Şagirdlərin təlim fəallığının motivləşməsi haqqında. // İbtidai məktəb və məktəbəqədər tərbiyə, 1983, №5.

7. Ağayeva S., Məmmədova E. Kurikulumun tələblərinə uyğun yeni üsulların tətbiqi. // Azərbaycan məktəbi, 2016, №6.

**С.Агаева**

**Исследование способствует мотивации**

**Резюме**

В статье повествуется об исследовательских навыках в изучении предметов, о зарождении у учащихся мотивации к исследованию. Напоминаются заслуги известных азербайджанских ученых. Указанные факты в статье потверждают важность место математических знаний в жизни.

**S.Agayeva**

**Research leads motivation**

**Summary**

The article is dedicated to the research work which leads to motivation. Prominent Azerbaijan scientists' activities are mentioned here. These facts in the article confirm the importance of the place of mathematical knowledge in life.

* * *

**Hörmətli abunəçilər!**

**"Azərbaycan məktəbi" jurnalının 2017-ci ildə ilboyu normal fəaliyyətinin tənzimlənməsindən ötrü Sizi abunə yazılışına qoşulmağa çağırırıq. İldə 6 nömrə nəşr olunur. Bir nüsxənin abunə haqqı 2 manat 50 qəpik, illik abunə haqqı 15 manatdır.**

**Abunə respublikamızda fəaliyyət göstərən**

| | |
|---|---|
| **"Azərmətbuatyayımı" ASC** | **440-39-83** |
| **"Qasid" ASC** | **493-23-19** |
| **"Qaya"** | **565-67-13** |
| **"Səma"** | **594-09-59** |
| **"Xpress-Elita"** | **437-28-10** |
| **"Kaspi"** | **432-39-55** |

**mətbuatyayımı firmalarında qəbul edilir. Böyük ənənələri olan pedaqoji jurnalımıza abunə yazılmağa tələsin.**

**İndeks: 1002**



# İSTEDADLI ŞAGİRDLƏRİN FORMALAŞMASINDA FƏRDİ-PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİN NƏZƏRƏ ALINMASI

**Nahidə Cəfərova,**
***Lənkəran Dövlət Universitetinin baş müəllimi***

***Açar sözlər:*** *istedad, temperament, xarakter, şəxsiyyət, sosial mühit.*
***Ключевые слова:*** *одаренность, темперамент, характер, личность, социальное условие.*
***Key words:*** *talent, temperament, character, personality, social atmosphere.*

İstedadlı şagirdlərin şəxsiyyətinin formalaşması, onun inkişafına təsir edən amillərin öyrənilməsi pedaqoji psixologiyanın əsas vəzifələrindən biridir. Bu vəzifənin həyata keçirilməsi mühüm problem kimi daim diqqət mərkəzində saxlanılmalıdır. Müasir dövrdə də bu problem mühüm əhəmiyyət kəsb edir. Sosial, siyasi, iqtisadi sahələrdə baş verən dəyişikliklər şagird şəxsiyyətinə də ciddi təsir göstərir. Belə təsirlərin nəticələri şagirdlərin psixi inkişafında, onların həyata baxışlarında, yaşlılarla münasibətində, maraqlarında, tələbatlarında, ümumiyyətlə, gündəlik davranışında öz əksini tapır. Psixi inkişafın qeyri-bərabər inkişaf qanunauyğunluğuna əsasən psixi hadisələr uşaqlarda müxtəlif səviyyələrdə inkişaf edir. Buna əsasən akselerant, reterdant, infantil, vunderkind uşaqlar, təlimdə geridə qalan və əksinə, daha çox müvəffəqiyyət qazanan, istedadlı şagirdlər fərqləndirilir. Hər bir qrupa daxil olan uşaqlar psixi inkişaf səviyyəsi ilə yanaşı davranış tərzinə, ətraf aləmə münasibətinə, dərketmə səviyyəsinə, xarakter əlamətlərinə görə fərqlənirlər. Eyni zamanda təlim prosesində şagirdlərin psixi inkişaf səviyyəsi yaş dövrlərinə müvafiq olsa da, motivasiya sahəsinə, yaradıcı fəaliyyətinə, praktik bacarıqlarına görə də fərqlənirlər. Qeyd edilən xüsusiyyətlər əsasında yaxşı, orta, zəif oxuyan, eləcə də təlimdə geridə qalan, yaxud əksinə, istedadlı şagirdlər fərqləndirilir.

İstedadlıların vaxtında aşkarlanması və formalaşdırılması hər bir müəllimdən pedaqoji səriştə tələb edir. Bu məqsədlə istedadlı şagirdləri xarakterizə edən əsas əlamətlər, istedadın struktur komponentləri, istedadın növləri, istedadın formalaşmasına təsir edən amillər ətraflı təhlil olunmalıdır. İstedadlı şagirdləri xarakterizə edən əsas əlamətlər kimi əməksevərlik, işgüzarlıq, baş verən hadisələrə ayıq yanaşma, özünə və ətrafdakılara qarşı tələbkarlıq, özünə sahib olmaq, müvazinətlilik, özünə inam, əzmkarlıq, qayğıkeşlik, həssaslıq, empatik xüsusiyyətlər, təhlil etmə bacarığı və s. xüsusiyyətlər xasdır. İstedad əlamətləri ilə

yanaşı, şagirdlərin yaş və cins xüsusiyyətlərinin, fərdi-psixoloji xüsusiyyətlərinin öyrənilməsi onların vaxtında aşkarlanmasına kömək edir. Yaş dövrlərinə görə istedadın aşkarlanmasında fəaliyyət növlərinin təhlili, aparıcı fəaliyyətin, psixikanın inkişafında oynadığı rolun öyrənilməsi xüsusi əhəmiyyət kəsb edir.

İstedadın psixoloji strukturu kimi qabiliyyətlər, onların növləri, qabiliyyətlərin inkişafını şərtləndirən amillərin təhlili istedadın təzahür xüsusiyyətlərini aydınlaşdırmağa imkan verir. Qabiliyyətlərin inkişafı fəaliyyət prosesi ilə əlaqədar olduğu üçün istedad da fəaliyyət prosesində təzahür edir. Fəaliyyət sahələrinə uyğun olaraq istedad fərqli şəkildə özünü büruzə verir. Bunları istedadın növləri kimi xarakterizə edirlər.

Artıq XX əsrdə istedad fenomeni prioritet məsələ kimi daha əsaslı şəkildə öyrənilməyə başlandı. Belə ki, XX əsrə qədər istedadlı insanları yalnız intellekt cəhətdən xarakterizə edirdilər. Akademik qabiliyyətləri, yəni ayrı-ayrı fənlər üzrə yüksək nəticələr əldə edən şagirdlər, təlimdə qeyri-adi uğurları olanlar və ümumiyyətlə, intellekt testlərindən yüksək bal toplayan uşaqlar istedadlı uşaqlar hesab olunurdu. Lakin elmi müşahidələr əsasında müəyyən olunmuşdur ki, əqli inkişafın yüksək göstəriciləri həmişə yüksək yaradıcı nailiyyətləri təmin edir. Eləcə də öyrənilmişdir ki, cəmiyyətin inkişafına təsir edən, onun perspektivini təmin edən insanlar heç də həmişə yüksək intellektlərinə görə fərqlənməmişlər. İnkişaf yaradıcılıq tələb edir. Yaradıcılıq istedadla bağlıdır və o yalnız bir sahədə, intellektual qabiliyyətlərdə deyil, ayrı-ayrı sahələrdə özünü büruzə verir. Bütün bu cəhətlər istedadın məzmununun daha dəqiq öyrənilməsinə, onun növlərinin müəyyənləşməsinə gətirib çıxarmışdır. İstedadın növləri müxtəlifdir və aşağıdakı kriteriyalara görə təyin olunur:

- fəaliyyət sahələri və onları təmin edən psixika sahələrinə görə;
- formalaşma dərəcəsinə görə;
- təzahür formalarına görə;
- müxtəlif fəaliyyət növlərində təzahür genişliyinə görə;
- yaş dövrlərinin inkişaf xüsusiyyətlərinə görə.

Bu kriteriyalar əsasında istedadın müxtəlif növləri müəyyən olunur. Əsas fəaliyyət sahələrinə praktik, nəzəri, bədii-estetik, kommunikativ, mənəvi-dəyər, texniki sahələr aid edilir. Psixikanın struktur sahələrinə görə intellektual, emosional, motivasiya-iradi sahələr qeyd olunur. Bu sahələr üzrə ayrı-ayrı istedad növləri formalaşır.

İstedadın növlərini digər cəhətdən də qruplara ayırmaq olar. Belə ki, istedadın formalaşma dərəcəsinə görə aktual istedad və potensial istedad fərqləndirilir. Aktual istedad psixoloji xarakteristika kimi istedadlı uşağın müəyyən hadisə, proses sahəsindəki fəaliyyətinin yaş və sosial normalara nəzərən yüksək icraçılıq səviyyəsini şərtləndirir. Belə istedadlı şagirdlər daim diqqət mərkəzində saxlanılmalıdır. Potensial istedad isə fərqli olaraq psixoloji xarakteristika kimi uşağın müəyyən hadisə, proses sahəsindəki fəaliyyətinin yaş və normalara nəzərən yüksək nəticələrinin müvafiq imkanlarını şərtləndirir. Potensial istedadın aşkarlanması və formalaşmasında müəllim əməyinin böyük rolu vardır. Çünki potensial istedad bir sıra səbəblərdən reallaşa bilmir. Əlverişsiz şəraitin təsiri ilə, məsələn problemli ailə vəziyyəti olduqda, zəif motivasiya zamanı və yaxud əlverişli təhsil mühitinin olmaması və s. belə potensial imkanların vaxtında reallaşmasının qarşısını alır.

Potensial istedadın sonrakı inkişafı barədə fikirlər müəyyən əlamətlər əsasında yürüdülür. Ona görə də məktəb psixoloqları bu keyfiyyətləri aşkarlamaq üçün psixodiaqnostik metodlardan düzgün istifadə etməlidirlər. Qeyd edək ki, potensial istedadın inkişafı üçün ilkin təbii imkanlara inkişafetdirici şərait yaradılmalıdır, çünki potensial istedad bu zəmində formalaşır.

İstedadı digər əlamətə, təzahür formasına görə də növlərə ayırmaq olar. Bu baxımdan gizli və aşkar istedad fərqləndirilir. Aşkar istedad psixoloji faktor kimi şagirdin müxtəlif fəaliyyət növlərində müvəffəqiyyətini təmin edir, onun aktiv fəaliyyətini şərtləndirir. Aşkar istedad hər bir şəraitdə parlaq və aydın şəkildə özünü büruzə verir. Belə istedada malik şagirdlərin imkanlarından səmərəli istifadə etmək üçün onları düzgün fəaliyyət növlərinə yönəltmək lazımdır. Bu istiqamətdə müəllim və psixoloqların üzərinə böyük məsuliyyət düşür. Belə ki, şagirdlərdə normal özünüqiymətləndirmə formalaşdırılmalıdır ki, onlar öz imkanlarından səmərəli istifadə edə bilsinlər.

Gizli istedad isə istənilən vaxtda, istənilən şəraitdə özünü büruzə vermir. Belə istedadı təyin etmək, qiymətləndirmək çox vaxt çətinlik törədir. Bəzi hallarda müəyyən yaş dövrünə qədər şagirdlər digərlərindən heç bir cəhətdən fərqlənmirlər. Sonrakı yaş dövründə isə şagirdin fəaliyyətində bir növ dönüş yaranır. Adətən, istedadın bu növü bədii yaradıcılıq, təsviri sənətlər, musiqi, bəzi hallarda da spesifik akademik qabiliyyətlərlə bağlı olur və bu sahələrdə inkişaf özünü göstərir. İstedadın belə gecikmə halları onu deməyə imkan verir ki, istedadın formalaşmasının konkret yaşı yoxdur. O, istənilən yaşda özünü büruzə verə bilər. Bu problemə müxtəlif aspektdən yanaşmaq lazımdır. Yəni istedadlıları aşkarlamaq üçün təkcə şagirdlərin yaş xüsusiyyətləri deyil, həm də onların ayrı-ayrı fəaliyyət növləri təhlil edilməli, öyrənməlidir. Çünki istedad, yaradıcı fəaliyyət müxtəlif sahələrdə özünü göstərir.

İstedadlıları yalnız yaxşı oxuyan, təlim prosesində uğur qazanan, akademik qabiliyyəti olan şagirdlər arasında axtarmaq düzgün deyil. Bu aspektdən yanaşaraq E.P.Torrens belə bir nəticəyə gəlir ki, yaradıcı fəaliyyətdə müvəffəqiyyət qazananlar heç də yaxşı oxuyan şagirdlər və yaxud intellekt qabiliyyəti yüksək olan uşaqlar deyil. Gizli istedadın vaxtında təzahür etməməsi bir sıra psixoloji faktorlarla bağlıdır. Məsələn, temperament tipləri ilə, aşağı qeyri-adekvat özünüqiymətləndirmə, hiperaktivliklə, davranış tərzi ilə və s. Bəzən şagirdlərin davranışında özünü büruzə verən neqativ hallar, intizamsızlıq, təlimə maraqlarının olmaması müəllimlərin onlara münasibətini dəyişir. Müəllimlər belə şagirdlərlə işləmək istəmir, onların hər hansı bir fəaliyyət sahəsində müvəffəqiyyət qazanmalarına inamsız yanaşırlar. Bəzən müəllimlərdə belə bir fikir formalaşır ki, istedadlı şagird, yaradıcı qabiliyyətə malik olan şagird yalnız yaxşı oxuyan şagird ola bilər. Lakin müşahidələr göstərir ki, hətta yaxşı oxumayan şagird belə yaradıcı fəaliyyəti ilə, müəyyən sahədə istedadı ilə digər şagirdlərdən fərqlənirlər. Məsələn, “Çətin” uşaqlar arasında da istedadlılar ola bilir. Belə ki, çox zaman “Çətin” uşaqların təlimə maraqları zəif olsa da onların digər sahələrdə fəallığı yüksək olur. Təlim prosesində əlavə maraqları yaratmaqla “Çətin” uşaqları təlimə cəlb etmək və onların potensial imkanlarından səmərəli istifadə etmək olar. Ona görə də istedadlıların aşkarlanmasında şagirdin ayrı-ayrı fəaliyyət

sahələrində fəallığının öyrənilməsinə diqqət artırılmalıdır.

İstedadın “yaş inkişafının xüsusiyyətləri” kriteriyasına görə erkən istedad və ləngimiş istedad növləri fərqləndirilir. Erkən istedad adından göründüyü kimi, uşaq şəxsiyyətinin inkişafında çox erkən yaşlarda özünü büruzə verir. Erkən istedad aşkar istedad kimi kiçik yaş dövrlərində çox parlaq şəkildə təzahür edir. Erkən istedada “Vunderkindləri” aid etmək olar. Vunderkind uşaqlar həqiqi istedadlılığa tamamilə uyğun gəlir. Lakin belə istedad həmişə yetkin yaşlarda da özünü doğrultmur.

Ləngimiş istedad isə əksinə sonrakı yaş dövrlərində, daha gec formalaşmağa başlayır. İstedadın bu növü də bir çox sahələrdə özünü göstərir. İstedadın ləngiməsinə bir çox amillər təsir göstərir. Şagirdin fərdi-psixoloji xüsusiyyətləri, məsələn, temperament tipi, normal sosial mühitin olmaması və s. Çox vaxt belə istedad sonrakı yaş dövrlərində, hətta yetkin yaş dövründə birdən – birə parlamağa başlayır. Bəzən həyat şəraiti, müəyyən problemlər, çətinliklər insanı çıxış yolu tapmağa vadar edir. Çox zaman müəyyən bir fiziki məhdudiyyəti olan şəxslərdə bu fakt müşahidə olunur. İstedadlılar içərisində çoxlu belə insanları göstərmək olar. Həyat şəraitinə uyğunlaşmaq üçün bəzən xüsusi təmrinlər nəticəsində hər hansı bir qabiliyyət inkişaf etdirilir. Bəzi hallarda isə şəraitin təsiri əsasında bir çox funksiyaların kompensasiyası istedadın formalaşmasına gətirib çıxarır.

İstedadlı şagird şəxsiyyətinin formalaşmasını səmərəli təşkil etmək üçün istedadın növlərinin təhlili ilə yanaşı, onların cins-yaş xüsusiyyətlərinin öyrənilməsi də xüsusi əhəmiyyət kəsb edir. Belə ki, ayrı-ayrı psixi proses və xassələrin cinsi fərqlərə görə öyrənilməsi istiqamətində həm ölkə, həm də xarici ölkə psixoloqları mühüm addımlar atmışlar. Həmçinin müxtəlif yaş qrupları üzrə qızlar və oğlanların intellektual qabiliyyətləri geniş şəkildə təhlil olunmuş və bu sahədə də fərqlərin olduğu qeyd olunmuşdur. Professor Ə.Əlizadə şagirdlərin cins-yaş xüsusiyyətlərini ətraflı öyrənmiş və şagirdlərin intellekt səviyyəsi və onun inkişaf məsələlərinin öyrənilməsində cinsi fərqlərin nəzərə alınmasının vacibliyini qeyd etmişdir. B.Əhmədov da “Cinsi fərqlərin nəzərə alınması vacibdirmi?” adlı məqaləsində bu barədə məlumat vermişdir. D.Elkonin, V.Davıdov, K.Qureviç, A.Leontyev, N.Leytes, İ.Kon və başqaları şagirdlərin intellektual qabiliyyətlərinin formalaşmasında cins və yaş xüsusiyyətlərinin nəzərə alınmasını vacib sayırdılar. Cins və yaş xüsusiyyətlərinin öyrənilməsinin vacibliyi ondan ibarətdir ki, uşaqlarda psixi inkişaf qızlarda və oğlanlarda təxminən bir – iki yaş fərqi ilə şərtlənir. Hər hansı bir keyfiyyətin, qabiliyyətin formalaşmasında senzitiv dövrlərin rolu olduğunu nəzərə alsaq deyə bilərik ki, qızlarda və oğlanlarda müəyyən qabiliyyət bir qədər fərqli vaxtlarda formalaşa bilər. Ümumiyyətlə, yeniyetməlik yaş dövrünə qədər qızlarda psixi funksiyalar oğlanlara nisbətən sürətlə inkişaf edir. Yəni qızlar oğlanlara nisbətən psixi cəhətdən tez böyüyürlər. Eyni zamanda fiziki inkişafda da bu dövrdə qızlar oğlanları qabaqlayır. Yeniyetməlik yaş dövründə isə əksinə, oğlanların həm boy artımı, həm də çəkilərinin artımı, ümumi əzələ gücü qızları ötüb keçir. Psixi funksiyaların inkişafı baxımından isə xüsusi fərqlər müşahidə edilmir. Lakin qabiliyyətlərin inkişafının cinsi fərqlər aspektində araşdırılması nəticə etibarilə müxtəlifdir. Qabiliyyət və istedadın

növlərinin müxtəlifliyini və bu keyfiyyətlərin əsasını təbii imkanların təşkil etdiyini nəzərə alaraq demək olar ki, bu təbii imkanların qabiliyyətə çevrilməsində cinsi xüsusiyyətlərə görə fərqlər yaranır. Məsələn, idman sahəsində, idman fəaliyyət növlərinə görə oğlan və qızlarda özünəməxsus təbii imkanlara görə müvafiq qabiliyyətlər formalaşır və onların müvəffəqiyyətini şərtləndirir. Belə fərqlərin texniki, riyazi, konstruktiv qabiliyyətlərin formalaşmasında necə təzahür etməsi də araşdırılır. Güzəran psixologiyasında oğlanların qızlardan, kişilərin qadınlardan ağıllı olması fikrinə də rast gəlinir. Lakin belə fikirlərin elmi əsası sübut olunmamışdır. Bəzi psixi funksiyalar, idrak prosesləri, kənar təsirlərə emosional reaksiyalara görə cinsi fərqlər özünü göstərsə də, intellektin inkişafı baxımından belə fərqlərin olmasını demək olmaz. Tədqiqatlardan məlumdur ki, məktəbəqədər və məktəb dövrünün ilk illərində qızların İQ göstəricisi oğlan həmyaşıdlarından üstündür. Lakin bu fərqlər getdikcə aradan qalxır. Əsasən oğlan və qızlar arasındakı fərqlər onların intellektual fəaliyyətin müxtəlif sahələrinə meyil etməsində özünü göstərir. Belə fərqlər, həmçinin akademik qabiliyyətlərin inkişaf səviyyəsində özünü göstərir. Belə ki, qızların, əsasən, humanitar elmlərə, oğlanların isə dəqiq elmlərə, xüsusilə riyaziyyata maraqlarının üstün olması tədqiqatlar əsasında öyrənilmişdir. İntellektual qabiliyyətlərin öyrənilməsi zamanı cinsi fərqlərin aradan qaldırılmasına dair tədqiqatlar  da vardır. Belə tədqiqatlar əsasən qadınlar tərəfindən aparılır. Lakin buna baxmayaraq problemə real yanaşmaq daha məqsədəuyğundur. Qabiliyyətlərin inkişafının məhz cinsi fərqlər aspektində araşdırılması istedadlıların vaxtında və düzgün aşkarlanması işinə çox kömək edir. Bu zaman psixi inkişafı şərtləndirən aparıcı fəaliyyət növləri, senzitiv dövrlər, eləcə də orqanizmin fərdi-psixoloji xüsusiyyətləri ətraflı təhlil olunub öyrənilməlidir.

Şəxsiyyətin sosiallaşması, onun ətraf aləmi dərk edib münasibət göstərməsi, özünüqiymətləndirmə və özünüaktuallaşdırması onun fərdi-psixoloji xüsusiyyətləri  ilə də bilavasitə bağlıdır. Fərdi-psixoloji xüsusiyyətlərə orqanizmin fərdi keyfiyyətləri, temperament tipləri, xarakterin aksentuasiyası tipləri, təfəkkürün fərdi xüsusiyyətləri və qabiliyyətlər daxildir. Eyni zamanda fərdi-psixoloji xüsusiyyətlərdən hər biri şagirdlərin istedadının formalaşması və inkişafında özünəməxsus rol oynayır. Bu məqsədlə istedadın qeyd olunan növlərinə dair əlamətlərin şagirdlərin şəxsiyyətində, onların fərdi-psixi xassələrində necə təzahür etməsi ətraflı təhlil olunmalıdır.

Fərdi-psixoloji xassə kimi temperament tiplərinin istedadın formalaşmasına təsirini aydınlaşdırmaq lazımdır. Aydındır ki, hər bir temperament tipinin özünəməxsus xüsusiyyətləri vardır. Bu xüsusiyyətlər şagirdlərin psixi proseslərinin dinamikasında, kənar təsirlərə cavab reaksiyalarında öz əksini tapır. Temperament tipləri şərti xarakter daşıyır və əsasən bir insanda iki tipin xüsusiyyətləri özünü büruzə verir. Lakin şagirdlərdə, adətən, hansı tipin xüsusiyyətləri daha qabarıq olursa o həmin tipə aid edilir. Temperament tipləri yaxşı və pis tiplər kimi deyil, qüvvətli və zəif tiplər kimi xarakterizə olunur. Bu da sinir sisteminin xassələri ilə əlaqədardır. Lakin hər bir temperament tipini xarakterizə edən müsbət və mənfi xüsusiyyətlər mövcuddur. Bu xüsusiyyətlər istedadlı şagirdlərin özünüqiymətləndirməsinə, özünüaktuallaşdırmasına, ma-

raqların formalaşmasına, iddia səviyyələrinin inkişafına təsirsiz ötmür. Belə ki, sanqvinik temperament tipinin ünsiyyətliliyi, özünü ifadə qabiliyyəti, təmas qurması, yeni şəraitə tez uyğunlaşması, liderlik qabiliyyətlərinin olması kimi müsbət xüsusiyyətlər ilə yanaşı mənfi xüsusiyyətləri də vardır. Belə mənfi xüsusiyyətlər maraqların qeyri-sabitliyi, əhvali-ruhiyyənin tez-tez dəyişməsi, yüksək qiymətləndirmə zamanı, eləcə də təriflənəndə arxayınlaşma kimi mənfi xüsusiyyətlər onların ümumi fəaliyyətinə, təlimdə müvəffəqiyyət qazanmalarına maneçilik törədir. Çox zaman belə şagirdlərdə özünüqiymətləndirmə qeyri-adekvat yüksək olsa da, arxayınçılıq, özündən razılıq onların uğur qazanmasına mane olur. Belə şagirdlərlə iş zamanı müəllimlər onların bu keyfiyyətlərini nəzarətdə saxlamalı, tez-tez müşahidə olunursa korreksiya işi aparmalı, valideynlərlə əlaqələri təmin etməli, onları da bu istiqamətdə maarifləndirməlidirlər.

Əgər şagirdlərdə xolerik tipi müəyyən olunursa, onların da özünüqiymətləndirməsində qeyri-adekvat yüksək səviyyə müşahidə edilir. Özündən çox razılıq bəzən şagirdlərin ümumi fəaliyyətinə mənfi təsir göstərir, onların prosesləri, hadisələri, həmçinin öz potensial imkanlarını düzgün təhlil edib anlamalarını çətinləşdirir. Emosional olmalarına görə xoleriklər çox zaman müəllimlərin qiymətləndirməsinə aqressiv yanaşır, eləcə də valideynlərin hər hansı bir tələbinə qarşı çıxır, onlardan əvəz çıxmağa çalışır. Bu da bəzən qəsdən tapşırıqları yerinə yetirməmək, dərsə hazır gəlməmək halları ilə müşayiət olunur. Səbirsiz, hövsələsiz olması işi axıra çatdırmalarına, işin sonunu gözləmələrinə ciddi maneçilik törədir. Lakin xolerik temperament tipli şagirdlərdə prinsipiallıq, riskə meyillilik, qətiyyətlilik kimi mühüm iradi keyfiyyətlər də müşahidə olunur. Məhz bu keyfiyyətlər sayəsində onların istedadını, müvafiq qabiliyyətlərini inkişaf etdirmək olar. Yəni iddia səviyyələri bu şagirdlərdə yüksək olur və çox zaman potensial imkanları da buna uyğun olur, sadəcə onları təlimə, ümumi fəaliyyətə düzgün yönəltmək lazımdır.

Fleqmatik temperament tipli şagirdlər ətraf aləmə, eləcə də özünün potensial imkanlarına, uğurlarına qarşı laqeyd, soyuqqanlı olurlar. Çox zaman istedad əlamətləri onlar üçün xüsusi əhəmiyyər kəsb etmir. Eyni zamanda onların uğur qazanmasına mane olan digər keyfiyyətlər tənbəllik və astagəllikdir. Belə şagirdlər öz müsbət keyfiyyətlərinə etinasız yanaşır, onlardan səmərəli istifadə etmirlər. Lakin fleqmatiklər qarşısına qoyduqları məqsədə gec də olsa çata bilirlər. Maraqları sabitdir. Təfəkkür çevikliyi zəif olsa da, məntiqli düşünə bilirlər. Onlarda hansısa istedad əlaməti olsa da, bunu nümayiş etdirə bilmirlər. Emosional göstəriciləri çox zəifdir. Problemli situasiyalarda onun həlli yollarını bildikləri halda ya ləng reaksiya verir, ya da ümumiyyətlə cavab vermirlər. Təbii ki, belə reaksiyalar çox zaman qrupla birlikdə işlədikdə müşahidə olunur. Belə şagirdlərlə iş zamanı müəllimlər onları fəallığa sövq etməli, onların potensial imkanlarının üzə çıxmasında yardımçı olmalıdırlar. Bu şagirdlər də çox zaman özünü düzgün qiymətləndirmir, iddia səviyyələri qeyri-adekvat aşağı qiymətləndirmə olur.

Melonxolik temperament tipli şagirdlərdə cəsarətsizlik, qətiyyətsizlik, utancaqlıq, qərar verə bilməmək kimi keyfiyyətlər onlara hər bir sahədə maneçilik törədir. Onlar da potensial imkanlarını düzgün qiymətləndirmir, özlərinə inamı çox

aşağı olur. “Mən bacarmaram”, “mən edə bilmərəm”, “məndə alınmayacaq” kimi fikirlər onların nitqində üstünlük təşkil edir. Belə fikirlər şüuraltına təsir edir və onların qabiliyyətinin inkişafına mane olur. Bu tipə aid olan şagirdlər çox həssas olurlar, ehtiyatla davranırlar, hər bir hadisəni diqqətlə nəzərdən keçirirlər, duyğusal olurlar. Onlarda iddia səviyyəsi çox aşağı olur, qeyri-adekvat aşağı qiymətləndirmə üstünlük təşkil edir. Hər hansı bir işin öhdəsindən gələ biləcəyi halda cəsarətsizlik göstərir, həyəcanlanır, özünü ifadə edə bilmir. Bacarıqlarından düzgün istifadə etmir. Onu maraqlandıran məsələlərə dair sual verməkdən çəkinir. Belə xüsusiyyətlər şagirdin fəallığına mane olur, xüsusi qabiliyyətlərin inkişafını ləngidir.

Aydındır ki, özünüqiymətləndirmənin həm aşağı, həm də yuxarı qeyri-adekvat səviyyələri şagirdlərin təlimə münasibətinə, ümumi fəallığına, onların psixi inkişaf səviyyələrinə mənfi təsir göstərir. Qeyri-adekvat yuxarı özünüqiymətləndirmə zamanı şagird hər hansı bir uğuruna, qabarıq keyfiyyətlərinə görə arxayınlaşır, getdikcə passivləşir, öz üzərində işləmir və tədricən yerində saymağa başlayır. Özünün çox şeyə qadir olması fikri bəzən onun istedadının inkişafına mənfi təsir göstərir.

Qeyri-adekvat aşağı özünüqiymətləndirmə zamanı isə əksinə, şagird öz gücünə inanmır, potensial imkanlarını təhlil edib qiymətləndirə bilmir, uğurlarında başqalarının əməyinin olmasını vurğulayırlar. Belə yanaşma da şagirdləri passivləşdirir, “məndə onsuz da alınmayacaq” fikri onların inkişafının qarşısını alır. İstedadın formalaşması və inkişafı üçün əlverişli şəraitlə yanaşı orqanizmin aktiv fəaliyyəti də vacibdir. Ona görə də şagirdlərin temperament tipinin öyrənilməsi, təlim prosesində nəzərə alınması və özünüqiymətləndirmənin adekvat inkişafının təmin olunması istedadlı şagirdlərin vaxtında aşkarlanmasına kömək edir.

İstedadın formalaşmasında temperament tipləri ilə yanaşı xarakterin aksentuasiyası tiplərinin də özünəməxsus rolu vardır. Xarakter tiplərinə uyğun olan bəzi xüsusiyyətlər istedadın formalaşması və inkişafına maneçilik törədir. Belə ki, gipertim tipin xüsusiyyətləri müşahidə olunan şagirdlərdə əhvali-ruhiyyə həmişə yaxşı olsa da, bu və ya digər işə çox həvəslə başlasalar da, çox zaman onu axıra çatdırmırlar. Hər bir yenilik diqqətlərini cəlb etsə də, maraqları qeyri-sabit olduğundan başladıqları işi axıra çatdırmırlar. Məhz bu keyfiyyət onların istedadının formalaşmasına maneçilik törədir. Onların başladıqları işə münasibətləri təhlil olunmalı, maraqları izlənməli, ötəri maraqlar davamlı maraqlar kimi formalaşdırılmalıdır. Çünki davamlı maraqlar xüsusi qabiliyyətlərin əsasını təşkil edir.

Tsikloid və labil tipli şagirdlərin əhvalı və fəaliyyəti kənar təsirlərlə şərtlənir. Ona görə də, belə şagirdlərin emosional sferası tənzimlənməli, düzgün ünsiyyət bacarıqları formalaşdırılmalıdır. Çünki əhvali-ruhiyyə aşağı olduqda onlar passivləşir, həyat enerjiləri tükənir, bu da ümumi fəaliyyətinə mənfi təsir göstərir, öz üzərində işləmək istəmir.

Astenonevrotik, senzitiv və psixoastenik tiplərdə həyəcan çox yüksək olur, qətiyyətli hərəkət etmirlər, tez yorulurlar, ruh düşgünlüyünə meyilli olurlar, qorxaq və cəzarətsizdirlər, utancaqdırlar, özlərində nöqsan və çatışmazlıqlar görürlər, çox zaman ehtiyat edirlər. Belə tipli şagirdlərin emosional sferalarında korreksiya işi aparmaq lazımdır. Onların yeni şəraitə adaptasi-

yası tənzimlənməli, özünə güvən hissinin formalaşdırılması ilə istedadın inkişafına şərait yaratmaq olar. Əks təqdirdə bu şagirdlərin uğur qazanması çətinləşir.

Şizoid tipli şagirdlər qaradinməzdirlər, ətrafdakılarla soyuq davranılar, bir iş olanda özlərini kənara çəkirlər, bu xarakterik əlamətə görə şagirdlər öz qabiliyyətlərini düzgün nümayiş etdirə bilmirlər, getdikcə diqqətdən kənarda qalırlar, potensial imkanları üzə çıxa bilmir.

Epileptoidlərin davranışları impulsiv xarakter daşıyır, özünü lazımi qədər idarə edə bilmir, hövsələsizdir, çılğındır, dalaşqandır. Hövsələsizliyi ciddi problemlərə yol aça bilir.

İstereoidlər şöhrətpərəstdirlər, hamının diqqətini özünə cəlb etməyə çalışır, yerli-yersiz lovğalanırlar. Deməli, bu tip şagirdlərdə qeyri-adekvat yüksək özünüqiymətləndirmə üstünlük təşkil edəcək ki, bu da onların inkişafında maneçilik törədən amillərdir.

Səbatsız tipli şagirdlər tez təsir altına düşür, gününü səmərəsiz keçirir, bu gün ilə yaşayır, gələcəyini fikirləşmir, aydın məqsədləri olmur. Belə şagirdlərin fəaliyyəti düzgün tənzimlənməli, gün rejiminə, asudə vaxtlarının səmərəli keçirilməsinə və potensial imkanlarından düzgün istifadə olunmasına diqqət artırılmalıdır.

Konform tipə aid olanların da aydın məqsədləri olmur, "hamı necə mən də elə" fikri ilə yaşayırlar. Ətrafdakılardan geri qalmamağa və onlardan fərqlənməməyə çalışırlar. Başqalarının fikirləri ilə hesablaşır, onların tələblərinə asanlıqla uyğunlaşırlar. Belə şagirdlərlə iş zamanı, ilk növbədə, onlarda özünə güvən, müstəqil düşüncə tərzi formalaşdırılmalıdır. Adətən belə şagirdlərdə akademik qabiliyyətlərlə müqayisədə digər istedad növləri formalaşa bilər. Onların bütün fəaliyyəti öyrənilməli, istedadın hər hansı bir növünün əlamətləri müşahidə olunduqda onun inkişafı şərtləndirilməlidir.

Konform tipin konform-gipertim variantı olan tiplərdə sağlam və qüvvətli olduğunu nəzərə çarpdırsa da, təşəbbüs göstərmir, passivdir, verilən tapşırıqlara və qaydalara əməl edir. Başqalarının istədiyi kimi hərəkət edir və eyni zamanda öz gələcəyinə inamlı yanaşır. Belə şagirdləri aktivləşdirmək istiqamətində müvafiq tədbirlər həyata keçirilməlidir. Gələcəyinə inamlı olmaları hər hansı bir qabiliyyətin formalaşmasına imkan yaradır.

Qarışıq tipli şagirdlərdə müxtəlif tiplərin əlamətləri qarışıq şəkildə onların davranışında özünü büruzə verir. Bu tipə aid olan şagirdlərlə əməli iş zamanı müəllimlər müvafiq çətinliklərlə qarşılaşa bilirlər (1).

Temperament və xarakter tiplərinin qeyd edilən xüsusiyyətləri şagirdlərin yaradıcı fəaliyyətinin inkişafına mənfi təsir göstərir, onlarda istedad əlamətlərinin təzahürünə maneçilik törədir. Buna görə də istedadlı şagird şəxsiyyətinin formalaşdırılması və istedadın vaxtında aşkarlanması məqsədilə onların fərdi-psixoloji xüsusiyyətləri təhlil olunmalı və təlim – tərbiyə işində nəzərə alınmalıdır.

Ümumiyyətlə, istedadlı şagirdlərin ayrı-ayrı fəaliyyət sahələrinə görə əlamət-lərinin öyrənilməsi, onların cins-yaş xüsusiyyətlərinin təhlili, eləcə də fərdi-psixoloji xüsusiyyətlərinin öyrənilməsi onların şəxsiyyətinin formalaşdırılması baxımından xüsusi əhəmiyyət kəsb edir. Bu məqsədlə həm müəllim, həm də valideynlər üçün istedadlı şagirdlərin aşkarlanması və öyrənil-məsinə dair xüsusi yaddaş blankları tərtib oluna bilər. Bu yaddaş blanklarında istedadlıları

xarakterizə edən xüsusiyyətlər öz əksini tapmalıdır. Müəllim və valideynlər uşaqları müşahidə etməklə onlarda bu keyfiyyətlərin olub-olmaması əsasında istedadı aşkarlaya bilərlər. Bir növ belə blanklar istedadlıların aşkarlanmasının psixoloji xəritəsi kimi istifadə oluna bilər. Dəqiq nəticələr əldə etmək üçün şagird şəxsiy-yətinin psixoloji, intellektual, iradi-emosional və sosial inkişafında istedadın necə təzahür etməsinə diqqət artırılmalıdır. Bu sahədə aparılan araşdırmaların nəticələri istedadlı şagirdlərin vaxtında aşkarlanması və onların şəxsiyyətinin inkişaf etdirilməsi baxımından məqsədəmüvafiqdir.

***Rəyçi: prof. H.Əlizadə***

## İstifadə edilmiş ədəbiyyat

1. Bayramov Ə., Əlizadə Ə. Psixologiya. Bakı. 2002.
2. Əlizadə Ə. İstedadlı uşaqların psixologiyası. Bakı, 2002.
3. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004.
4. Mehrabov A., Bəylərov E. Şagird intellektinin inkişafı. Bakı, 2006.
5. Bəylərov E. Uşaqlarda istedadın müəyyənləşdirilməsi və inkişaf etdirilməsi. İstedadın işçi konsepsiyası. Bakı: Təhsil, 2008.
6. Zeynalabdinova Ə. İstedadlı uşaqlarla işin təşkili. Bakı, 2007.

**Н.Джафарова**

**Учитывание персонально-психологических особенностей в формировании одаренных учащихся**

**Резюме**

В статье дается сведение о видах таланта. Характеризующие одаренных учащихся. Анализуруются факторы, влияющие на формированние личности ученика, в том числе, тиры характера и темперамента, как персонально-рсихологическая осебенность. Показывается необходимость учитывания персонально-психологических осебенностей при выявлении талантливых учеников.

**N.Jafarova**

**Consideration individual-psychological features in formation talented pupils**

**Summary**

The article informs about types of talent and features characterising talented pupils. Faktors influensing on formation pupuls personality are searched. Temperament, character types as individual-psychological features are analysed. İmportance of takinq into consideration individual-psychological features in finding out talented pupils.



# PROFESSOR YƏHYA KƏRİMOVUN TƏRBİYƏYƏ DAİR FİKİRLƏRİ

**Akif Abbasov,**
***pedaqogika üzrə elmlər doktoru, professor,***
***ARTİ-nin elmi katibi***

***Açar sözlər:*** *tərbiyə, uşaqların tərbiyəsi, tərbiyədə ailənin rolu, tərbiyədə məktəbin rolu, tərbiyədə müəllimin rolu.*

***Ключевые слова:*** *воспитание, воспитание детей, роль семьи в воспитании, роль школы в воспитании, роль учителя в воспитании.*

***Key words:*** *upbringing, upbringing of children, the role of the family in upbringing, the role of the school in upbringing, the role of the teacher in upbringing.*

Mütəfəkkirlər, bədii söz ustaları, alimlər, o cümlədən pedaqoq və psixoloqlar insanın həyatında tərbiyənin roluna yüksək qiymət vermişlər. Böyük pedaqoq və metodist alim professor, əməkdar müəllim, Prezident təqaüdçüsü Yəhya Şəfi oğlu Kərimov 90 illik həyatını zəhmətlə yaşamış, özünü gənc nəslin tərbiyəsinə həsr etmişdir. Onun müxtəlif elmi konfranslarda, müşavirə və simpoziumlardakı çıxışları və əsərləri gənc nəsil üçün istiqamətverici tövsiyə və məsləhətlər olmuşdur. O, müxtəlif jurnallarda, az qala yarım əsr baş redaktoru olduğu “Məktəbəqədər və ibtidai təhsil” jurnalında yüzlərlə elmi məqalə yazmış, yüzdən artıq kitab, kitabça, monoqrafiya, dərslik və dərs vəsaitinin müəllifi kimi tanınmış, tədris proqramları hazırlamışdır. Görkəmli alimin 10 cilddən ibarət “Seçilmiş əsərləri” buraxılmışdır. Bu kitabların yalnız səkkizinci cildində verilmiş materiallar tərbiyə məsələlərinə həsr olunmuşdur.

İlk növbədə qeyd etməliyik ki, ölkəmiz yenidən öz müstəqilliyinə qovuşduğu ilk günlərdən – hələ 1991-ci ildə Yəhya müəllim bu qənaətdə olmuşdur ki, tərbiyə işinin yeni mexanizmi yaradılmalıdır. Bu, o demək idi ki, milli tərbiyə sistemi formalaşdırılmalı, milli tərbiyənin məqsədi, vəzifələri və məzmunu müəyyənləşdirilməli və həmin istiqamətdə böyüyən nəsil arasında tərbiyə işləri həyata keçirilməlidir.

Müstəqillik qazanmış dövlətin təhsil və tərbiyə sistemi, təbii ki, köhnə stereotiplərlə yaradıla bilməzdi. Bunu nəzərə alan prof. Y.Ş. Kərimov “Azərbaycan gəncləri” qəzetinə verdiyi müsahibədə bildirirdi: “Aşkarlıq və demokratiya dövründə tərbiyə problemlərinə də yenidən yanaşmaq, onun məzmun, forma və metodlarını yeniləşdirmək, tərbiyə mexanizmini əsaslı şəkildə dəyişmək, zamanın tələbinə müvafiq kompleks tərbiyə proqramı hazırlamaq lazımdır” (3).

Professor eyni zamanda bu fikirdədir ki, bütün bunlar tez bir zamanda başa gəlməyəcək. Təlimin məzmununu, təhsilin strukturunu, hətta təlim metodlarını sürətlə təkmilləşdirmək üçün uzun vaxt və yüksək səriştəlilik lazımdır.

Yəhya müəllim yeni tərbiyə sisteminin yaradılması üçün məktəbin demok-

ratikləşdirilməsinin və humanistləşdirmənin əsas götürülməsini vacib hesab edirdi. O, məktəbin demokratikləşdirilməsinə şagirdlərin demokratik hüquqlarının təmin edilməsindən başlamağı təklif edirdi. Bu xüsusda yazırdı: “Uşaq aşağı yaşlardan müstəqil fikir söyləməyə, kollektivdə öz yerini görməyə, öz hüququnu müdafiə etməyə alışmalıdır ki, böyüyəndə müti, kölə olmasın. Əgər şagird münasibətinə, mədəni səviyyəsinə, biliyinə görə müəllimləri fərqləndirirsə, bunun nəyi pisdir? Əksinə, qoy müəllimlərin hamısı məsuliyyət hiss etsin, yaxşı olmağa, sevilməyə çalışsın” (3).

Professor uşaqların tərbiyəsində humanizmə də xüsusi dəyər verir. Görkəmli alimə görə, uşağa qayğı ilə yanaşmadan, onun şəxsiyyətinə hörmət etmədən onda yüksək insani hisslər tərbiyə etmək olmaz.

Yəhya müəllim öz əsərlərində müəllim-şagird münasibətlərinə də toxunur. Onun nöqteyi-nəzərincə, təlim prosesi bəzən şagirdə ona görə sevinc gətirmir, məcburi, əzablı əməyə çevrilir ki, müəllim-şagird münasibətləri düzgün qurulmur, işgüzar xarakter almır, əməkdaşlıq pedaqogikası özünə yer almır.

Çox zaman təhsildən söz düşəndə ilk növbədə şagirdin necə oxuması, hansı uğurlar qazanması barədə fikir yürüdülür. Onun necə tərbiyə olunduğu, başqa sözlə tərbiyəlilik səviyyəsi sanki arxa məsələyə keçir. Bu da professoru narahat edən və düşündürən məsələ kimi meydana çıxır.

Professor Yəhya Kərimovun diqqət yetirdiyi məsələlərdən biri də bəzi gənclərin əməyə, fiziki işə alışmaması, əməkdən qaçması, ailədə məktəbə, uşağa, əşyaya, obyektə baxılan kimi baxılması; məddahlıq edən, yaltaqlanan, müti şagirdlərin bəzi müəllimlər tərəfindən təriflənməsi, onların təlim müvəffəqiyyətlərinin davranışlarına, xasiyyətlərinə görə qiymətləndirilməsidir. Professorun qənaətincə, bütün bunlar xaraktercə zəif şagirdlərin simasının dəyişməsi ilə nəticələnir.

Professor uşaq və yeniyetmələrin, gənclərin tərbiyə olunmasında kütləvi informasiya vasitələrinin üzərinə düşən mühüm vəzifələrdən söz açır, onlara məsləhət görür ki, öz verilişlərinin səviyyəsini artırsınlar, tamaşaçıya müsbət təsir göstərə biləcək verilişlərə yer versinlər.

Professor Yəhya Kərimov tərbiyə işində müəllim əməyinin böyük rola malik olduğunu göstərir. Müəllimin öz yetirmələrinə nümunə olmasını, öz peşəsinin məsuliyyətini dərk etməsini məqsədəuyğun sayır. Professor yazır: “Müəllim üçün ən böyük nemət onun təmiz adı, el arasında yüksək nüfuzudur. Müəllim mənəviyyatının tapdalanması, ona azacıq şübhə gələcəyimiz olan gənc nəslə zərbədir. Müəllim mənəviyyatının təmizliyi bizim amalımızın, məsləkimizin təmizliyidir. Bu, pedaqoji kollektivin həyat şəraitindən, oradakı mənəvi iqlimdən çox asılıdır” (3).

Professor yaşından asılı olmayaraq hər bir şəxsin tərbiyəyə ehtiyacı olması fikrini dəstəkləyir, tərbiyənin sonsuzluğu ideyasını müdafiə edir. Diqqət yetirək: “İnsan qocalanda da hansı cəhətdənsə tərbiyə olunmağa məruz qalır. Tərbiyə olunmağın sonu yoxdur” (3).

Yəhya Kərimov irsində vətənpərvərlik tərbiyəsinin özünəməxsus yeri var. Professorun nöqteyi-nəzərincə, vətənpərvərlik, bəzilərinin zənn etdikləri kimi, özünü vətən haqqında çoxlu şeir bilmək, vətən sevgisinə dair təntənəli sözlər deməklə göstərmir. Vətənpərvər olmaq üçün vətəni tanımaq, onun gözəllikləri, sərvəti, var-dövləti haqqında zəngin məlumata yiyələnmək də azdır. Yalnız uğurları, nailiyyətləri ilə fəxr etmək də həmin şəxsi vətənpərvər hesab etməyə əsas vermir. İnsanın yaxşı təhsil alması, hətta istedad sahibi olması da onun vətənpərvər olmasına dəlalət etməyə bilər. Əsl vətənpərvər bütün bunlarla yanaşı vətənə məhəbbətini öz əməllərində göstərməlidir. Hər bir şəxs əmək cəbhəsində,

vətənin azadlığının qorunması uğrunda vuruşmalarda, gücü çatan sahədə təmənnasız xidmətlərinə görə başqalarından seçilir” (3).

Professor Yəhya Kərimov tərbiyədə nümunənin rolunu yüksək qiymətləndirir, təbiəti ən önəmli tərbiyə vasitəsi hesab edir, tarixi abidələrə, təbiətin qoynuna ekskursiyaları, tərbiyə işində ailənin, məktəbin və ictimaiyyətin əlbir fəaliyyətini, qarşılıqlı köməyini vacib bilir.

Professor “Seçilmiş əsərləri”nin 8-ci cildinin bölmələrindən birini “Tərbiyə işinin sahələri” adlandırmışdır. Bu bölmədə “Konstitusiya və kiçik yaşlı məktəblilər”, “Şəhid Samir Əliyev”, “İbtidai siniflərdə ana dilinin tədrisi ilə əlaqədar şagirdlərin estetik tərbiyəsi”, “Əmək tərbiyəsində formalizm” kimi müxtəlif illərdə yazdığı məqalələr toplanmışdır.

“Əmək tərbiyəsində formalizm” məqaləsində əmək təlimi və əmək tərbiyəsi sahəsində yol verilən nöqsanlar diqqət mərkəzinə gətirilir. Qeyd edilir ki, əmək tərbiyəsi məktəb islahatının ana xəttidir, amma bu gün məktəblərimizdə əmək təlimi və tərbiyəsinin qoyuluşu, mövcud proqramlar və müəllimlər üçün metodik ədəbiyyat tələbatı ödəmir. Şagird X sinfi bitirənədək 1600 saata qədər əmək təlimi və ictimai-faydalı əmək məşğələlərində, 82 gün əmək praktikasında iştirak edir. Buna baxmayaraq yenə də yeniyetmələrin bir qismində əməyə, əmək adamlarına hörmət hissi güclü deyil. Əlbəttə, bunun bir səbəbi ailə tərbiyəsində yol verilən nöqsanlarla bağlıdır. Valideyn qayğısının sərhəddi keçməsi əlini ağdan-qaraya vurmaq istəməyən gənclərin meydana gəlməsinə səbəb olmuşdur.

Bu məqalə “Azərbaycan gəncləri” qəzetinin 19 sentyabr 1987-ci il tarixli nömrəsində dərc olunmuşdur. Hazırda əmək təlimi və əmək tərbiyəsi üzrə ümumtəhsil məktəblərində sistemli və məqsədyönlü işlər aparılır. Ümumtəhsil məktəblərinin tədris planına əmək təlimi fənni əvəzinə texnologiya fənni salınıb. Lakin professorun yuxarıda əmək təlimi və əmək tərbiyəsi ilə bağlı rast gəldiyi qüsurların bəzilərinə yenə də rast gəlinir. Xüsusən şəhər yerlərində ailələrdə uşaqlar əmək həyatına lazımınca hazırlanmırlar.

Professor valideynlər arasında pedaqoji təbliğatın zəif aparıldığına diqqəti yönəldir və bunu təqdir etmir. Oxuyuruq: “Valideynlər arasında aparılan pedaqoji təbliğatın səmərəsi aşağıdır. Valideynlərin bir qismi məktəbin və müəllimin rolunu lazımınca qiymətləndirə bilmir. Bu anlaşılmazlığın nəticəsi şagirdlərin əmək tərbiyəsində daha çox nəzərə çarpır” (3).

“Seçilmiş əsərləri”nin 8-ci cildinə eyni zamanda “Təlim prosesində tərbiyə” bölməsi də daxildir. Bu bölmədə “Dərsin tərbiyələndirici gücü” və “Təlim-tərbiyə prosesində müəllim-şagird münasibətləri” məqalələri verilmişdir.

Professor müəllim-şagird münasibətlərindən danışarkən yazır: “Təlim müəllim və şagirdlərin daim kontaktda olduqları prosesdir. Bu prosesdə kimin “üstün” olması haqqında düşüncələr uzun illərdən bəri bizim təhsil sistemində demokratiya və humanizmin qarşısını almışdır. Hamı – müəllim də, valideyn də, şagirdlər də müəllimi təlim prosesinin başlıca siması, hakimi-mütləq hesab etmişlər. Bunun nəticəsidir ki, təlim obyekti sayılan şagirdə bir əşyaya, əyani vəsaitə, texniki təlim vasitəsinə baxılan kimi baxılır. Nəticədə uşaqların əksəriyyəti müti, kölə, yaltaq, ikiüzlü kimi böyüyür” (3).

Yəhya müəllim daha sonra belə bir nəticəyə gəlir: “Müəllim unudur ki, cəmiyyət özünün ən əziz, ən qiymətli sərvəti olan uşaqları, öz gələcəyini ona etibar edir” (3).

“İslam dəyərləri işığında” bölməsi “Seçilmiş əsərləri”n çox mühüm bölmə-

lərindəndir. Bu bölmənin məqsədi insanlara, o cümlədən təhsilalanlara islam dininə, dinimizin yaradıcısı həzrəti Məhəmməd peyğəmbərə, müqəddəs dini kitabımız Qurani-Kərimə rəğbət hissləri aşılamaqdan ibarətdir. Bölmədə Allah, islamiyyət, Quran, Həzrəti Məhəmməd peyğəmbər, peyğəmbərin təlimi, insan, insana məhəbbət və hörmət, yaxşı insan, insanpərvərlik, mərhəmət, pis adam, ailə, ana, ana və ataya borcumuz, atanın övladları üzərində borcu, yaxınlarımıza, qohum-əqrəbamıza borcumuz, müəllimlərimizə borcumuz, mənəvi təmizlik, ədalətlilik, vicdan, doğruluq, ibrət, güzəştə getmək, yaşlılara hörmət və qayğı, yaxşılıq, qayğıkeşlik, yaxşı münasibətlər, səxavət, nəfs, halallıq, sadəlik və s. barədə təsəvvürlər yaradılır.

Məlum olduğu kimi, ittifaqa daxil olduğumuz illərdə müstəmləkə siyasətinin təsiri altında islam dininin təbliğinə və yayılmasına imkan verilmir, dini bayramların keçirilməsi qadağan olunur, kilsələr fəaliyyət göstərdiyi hallarda məscidlərin əksəriyyəti bağlanırdı. Bütün bu məsələləri yadına salan professor yazır: “Həmin dövrdə “Elmi ateizm” (din əleyhinə elm) üzrə yüzlərlə əsər yazılmışdı. SSRİ-nin dağılması, ölkəmizin azadlıq və müstəqillik yoluna qədəm qoyması xalqımızın ideologiyasında, mənəviyyatında da dönüş yaranmasına səbəb oldu. Bu gün nəinki yaşlılar, gənclər, hətta kiçikyaşlı məktəblilər də islama maraq göstərirlər” (3).

Biz bu məqalədə pedaqogika üzrə elmlər doktoru, professor Yəhya Kərimovun tərbiyəyə aid bəzi fikirləri ilə tanış olduq. Bu barədə çox yazmaq mümkündür. İnanırıq ki, gələcəkdə, bəlkə də yaxın günlərdə professorun irsi xüsusi tədqiqatların obyektinə çevriləcəkdir.

*Rəyçi: ped.ü.elm.dok., prof. H.Əlizadə,*
*ped.ü.fəls.dok. L.Məmmədli*

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Hüquq ədəbiyyatı, 2009.
2. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. Bakı: Qanun, 2009.
3. Kərimov Y. Seçilmiş əsərləri. 10 cilddə. 8-ci cild. Bakı: Kövsər, 2012.

**А.Аббасов**

**Мысли о воспитании профессора Я.Керимова**

**Резюме**

Профессор Яхья Керимов подготовил множество образовательных программ, написал сотни научных статей, более ста книг, брошюр, монографий, учебников и учебных пособий в различных журналах, а также в журнале «Дошкольное и начальное образование», главным редактором которого является. В данных работах нашли свое отражение идеи относительно воспитания. В этой статье исследованы лишь идеи о воспитании на основе материалов данных в 8-м томе «Избранных произведений» выдающегося ученого, состоящего из 10-ти томов.

**A.Abbasov**

**Professor Yahya Karimov’s thoughts on upbringing**

**Summary**

Professor Yahya Kerimov has prepared many educational programs, has written hundreds of scientific articles, more than 100 books, brochures, monographs, textbooks and teaching aids in various journals, as well as in the journal "Preschool and Primary Education," whose editor-in-chief is. In these works, ideas on education are reflected. In this article, only ideas about education based on data in the 8th volume of "Selected Works" of an outstanding scientist consisting of 10 volumes are examined.



# NİTQ MƏDƏNİYYƏTİ İNSANLARA MƏXSUS MƏDƏNİYYƏTİN TƏRKİB HİSSƏSİDİR

**Nəsrəddin Musayev,**
***"Azərbaycan məktəbi" jurnalının baş redaktor müavini, Qabaqcıl təhsil işçisi***

Milli mədəniyyətin tərkib hissəsi olan nitq mədəniyyətinin qoruyucusu həmin mədəniyyəti təmsil edən xalqdır. Ona görə də hər bir şəxs nitq mədəniyyətinə dərindən yiyələnməlidir.

***Açar sözlər:*** *nitq mədəniyyəti, ədəbi dilin normaları, üslubiyyat, ünsiyyət, kommunikasiya vasitələri.*

***Ключевые слова:*** *культура речи, нормы литературного языка, стилистика, общение, средства коммуникации.*

***Key words:*** *speech culture, the norms of the literary language, stylistics, communication, means of communication.*

Nitq mədəniyyəti insan mədəniyyətinin tərkib hissəsidir, insanlığın əsas şərtidir. Hər bir insan cəmiyyətin əsl mənada üzvü olmaq üçün nitqə malik olmalıdır. Nitq fəaliyyəti isə tamamilə dilə əsaslanır. Dil nitqi formalaşdırdığı kimi, nitq də dili yaşadır.

Respublikamızda dil siyasətinin formalaşdırılması, Azərbaycan dilinin dövlət dili kimi tətbiqi işinin təkmilləşdirilməsi və dünyada yaşayan bütün azərbaycanlıların ünsiyyət vasitəsinə çevrilərək milli həmrəyliyin göstəricisi kimi beynəlxalq aləmdə rolu və nüfuzunun yüksəlməsi ulu öndərimiz Heydər Əliyevin adı ilə bağlıdır. Ümummilli liderin respublikamıza rəhbərlik etdiyi dövrlərdə göstərdiyi tarixi xidmətlərdən biri də dilimizin inkişafı ilə bağlıdır. 1995-ci ildə qəbul olunan Konstitusiyamızda Azərbaycan dilinin Azərbaycan Respublikasının dövlət dili kimi təsbiti, "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" və "Azərbaycan əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında" fərmanları, "Azərbaycan Respublikasında dövlət dili haqqında" qanun və dil siyasəti sahəsində normativ hüquqi aktlar bunun əyani sübutudur.

Bununla belə, Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsi, gənc nəslin ana dilinə sevgi və hörmət ruhunda tərbiyəsi, ədəbi dilin normalarından və nitq prosesində dilin üslubi imkanlarından düzgün istifadə edilməsi dövrün tələbi olaraq qalır.

"Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı"na dair tədbirlər planında ali təhsil

müəssisələrində müvafiq ixtisaslar üzrə “Nitq mədəniyyəti” fənninin tədris olunmasının təmin edilməsi məsələsi də yer alıb. Bu tələb gələcəkdə ölkəmizin elmi, mədəni, ictimai, siyasi həyatında xidmət edəcək bugünkü tələbələrin yüksək peşə hazırlığı ilə bərabər aydın, təmiz, ifadəli və məzmunlu nitqə malik olmasının çox mühüm amil olduğunu şərtləndirir. Çünki nitq mədəniyyəti insanlara məxsus ümumi mədəniyyətin tərkib hissələrindən biridir. Bu anlayışa həm danışıq mədəniyyəti, həm də yazı mədəniyyəti daxildir. Mədəni nitqə yiyələnən hər bir şəxs cəmiyyət həyatında fəal və məhsuldar iştirak etmək imkanına da malik olur.

Nitq mədəniyyəti nədir, mədəni nitqi adi nitqdən fərqləndirən xüsusiyyətlər hansılardır? Nitq mədəniyyəti tətbiqi dilçilik sahəsidir, çünki burada dilçiliyə aid nəzəri fikirlər praktik şəkildə həyata keçirilir. O həm də ədəbi dilin normalarını, üslubi imkanlarını müəyyənləşdirən təcrübi tədbirlər kompleksidir. Burada ayrı-ayrı dil faktları və ya hadisələri yox, dilçiliyin qayda-qanunları sistemi öyrənilir. Başqa cür desək, nitq mədəniyyəti istər şifahi, istərsə də yazılı ünsiyyət zamanı orfoqrafik və orfoepik qaydalara, leksik və qrammatik qayda-qanunlara, üslub normalarına, mədəni nitqə verilən əsas tələblərin şərtlərinə əməl etmək, zəngin söz ehtiyatına malik olmaq, etik normaları gözləməkdir.

Bildiyimiz kimi, dil lüğət fondu, qrammatik quruluşu, fonetik sistemi ilə təşəkkül tapmış ünsiyyət vasitəsidir. Nitq isə xalqın hər bir nümayəndəsinin bu ünsiyyət vasitəsindən fərqli istifadəsidir, ayrı-ayrı insanların danışığıdır. Dil də, nitq də ümumxalq səciyyəlidir, hər ikisi xalq mədəniyyətinin tərkib hissəsidir. Nitq dilin dinamik hissəsi olsa da, dildəki hazır modellərdən məqsədyönlü istifadə insanların dünyagörüşündən, savadından, dilə şüurlu münasibətindən, mədəniyyət səviyyəsindən asılıdır. Dil və nitq mədəniyyətinin məfhumları eyni obyektli, müxtəlif planlıdır. Nitq mədəniyyəti dilin funksional və struktur inkişafının ən yüksək mərhələsidir. Bu, geniş mənada fikir, düşüncə mədəniyyətidir. Öz düşüncəsini düzgün yazmaqla və danışmaqla ifadə edərək kamil nitqə malik olmaq mədəni nitqin əsas əlamətlərindəndir. Yüksək nitq mədəniyyəti təfəkkür mədəniyyəti ilə də sıx bağlıdır.

Dillə mədəniyyət arasındakı çox dərin bağlılığa görə dil mədəniyyətin, mədəniyyət də nitqin inkişafına xidmət edir. Mədəni davranmağı, bilik, bacarıq və vərdişlərə yiyələnməyi, düzgün təhlil və ədalətli tənqidi də mədəniyyət hesab etmək olar. Ona görə də bu termini insan fəaliyyətinin müxtəlif sahələrinə aid etmək mümkündür: milli mədəniyyət, xalq mədəniyyəti, danışıq mədəniyyəti, yazı mədəniyyəti və s.

Nitq ünsiyyəti müəyyən dilin qanunlarına uyğun olaraq həyata keçirilir. Burada biz iki anlayışla rastlaşırıq: nitq və dil. Ünsiyyətin tarixən əmələ gəlmiş, təşəkkül tapmış forması olan nitq - insanların dil vasitəsilə həyata keçirdiyi ünsiyyət prosesidir. Dil isə insanlar arasında ünsiyyət vasitəsidir. Hər iki anlayışı müxtəlif istiqamətlərdə müqayisə etmək olar. Məsələyə kəmiyyətcə yanaşsaq, dil ümumi xalqa məxsus olduğundan həcm etibarilə nitqdən çox genişdir. Nitq isə fərdi səciyyə daşıyır. Dildə mövcud olan sözlərin yalnız müəyyən qismi fərdin nitq ünsiyyəti prosesində istifadə edilir. Ünsiyyət vasitəsi olan dil dilçilik, nitq isə proses olduğu üçün psixologiya elminin obyektidir. Hər iki anlayış arasında mürəkkəb dialektik vəhdət olduğuna, hər ikisi tarixi mahiyyət daşıdığına görə bunları bir-birindən ayırmaq olmaz. Dilin əsas funksiyalarına diqqət yetirdikdə bu cəhət aydın olur: dil ictimai-tarixi təcrübənin mövcud olması, saxlanması və ötürülməsi vasitəsidir; dil kommunikasiya, eləcə də insanın

davranışını tənzim etmək vasitəsidir. Çünki hər bir kommunikasiya və ya ünsiyyət, hər şeydən əvvəl, müsahibə təsir etmək vasitəsidir. Bu təsir bilavasitə və bilvasitə həyata keçirilə bilər; dil intellektual fəaliyyətin silahıdır. Qavrayış, hafizə, təfəkkür, təxəyyül kimi idrak prosesləri insanda dil materialları ilə əldə edilən informasiyalara istinad edir. Dilin bu funksiyaları nitqin fəaliyyət istiqamətini təyin edir. Belə ki, həm nitq insanlar arasında ünsiyyətə xidmət edir, həm də təfəkkürün alətidir.

Nitqin funksiyaları isə müxtəlifdir: semantik funksiya - ideyaları, hərəkəti, vəziyyəti və s. adlandırmaq; ümumiləşdirmə funksiyası - burada müəyyən cisimlər kateqoriyasina aid əlamət və xassələr əks olunur; kommunikativ funksiya - bu, nitq davranışı kimi təzahür edir. Məhz bu fuksiyanın köməyi ilə başqaları ilə ünsiyyət saxlayır, fıkir mübadiləsi edirik, ictimai təcrübəni mənimsəyib zənginləşdirir, yeni nəslə veririk.

Azərbaycan dilinin ədəbi normalarının, hadisə, qayda və qanunlarının yüksək səviyyədə mənimsənilməsi, zəngin söz ehtiyatı, sözlərin leksik və məcazi mənalarını bilmək nitqin mədəni keyfiyyətinin artırılmasına xidmət edir. Deməli, nitqin dəqiqliyi, düzgünlüyü, ifadəliliyi, fikrin aydınlığı və məntiqiliyi, sözlərin məqsədə və məqama uyğun yerində işlədilməsi bir daha göstərir ki, nitq dilin əməli fəaliyyət formasıdır. Nitqin normativliyini şərtləndirən amillərə - orfoqrafiya və orfoepiya normalarına praktik şəkildə əməl olunması, vurğu və intonasiyanın gözlənilməsi, cümlələrin qrammatik və məntiqi cəhətdən düzgün qurulması daxildir. "Azərbaycan dili və nitq mədəniyyəti" fənnin əsas məqsədi də ədəbi dil normaları haqqında sistemli bilik verməkdən, nitq üslublarının işlədilmə səviyyəsini gözləməkdən, mədəni nitqin xüsusiyyətlərini mənimsəməkdən ibarətdir. Mədəni nitqin məziyyətlərinə: dil vahidlərinin ifadə olunan fikrin məzmununa uyğun seçilməsi, fikrin daxili məntiqi əlaqəsinin, onun komponentlərinin cümlə və abzaslar arasındakı ardıcıllığı təmin etməsi, nitqin auditoriyanın marağını ifadə etməsi, faktların inandırıcı olması, hadisələrin düzgün əks etdirilməsi, faktların təhrif olunmaması kimi vacib amilləri aid etmək olar.

Nitq mədəniyyəti ilə nitq anlayışları arasında paralellik olsa da, məzmunca bir-birindən fərqlənir. Dildə yeni söz və terminlərin yaranması xalqın mədəni inkişafı ilə əlaqədardır. Bu yolla dilin lüğət tərkibi zənginləşir. İnsanların ümumi mədəniyyətinin inkişafı hesabına ədəbi dillə danışıq dili arasında yaxınlaşma sürətlənir. Bununla da xalqın nitq mədəniyyəti səlisləşir. İnsanlar öz bilik dairəsindən asılı olaraq dildəki hazır modellərdən istifadə etməklə öz nitqini qurur.

Dillə nitqin quruluşu da eyni deyildir. Dilin quruluşu onun böyük vahidi olan cümlədə öz əksini tapır. Nitqin quruluşu isə bütövlükdə fikrin tamamlanmasını bildirən mətni əhatə edir. Deməli, dil sisteminin ən böyük vahidi nitq sisteminin ən kiçik vahidinə çevrilir. Nəzərə almaq lazımdır ki, nitqin quruluşu danışanın bilik səviyyəsi, dünyagörüşü, təcrübəsi və s. amillərlə bağlıdır. Dilin nitqə çevrilməsinin çox mürəkkəb proses kimi insanın sosial həyatla, onun fiziologiyası və psixologiyası ilə əlaqədar olduğunu nəzərə alsaq, bu qənaətə gəlmək olar ki, nitq axını bunların qaşılıqlı əlaqəsi əsasında meydana gəlir. Hər bir şəxsin dildən istifadəetmə üsulu nitq fəaliyyətini təşkil edir.

Dil və nitq anlayışları bir-biri ilə qarşılıqlı əlaqədə olub, biri-birini tamamlasa da, tətbiqolunma sahələri fərqlidir. Belə ki, hər bir dilin özünəməxsus fonemlər sistemi, lüğət tərkibi, qrammatik quruluşu, normalar sistemi var. Dil dəyişən, inkişaf edən, yeni

yaranan sözlər və terminlər hesabına zənginləşən ictimai hadisə olduğundan dil mədəniyyəti də dəyişkəndir. Dilin vəzifəsi yalnız fikir mübadiləsi aparmaq, informasiya qəbul etmək və ötürmək, ünsiyyət vasitəsi olmaqla bitmir. Dil olmasa idi, şifahi və yazılı ədəbiyyat xəzinəsi, dünyəvi əhəmiyyətə malik əsərlər yaranmaz, təbiətin sirləri hər əsrdə yenidən tədqiq olunardı. Bu xüsusiyyətinə görə dil təbiəti etibarilə bəşəri, xidməti etibarilə millidir. Fikir isə nitqlə ifadə olunur. Deməli, nitq prosesi olmasa dil, dil olmasa nitq olmaz. Nitqdə baş verən dəyişikliklər dildə də öz əksini tapır.

Nitq insanın kommunikativ fəaliyyətinin növlərindən biri, dil vasitələrindən dil kollektivinin digər üzvləri ilə ünsiyyət yaratmaq üçün istifadə edilməsidir. Nitq dedikdə həm danışıq prosesi, yəni nitq fəaliyyəti, həm də onun nəticəsi, yəni yaddaşda saxlanılmış, yaxud yazıya alınmış nitq məhsulları nəzərdə tutulur. Göründüyü kimi, buradakı birinci cümlədə və ikinci cümlənin birinci hissəsində nitqin daxil olduğu ümumi anlayışın “fəaliyyət növü”, “istifadə prosesi” olduğu bildirilir. Daha doğrusu, kommunikativ fəaliyyət özlüyündə nitq ola bilməz. Fəaliyyət insanın müəyyən işi görmək prosesi, nitq isə həmin proses nəticəsində “yaddaşda saxlanılmış, yaxud yazıya alınmış”, başqalarının qavraması üçün “istehsal olunmuş” məhsuldur. Professor Bəşir Əhmədov bununla əlaqədar qeyd etmişdir ki, nitq prosesinin müəyyən məhsulu olur (məsələn, mətn). Bu məhsulun bir-birindən ayrılmaz olan iki tərəfi vardır: 1) oradakı fikir, yəni nitqin məzmunu və 2) bu fikirin maddi qabığı, varlıq, mövcudluq üsulu, yəni forma. Deməli, bu mənada dil nitqin formasıdır, fikir isə məzmunu.

Məzmun nisbətən sabit, forma isə dəyişkən olur. Fikirin formalaşma prosesi insanların hamısında, demək olar, eyni cür baş verir, lakin eyni cür formalaşmış fikiri hərə bir cür ifadə edir. Nitqin məzmununu təşkil edən fikirlə onun forması olan dili həmişə üzvi vəhdətdə görürük. Onları yalnız beyin “laboratoriyası” birləşdirə və tərkib hissələrinə parçalaya bilir. Bu səbəbdən də dil və nitq arasında əlaqə obyektiv zərurət kimi mövcuddur, çünki dil varlığını nitqdə, nitq isə öz mənbəyini dildə tapır. Deməli, nitq prosesi olmasa dil, dil olmasa, nitq prosesi təzahür edə bilməz.

Xalqın milli mədəniyyətinin göstəricilərindən biri olan gözəl nitq üçün dilin özünün ifadə imkanlarının genişliyi, bu ifadə imkanlarından düzgün şəkildə istifadə edilməsi çox mühüm şərtdir. Bunun üçün təhsilalanlardan yüksək hazırlıq səviyyəsi tələb olunur. Bu isə tarixi təkamülün məhsulu olan dilin qayda-qanunlarını ciddi surətdə mənimsəməklə mümkündür.

Azərbaycan dili fonetik, leksik və qrammatik quruluşuna görə dünyanın inkişaf etmiş və zəngin dillərindən biri hesab olunur. Dilimiz ahəngdarlığı, axıcılığı, ifadəliliyi və zənginliyi ilə seçilir. Çox qədim zamanlarda dilimizdə şifahi xalq ədəbiyyatı nümunələri, sonralar isə yazılı ədəbiyyat yaranmışdır. İstər şifahi, istərsə də yazılı ədəbiyyatımız xalqımızın gözəl və zəngin nitq mədəniyyətinin olduğunu sübut edir.

Milli mədəniyyətin tərkib hissəsi olan nitq mədəniyyətinin qoruyucusu, daşıyıcısı xalqdır. Ona görə də hər bir şəxs nitq mədəniyyətinə dərindən yiyələnməli və onu layiqli şəkildə qorumalıdır. Bu mədəniyyəti gələcəkdə inkişaf etdirməkdə, yaymaqda bu gün ümumtəhsil məktəblərində və ali məktəblərdə təhsil alanların böyük rolunun olacağı şübhəsizdir. Buna nail olmaq üçün dilin normalar sistemini, üslubi imkanlarını, mövcud variantlardan məzmun baxımından dəqiq, üslub və situativlik cəhətdən daha uyarlı dil vahidini seçib işlədə bilmək tələb

olunur. Bu isə ali məktəblərdə nitq mədəniyyətini tədris edənlərin qarşısında çox mühüm vəzifələr qoyur. Nitq mədəniyyətinin nitqin ədəbi dil normalarına uyğunluğu, dilin ifadə vasitə və imkanlarından nitqin məqsəd və məzmununa müvafiq surətdə istifadə etmək bacarığı, dil səviyyələrinin və onlara daxil olan vahidlər sisteminin formalaşdırılması, təkmilləşdirilməsi problemlərini, dil hadisə və proseslərinin inkişaf xəttini, üslubiyyat məsələlərini araşdıran dilçilik bəhsi olduğunu nəzərə alsaq, bu fənnin ali məktəblərdə tədris olunmasının nə qədər vacib olduğu aydınlaşar.

Tarixin bütün dövrlərində nitqə, onun gözəlliyinə xüsusi diqqət yetirilmiş, böyük qiymət verilmişdir. Çünki insanın nitqi onun daxili aləmini, hiss və düşüncələrini aşkarlayan başlıca vasitədir. Adamları tanımaq, onlara bələd olmaq üçün, hər şeydən əvvəl, ünsiyyətə girmək, təmasda olmaq lazımdır. Həzrət Əlinin təbirincə desək, danışmayınca insanın ağıllı və ya ağılsız olması məlum olmur. K.S.Stanislavski demişdir: "Sadə və gözəl danışığı bacarmaq özü bir elmdir və onun xüsusi qanunları var". A.P.Çexov isə qeyd edirdi ki, gözəl danışığa etinasız yanaşan adamlar özlərini insana layiq ola biləcək ən ali, nəcib bir zövqdən məhrum edirlər. Deməli, dinləmək qabiliyyəti də danışıq qabiliyyəti qədər mühümdür. Hər iki xüsusiyyəti özündə cəmləşdirən ali məktəb tələbələrinin gələcək peşə fəaliyyətində və karyerasında çox mühüm nailiyyətlər qazanacağı şübhəsizdir. Çünki mədəni nitq, başqa sözlə, ünsiyyət mədəniyyəti insanın ziyalılığını, davranış və rəftarını, insansevərliyini göstərən, mənsub olduğu xalqın, dövlətin ləyaqət atributunu beynəlxalq aləmdə meydana çıxaran keyfiyyətdir. Ona görə də təhsil müəssisələri bu istiqamətdə məqsədyönlü, ardıcıl və sistemli iş aparmalıdır.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. Cəfərov N. Azərbaycanşünaslığın predmeti. // Azərbaycan məktəbi, 2017, №1.
2. Abdullayev N. Nitq mədəniyyətinin əsasları. Bakı: Elm və təhsil, 2013.
3. Qurbanov V., Mustafayeva L., Əsgərova D. Nitq mədəniyyətinin əsasları. Bakı: Müəllim, 2013.
4. Abdullayev A. Nitq mədəniyyəti və natiqlik sənəti. Bakı: Maarif, 1981.
5. Babayev A. Azərbaycan dili və nitq mədəniyyəti. Bakı: Elm və təhsil, 2011.
6. Qurbanov A. Ümumi dilçilik. II cild. Bakı, 2004.
7. Həsənov H. Nitq mədəniyyəti və üslubiyyatın əsasları. Bakı, 1999.
8. Xəlilov B. Azərbaycan dili. Bakı, 2013.

**Н.Мусаев**

**Культура речи - часть культуры человечества**

**Резюме**

Основателем культуры речи является народ, представляющий ту самую культуру. Поэтому каждый должен глубоко владеть культурой речи.

**N.Musayev**

**Speech culture is a part of peoples' culture**

**Summary**

The article is dedicated to the speech culture which considered as a part of peoples' culture. People are the preservers of this culture therefore, must know their culture thoroughly.



# ŞAGİRD ŞƏXSİYYƏTİNİN FORMALAŞDIRILMASINDA DƏRSİN İMKANLARINDAN İSTİFADƏ TƏCRÜBƏSİNDƏN

**Nazlı İsmayılova,**
***Qax şəhər N.Allahverdiyev adına 2 nömrəli məktəb-liseyin müəllimi***

Məqalədə müəllimin öz təcrübəsi əsasında şagird şəxsiyyətinin formalaşdırılması məsələsindən bəhs edilir.

*“Bizim hər birimiz elmi dərəcəmizdən, biliyimizdən, təhsil səviyyəmizdən asılı olmayaraq, bütün nailiyyətlərimizə görə məktəbə, müəllimə borcluyuq”.*

***Heydər Əliyev***
***Ümummilli lider***

***Açar sözlər:*** *şəxsiyyəti formalaşdırma, vətəndaş cəmiyyəti.*
***Ключевые слова:*** *формирование личности, гражданское общество.*
***Key words:*** *formation of personality, civil society.*

Cəmiyyət qarşısında duran vəzifələrin yerinə yetirilməsi hazırda xeyli dərəcədə şəxsiyyətin formalaşması prosesinin səmərəliliyindən asılıdır. Hər şeydən əvvəl, şəxsiyyətin formalaşmasına müsbət amillər təsir göstərir. Məhz bu şəraitdə tərbiyə alan şagird mövcud ictimai quruluşun məhsulu kimi dəyərləndirilir.

Hər cür gözəlliyi insan zəhməti yaradır. Ən kobud, nahamar daşlar heykəltəraşın əlində gözəl bir sənət əsərinə çevrilir. Ağır zəhmət hesabına başa gələn bu yaradıcılıq prosesinə heykəltəraş öz qəlbinin odunu və yuxusuz gecələrini verir. Biz müəllimlər də qarşımızda oturan hər bir şagirdə hələ aşkar edilməmiş xəzinə kimi yanaşmalıyıq. Bəşər tarixinə bəxş edilmiş ən böyük dahilər də öz müəllimləri tərəfindən məhz bu cür kəşf edilmişdir. İstedadı üzə çıxarmaq hələ kifayət deyildir. Onu cilalamaq və inkişaf etdirmək lazımdır. Qədim yunanlar deyirdilər ki, istedad torpaq altındakı mərmər kimidir. Onu üzə çıxartmasan, öz qiymətini ala bilməz.

Dəyəri özündə olan insan kapitalını yetişdirmək müasir məktəbin həyata keçirdiyi əsas işlərdən biridir. Bu, böyük məsuliyyətdir. Öhdələrinə düşən vəzifələri layiqincə yerinə yetirən müəllimlərimiz yüzlərlədir. O da həqiqətdir ki, bəzən istənilən nəticə əldə olunmur. Hərtərəfli inkişaf edən, yüksək mənəvi dəyərlərə malik şagirdin tərbiyəsində dayanan problemlərin kökünü həm müəllimdə, həm də əvvəlki təhsil sistemindəki çatışmazlıqlarda axtarmaq lazımdır. Son dövrlərdə təhsildə aparılan islahatlar şəxsiyyətin formalaşdırılmasında ənənəvi təlimdə müşahidə edilən nöqsanların aradan qaldırılması üçün çox iş görürdülər. Çünki təhsil sistemində yeni yanaşmalar təlim-tərbiyə prosesini daha səmərəli edir, şagirdlərdə həyati bacarıqlar formalaşdırmağa imkan yaradır, onların məntiqi, tənqidi və yaradıcı təfəkkürünü inkişaf etdirir, elmi potensiala malik, milli – mənəvi dəyərləri mənimsəyən, əxlaqi

dəyərlərə malik gənclər yetişdirməyə istiqamətləndirir. Eyni zamanda 2013-cü ildə qəbul edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da müəllimin qarşısında oxşar tələblər qoyulur. Bunlar qarşıya qoyulan tələbləri həyata keçirmək işində başlıca istiqamətlərdir. V sinifdə Azərbaycan dili dərsində "İki limon ağacı" mövzusunun tədrisi zamanı bu tələblərin necə reallaşdırıldığına toxunmaq istəyirəm.

Hər şey düzgün qoyulmuş motivasiyadan başlayır. Şagirdlərə belə bir sualla müraciət edirəm: "Bir nəfər otağınızda müəyyən müddət qalmaq istəsə, nə edərsiniz?" Onlara cavab variantları təqdim edirəm: A. Razı olardım. B. Pul qarşılığında icazə verərdim. C. Qətiyyən razılaşmazdım. D. Yalnız müəyyən müddətə qalmaq şərti ilə icazə verərdim.

Seçimlər edilir. Müzakirə təşkil olunur. Ən düzgün seçimin hansı olduğu soruşulur. Hər kəs öz seçimini müdafiə etməyə çalışır. Bu mərhələ şagirdlərin məntiqi və tənqidi təfəkkürünü, şifahi nitqini, öz fikrini əsaslandırma qabiliyyətini inkişaf etdirir. Dinləmə bacarığını, digərinin fikrinə hörmətlə yanaşmağı aşılayır. Tədqiqat sualı meydana çıxır: "Təmənnasız yaxşılıq doğru seçimdirmi?" Sonra tədqiqat mərhələsi başlayır. Mətnin oxusu həyata keçirilir. Oxu zamanı səbəb –nəticə əlaqələrinin müəyyən edilməsi istiqamətində iş aparmaq üçün cütlərə aşağıdakı formada cədvəl təqdim edilir:

| Nə etdi? | Səbəb | Nəticə |
|---|---|---|
| | | |

Şagirdlər bu suallara cavab verirlər.

Dərsin bu mərhələsi şagirdlərdə həyat hadisələrini analiz etmə qabiliyyətləri hərəkətlərinin hansı nəticələrə gətirib çıxaracağına proqnoz vermə bacarığı formalaşdırır. Oxu zamanı həm də mətndaxili suallara cavab verilir, mətn hissələrə bölünərək adlandırılır. Əsərdə müşahidə edilən yeni, anlaşıqlı olmayan sözlərin, frazeoloji birləşmələrin mənası kontekstə görə müəyyən edilir. Lüğətlə müqayisə aparılır. Oxu bitdikdən sonra cədvəllər müzakirə olunur, təbliğ olunan əsas fikir-ideya müəyyən olunur. Motivasiyada hansı şagirdlərin mövqeyinin daha düzgün, insanlıq üçün faydalı olduğu aydınlaşdırılır. Mətndə verilən məlumatlara əsasən tapşırıqlardakı yanlış fikrin təyini pedaqoji fəaliyyətimdəki əsas istiqamətlərdən biri olan tənqidi təfəkkürün inkişafına da əlverişli şərait yaradır.

S.Vurğunun bir aforizmi var: "Dünyada qalacaq yalnız yaradan". Kreativlik, yaradıcı yanaşma qabiliyyətinə malik olmaq nəinki XXI əsrin, bəşəriyyətin, hətta sonsuzadək ehtiyac duyduğu başlıca keyfiyyətlərdəndir. Məhz bu səbəbdən bütün pedaqoqlar dərs prosesi zamanı bu mərhələyə xüsusi həssaslıq, diqqət və yaradıcılıqla yanaşmalıdırlar. Bu mərhələnin təşkili daim diqqət mərkəzində saxlanılmalıdır. "İki limon ağacı" mövzusunun bu etapında qruplarla iş formasından daha səmərəli olur. Şagirdlər 4 qrupa ayrılır. Aşağıdakı işləri həyata keçirirlər:

| I qrup | II qrup | III qrup | IV qrup |
|---|---|---|---|
| Mətnin verilmiş hissəsini dialoq şəklinə salın, səhnələşdirin | Obrazları insan surətləri ilə əvəz edərək oxşar ideyalı hekayə yazın. | "Eqoizm xəstəliyinin fəsadları" adlı inşa yazın. | Quruyan limon ağacının dilindən bir məktub yazın. |

Dərs başa çatdıqdan sonra onların qəlblərində hər zaman yaxşılığa yer olacaq. Paxıllıq, eqoizm kimi hislərdən uzaq olacaqlar. Hətta dərsin əvvəlində xudbin limon ağacının mövqeyində olanlar da artıq fikirlərində yanıldıqlarını yəqin edəcəklər. Şagirdləri şəxsi fikirlərinə görə mühakimə etmək məqsədəuyğun deyildir. Lakin yanlış fikirləri doğru məcraya yönəltmək üçün dərsin bütün imkanlarından istifadə olun-

malıdır.

Çox vaxt müəllimlər ev tapşırığının verilməsi mərhələsini ya unudur, ya da ən son ana saxlayırlar. Bu, əlbəttə, yolverilməzdir. Şagirdlərin yetişməsində bu mərhələnin doğru qurulmasının böyük əhəmiyyəti vardır. Haqqında danışdığım dərsdə ev tapşırığı olaraq şagirdlərə internetdən limon bitkisi, onun tibbi baxımdan faydası haqda məruzə yazmağı, rəssamlıq qabiliyyəti olan şagirdlərə mətnə yeni şəkil çəkməyi və ya digər yapma, qurma işi etməyi, öyrəndikləri əsərlərdən oxuduqları əsərlə oxşar ideyalı olanların siyahısını hazırlamaq tapşırılır. Yuxarıda qeyd edilənlər də məktəblilərin obrazlı və məntiqi təfəkkürünün inkişafında, mühüm addımdır. Bu zaman qiymətləndirmə prosesi də diqqət mərkəzində olmalıdır. Dərslərdə qiymətləndirmənin müxtəlif növlərinə müraciət olunur. Belə dərslərdə də formativ və özünüqiymətləndirmədən istifadə olunur. Bu zaman meyarlar 4 səviyyəyə bölünür , onlar meyarlarla tanış olurlar. Qiymətləndirmənin onlara həvalə edilməsi Konsepsiyanın tələblərinə tam uyğundur. Sonra yenə də elektron lövhədə hər iki limon ağacının rəmzi şəkli nümayiş etdirilir. Şagirdlərə sual edilir: “Sizlərdən kimin limon ağaclarına münasibətində dəyişiklik olmuşdur?” Onların cavabları onların həm mövzuya, həm də öz fikirlərinə tənqidi münasibətlərini əks etdirir. Əgər kimsə fikrində israrlıdırsa, narahat olmağa dəyməz. Onlara izah olunur ki, qarşınızda hələ çox zaman var. Əlbəttə, bir dərsdə hər şeyi etmək və ya dərslərdə qarşıya qoyulan məqsədlərin hamısına nail olmaq mümkün deyildir. Ona görə daim çalışmalı, axtarışlarda olmaq lazımdır. Sənətini sevən bir müəllim də bu yolda yorulmadan çalışmalıdır.

Beləliklə, göründüyü kimi, şagird şəxsiyyətinin və onun formalaşmasına təsir edən amillərin öyrənilməsi, hər dəfə müşahidə edilərək, nəticə çıxarılması təcrübə prosesinin idarə edilməsinin mühüm şərtlərindən biridir.

Burada pedaqoji elmlər doktoru, professor Ə.Ağayevin kitabından götürülmüş aşağıdakı sətirləri yada salmaq istəyirəm: “Müstəqillik əldə edib, demokratik inkişaf yolu seçmiş xalqımızın qarşısında hazırda önəmli bir vəzifə durur: ölkədə demokratiya prinsiplərinin tam bərqərar olduğu vətəndaş cəmiyyəti yaratmaq. Bəs belə cəmiyyətdə yaşayıb işləyəcək şəxsiyyətləri necə yetişdirməli? Ümumiyyətlə, dəyişən, yeniləşən şərait şəxsiyyətin tərbiyəsi qarşısında hansı tələbləri qoyur? Bu işdə daha çox nələrə fikir verilməlidir?”.

***Rəyçi: prof. İ.Cəbrayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Seçilmiş pedaqoji əsərlər. II cild. Bakı.2013.

2. Cəbrayılov İ. Müasir ali təhsil və tələbə şəxsiyyətinin formalaşdırılmasının bəzi məsələlər.//Azərbaycan məktəbi, 2017, № 1.

3. Cəbrayılov İ. Şəxsiyyət və onun formalaşması problemi.//Azərbaycan məktəbi, 2016, № 1.

**Н.Исмаилова**

**Использованиевозможностей предмета для формировании личности у студентов**

**Резюме**

В статье говориться, о формировании личности у студентов на основе, собственного опыта учителя.

**N.Ismayilova**

**From the experience of formation student personality**

**Summary**

In the article it is spoken about the formation of student personality based on the teacher's own experience.



# ОСОБЕННОСТИ МЛАДШИХ ШКОЛЬНИКОВ С РАС И ПЕДАГОГИЧЕСКИЕ ПОДХОДЫ К ВЗАИМОДЕЙСТВИЮ С НИМИ В СРЕДНЕЙ СПЕЦИАЛЬНОЙ МУЗЫКАЛЬНОЙ ШКОЛЕ

**Наджабат Гасанова,**
***Учитель начальных классов***
***ССМШ им. Бюльбюля***

***Açar sözlər:*** *autistik spektr pozuntusu, Asperger sindromu, Asperger sindromlu uşaqlara yanaşma yolları.*

***Ключевые слова:*** *расстройство аутистического спектра, синдром Аспергера, подходы к взаимодействию с детьми СА.*

***Key words:*** *autistic spectrum disorder, Asperger's syndrome, approaches to interaction with children of the SA.*

Работая в средней специальной музыкальной школе чаще встречаем детей с очень развитыми способностями слуха, но менее выраженно развитием визуального восприятия. В практике встретились с учениками, у которых по медицинским показаниям развитие было в рамках возрастных норм. В процессе обучения выявили недостатки внимания, нарушения социальной коммуникации, социального взаимодействия. И в моем классе есть такой ученик, в первое время я не обращала внимания на все нарушения развития, так как ребенок ранее не посещал детский сад, проходил курсы подготовки к школе, занимался с педагогом индивидуально. К концу первого класса наблюдения были следующие: ребенок во время уроков нетерпелив, неусидчив, ёрзает на стуле, быстро устаёт. На уроках занимается посторонними делами. Зачастую забывает приготовиться к уроку. Не может спланировать свою деятельность. Испытывает трудности при ориентировании в тетрадях по письму и математике. Не может сосредоточиться на задании, требуется инструктаж при выполнении заданий и контроль над их выполнением. Внимание неустойчивое. Во время проведения проверочных работ торопится, некоторые задания не выполняет. Отмечается нарушение внимания. По математике считает до 20 и обратно. При решении примеров допускает ошибки. Часто не понимает смысла задач. Читает ученик выразительно, целыми словами, быстро. При списывании и письме под диктовку не допускает ошибок. Знает правописание словарных слов. Знания по окружающему миру соответ-

ствуют требованиям программы. Всегда проявляет активность на уроках окружающего мира, но ответы как правило выкрикивает с места. Мальчик эмоционально неуравновешен. В сложных ситуациях возможны импульсивность, агрессивность, которые носят защитный характер. Не умеет контролировать своё поведение, особенно это заметно на уроках физической культуры, музыки и во время перемен. Избегает зрительного контакта. На замечания учителей не реагирует. Грызет карандаш и ластик. Лезет в сумку учителей и других детей.

Вопреки всем характеристикам к концу первого и второго года не осмелилась поговорить с родителями о своих догадках. К третьему году обучения ребенок сильно отличался от своих ровесников: мелкая моторика слабо развита, в целом для ребенка характерны повышенная утомляемость, неустойчивое внимание. Имеет трудности с распознаванием социальных сигналов и этикета, испытывает тревогу в социальных ситуациях или в группе, хочет иметь друзей, однако ему не достаёт навыков для поддержания дружбы, имеет затруднения с "переключением передач" (сменой деятельности), имеет трудности с ведением переговоров со сверстниками, уязвим к травле и насмешкам, говорит быстро, многословен, обладает изощренным лексиконом, и в то же время испытывает трудности в понимании фигуральных выражений и проявляет склонность к буквальному пониманию.

После обращения родителей к психологу и психотерапевту ребенку поставили диагноз Синдром Аспергера (СА).

Синдром Аспергера — одно из пяти общихнарушений развития, характеризующееся серьёзными трудностями в социальном взаимодействии, а также ограниченным, стереотипным, повторяющимся репертуаром интересов и занятий. От детского аутизма (синдрома Каннера) он отличается прежде всего тем, что речевые и когнитивные способности в целом остаются сохранными [1].

Синдром получил название в честь австрийского психиатра и педиатра Г. Аспергера. Он в 1944 году описал детей, отличавшихся отсутствием способностей к невербальной коммуникации, ограниченной эмпатией по отношению к сверстникам и физической неловкостью. Сам Аспергер использовал термин «аутистическая психопатия».

Стоит отметить, что с предложением выделить подобные нарушения в социальном взаимодействии в отдельный синдром, выступила Л. Уинг – врач-психиатр из Англии. Данное событие произошло в 1981 году.

Синдром Аспергера относится к общим расстройствам развития или расстройствам аутистического спектра (РАС), представляющим собой психологические состояния, характеризующиеся нарушениями социального взаимодействия и коммуникации, значительно влияющими на функционирование индивидуума, а также ограниченными и повторяющимися интересами и линиями поведения [2].

Диагностическими критериями СА по Международной классификации болезней (МКБ- 10) являются:

1. Отсутствие клинически значимой общей задержки экспрессивной или рецептивной речи, или когнитивного раз-

вития. Диагнозу соответствуют:

а) своевременное речевое развитие с появлением первых слов в возрасте до 2 лет включительно и фразовой речи в возрасте до 3 лет включительно;

б) нормальный уровень интеллектуального развития, которому соответствуют навыки самообслуживания, адаптивное поведение и интерес к окружающему;

в) нормальное или недостаточное развитие моторных функций, часто отмечается двигательная неловкость (неуклюжесть);

г) изолированное одностороннее развитие специфических психологических способностей;

д) сверхценная озабоченность необычными интересами.

2. Качественные нарушения социального взаимодействия (критерии как для аутизма) (не менее двух из перечисленного):

а) невозможность адекватного контакта глазами с собеседником, несоответствие мимики, телодвижений, позы при межличностном взаимодействии;

б) трудности установления дружеских отношений со сверстниками (соответственно возрасту, несмотря на вполне достаточные возможности), что включает нахождение общих интересов, совместную деятельность и соответствие эмоций;

в) недостаток развития социально-эмоциональных взаимоотношений, или несоответствие эмоционального ответа, или недостаток гибкости поведения согласно социальному контексту, или слабое соответствие социального, эмоционального или коммуникативного поведения;

г) недостаток спонтанного стремления делиться интересами или достижениями с другими людьми (в том числе недостаток способности указывать, привлекать внимание людей к каким-либо новым интересам).

3. Необычно интенсивные, ограниченные интересы или повторяющиеся стереотипные модели поведения, интересов, монотонная активность (наличие не менее 2 пунктов из всех перечисленных):

а) охваченность одним или несколькими стереотипными и ограниченными интересами с необычной интенсивностью при отсутствии понимания природы и сути интересующих вопросов;

б) очевидное компульсивное стремление и приверженность порядку;

в) моторные особенности, стереотипные манеры, включающие определенные движения руками, пальцами, скручивания, перебирания или сложные движения тела;

г) озабоченность нефункциональными элементами предметов или игра с различными материалами (обнюхивание, поглаживание поверхности или шум, вибрация, которую они воспроизводят) [3].

Ребенок с расстройством развития, таким как синдром Аспергера, по определению отличается от остальных детей. С течением времени, родители и специалисты научились определять этот диагностический термин, который описывает очень необычный профиль способностей. Тем не менее, сам ребенок с синдромом Аспергера тоже замечает, что он или она отличается от других детей. Некоторые дети с синдромом Аспергера интернализируют свои эмоциональные реакции на

отличие от других, в то время как другие дети экстернализируют свои эмоциональные реакции [4].

Уровень интеллекта у детей не ниже среднего, а иногда даже превышает его. Тем не менее, дети не в состоянии мыслить абстрактно, не способны к самостоятельному решению задач, что перекрывает возможность свои знания применить в адекватной ситуации.

У детей с СА отмечается крайне невыразительная мимика, стереотипные жесты. Выражение лица и взгляд могут иметь строгий, пристальный, широко открытый, «сонный», «ничего не выражающий» характер. Часто у них выявляются неуклюжесть, скованность или ограниченность телодвижений. Дети с СА имеют тенденцию неправильно или необычно вести себя на протяжении беседы. Они могут находиться позади человека, с которым разговаривают, смотреть по сторонам; во время наиболее интенсивного момента беседы могут начать смотреть в окно или встать и уйти, хотя до этого момента демонстрировали заинтересованность в важном и значительном для них разговоре [5].

Для людей с СА с раннего возраста характерны затруднения в установлении эмоционально насыщенных межперсональных отношений. В связи с недостатком эмпатии дети с СА могут проявлять эгоистичность или холодность по отношению к сверстникам. Требования других детей, испытывающих дружеские чувства, дети с СА воспринимают как психологическое принуждение [6].

Ключевой чертой СА являются узкая направленность и своеобразие интересов и активности. Вследствие коммуникативных проблем формирование интересов и увлечений у таких больных остается ограниченным и не связанным с социальной активностью. По большей части суть проблемы составляют не сами интересы, а то, что ребенок или взрослый посвящает излюбленному занятию слишком много времени, не соотнося свое поведение с требованиями социальной реальности. В детстве больные СА могут обнаруживать экстраординарные способности и развить их до определенного уровня. Некоторые из таких людей достигают значительных успехов в узкой профессиональной сфере.

У детей с синдромом Аспергера могут возникать трудности с обработкой сенсорной информации как результат атипичных реакций на сенсорные раздражители (слуховые, зрительные, тактильные, запахи, вкусы и движение). Этот дисбаланс в организации сенсорного восприятия, включающий как гиперчувствительность (повышенную восприимчивость), так и гипочувствительность (сниженную восприимчивость) к различным сенсорным стимулам, может вызывать стресс и беспокойство при попытке верно оценивать окружающую обстановку. Трудности обработки сенсорной информации могут также явно снизить способность ребенка удерживать внимание. Важно отметить, что восприятие сенсорной информации может быть весьма противоречивым: один раз ребенок будет гиперчувствительным к определенным сенсорным стимулам, но в другой раз покажет нормальную или сниженную реакцию [5].

Дети с синдромом Аспергера часто могут легко отвлекаться от заданий, как из-за внутренних (повторяющиеся мысли

/ беспокойство), так и из-за внешних (сенсорными) стимулов. Например, внутренний отвлекающий стимул: ребенок видим облако в небе и начинает беспокоиться, что пойдет дождь и / или, возможно, начнется буря. Внешние стимулы: внимание к мухе, которая летает с жужжанием по комнате, а не к учителю; внимание к мерцанию флюоресцентного освещения. Отбросить не относящуюся к делу информацию может быть очень сложно, от ребенка с синдромом Аспе-регра это может потребовать сознательных усилий [7].

Выбирая себе партнеров для общения, дети предпочтение отдают не сверстникам. Их выбор – взрослый человек или ребенок младше по возрасту. Совместные игры, любая совместная деятельность со сверстниками в дошкольном возрасте часто завершается конфликтом. Дети с синдромом Аспергера стремятся установить свои правила, не могут идти на компромисс, не способны сотрудничать и действовать по чужим установкам. В итоге, коллектив дошкольников отвергает такого ребенка, он становится изолированным в группе сверстников.

Дети отличаются чрезмерной правдивостью, если им делают замечания, они очень смущаются. Подтекст социального взаимодействия детям не доступен, поэтому их слова и выражения часто оскорбительны для окружающих. В то же время ребенок не стремился кого-либо обидеть, просто он не в состоянии очертить границы дозволенного, понять, что своими эмоциями и словами пытался донести другой человек.

Что касается обучения в школе, то дети могут проявлять лень к выполнению домашних заданий, даже по тем предметам, которые их интересуют, но при этом ни один учитель не назовет такого ребенка глупым или неспособным. Иные дети, напротив, замотивированы на учебе, стремятся во всем превзойти своих одноклассников.

Для детей-аспергеров характерны страхи, которые зачастую необычны и очень навязчивы. Например, ребенок может сильно бояться ветра, дождя и пр. Опасные ситуации, которые на самом деле могут угрожать жизни ребенка не вызывают у него опасений за собственное здоровье.

Страдает также моторика и координация. Дети подолгу могут застегивать пуговицы на одежде, с трудом учатся завязывать шнурки. Этим же объясняется неровный и неаккуратный подчерк. Вероятно, возникновение проблем с осанкой и походкой, в движениях прослеживается некоторая неуклюжесть. Координация движений страдает сильнее, чем мелкая моторика.

Лечение синдрома Аспергера направлено на смягчение симптомов, снижающих качество жизни, и обучение ребёнка или взрослого тем социальным, коммуникационным и речевым навыкам, соответствующим его возрасту, которые он не смог приобрести самостоятельно. Лечение должно быть в высокой степени индивидуализировано и базироваться на мультидисциплинарной оценке [8].

По государственному образовательному стандарту начального общего образования (программа «Образование детей с ОВЗ» Азербайджанской Республики [9]) обучающихся с расстройствами аутистического спектра, обучающийся с РАС

получает начальное образование, сопоставимое с образованием здоровых сверстников, находясь в их среде и в те же календарные сроки. Он полностью включён в общий образовательный потоки по окончании школы может получить такой же документ об образовании, как и его здоровые сверстники. Осваивая Основную образовательную Программу, требования к которой установлены действующим ГОС, обучающийся с РАС имеет право на прохождение текущей, промежуточной и государственной итоговой аттестации в иных формах.

Ребенок с РАС для получения начального образования нуждается в создании условий обучения, обеспечивающих обстановку сенсорного и эмоционального комфорта (отсутствие резких перепадов настроения ровный и теплый тон голоса учителя в отношении любого ученика класса), упорядоченности и предсказуемости происходящего [8].

Работа в нашем классе была такова:

Сотрудничество: в первом классе – уход за цветами (поливал цветы), выдача и сбор тетрадей, помогает учителю в проведении физкультминуток во время уроков; во втором классе – еженедельно собирает дневники у всех учащихся класса на проверку, подает дневники на подпись классному руководителю; в конце третьего года – оценивает состояние учебников и обеспечивает передачу их в библиотеку, в четвертом классе – осуществляет лечебно-профилактические мероприятия: опрыскивания, рыхление, удаление больных растенийи т.д.

Научные исследования, клинический опыт и автобиографии подтверждают, что дети с синдромом Аспергера испытывают серьезные трудности в понимании и выражении эмоций, а также подвержены высокому риску тревожных расстройств, депрессии или проблем с управлением гневом.

Для устранения таких проблем пишем «чистосердечные письма»: Поче-му я так вел себя? Кто виноват в этой ситуации? Что такое дружба? Эти письма – эссе помогают ребенку подумать и рассуждать о данных понятиях и ситуациях.

Процесс расслабления должен успокаивать ребенка и снижать его сердцебиение. Для детей с синдромом Аспергера расслабление часто подразумевает полное одиночество. Им необходимо иметь свой уголок, где дети могут себя почувствовать в безопасности. Для этого создали «райский уголок» с разными книгами, плеером с классической музыкой, альбомом и карандашами. Во время урока при нервных срывах, приступов гнева, радости ребята могут успокоиться в этом месте.

Для социальной адаптации весь класс помогает ребенку с РАС. Естес-твенно одноклассникам не говорим о болезни. А просто ему помогаем. Кто объяснит новую тему? Помогите другу! Поделитесь с ним! Запишите ему домашнее задание (иногда дети с РАС не могут заполнять дневник).

Обязательным условием реализации программой коррекционной работы для обучающихся с РАС является систематическая специальная психолого-педагогическая поддержка коллектива учителей, родителей, детского коллектива.

***Рецензент: проф. В.Халилов***

## Литература

1. Asperger H; tr. and annot. Frith U. 'Autistic psychopathy' in childhood // Autism and Asperger syndrome / Frith U. — Cambridge University Press, 1991.

2. Мак Партлэнд, Дж. Клин, Синдром Аспергера, Clin 17 (3), 2006.

3. Международная статистическая классификация болезней и проблем, связанных со здоровьем 10-го пересмотра (ICD-10), 2010.

4. Тони Эттвуд: // Полное руководство по синдрому Аспергера для родителей и профессионалов, http://www.aspergers.ru

5. Бобров А., Сомова В. // Обозрение психиатрии и медицинской психологии 2013, № 3.

6. Bauminger N., Solomon M., Rogers S.J. Predicting Friendship Quality in Autism Spectrum Disorders and Typical Development//J Autism Dev Disord. – 2010. – V. 40.

7. Susan Stokes, "Children with Asperger's Syndrome: Characteristics/ Learning Styles and Intervention Strategies", 2002.

8. National Institute of Neurological Disorders and Stroke// Asperger syndrome fact sheet, 2007.

9. Azərbaycan Respublikasında xüsusi qayğıya ehtiyacı olan (sağlamlıq imkanları məhdud) uşaqların təhsili haqqında proqram, 2015.

**N.Həsənova**

**Autistik spektr pozuntulu kiçikyaşlı məktəblilərin xüsusiyyətləri və Orta ixtisas musiqi məktəbində onlarla əməkdaşlıq yolları**

**Xülasə**

Məqalədə Asperger sindromlu kiçikyaşlı məktəblilərin xüsusiyyətləri səciyyələndirilmiş, onlarla əməkdaşlığın məqsədəmüvafiq yanaşma yolları nümunə gətirilmişdir. İbtidai siniflərdə “çətin” uşaqlarla iş formasının qurulması, dərsin səmərəli keçməsi üçün bir sıra metodlar təklif edilmişdir.

**N.Hasanova**

**Feature primary school children with ASD, ways to cooperate with them in the secondary music school**

**Summary**

In the article is described chatacteristics of primary school children with Aspergr's syndrome. Has been proposed ways to coorparate with “difficult” children and a number of methods to make lessons effective.

# SEYİD ƏZİMİN PEDAQOJİ GÖRÜŞLƏRİ

Müəllim haqqında. Seyid Əzim Şirvaninin pedaqoji görüşlərində müəllimin vəzifəsinə xüsusi yer verilir. O, müəllimliyi fəxri və məsul bir vəzifə hesab edirdi.

Azərbaycanda elmin həqiqi əsaslarını öyrənə biləcək məktəblərə böyük ehtiyac var idi. Belə məktəblərin açılışı həqiqi müəllimlər tələb edirdi. Müəllim isə o zaman çox az və demək olar ki, yox idi.

Həqiqi müəllim qarşısında – ideallıq, prinsipiallıq, xalq işinə, əməkçilərin mənafeinə sədaqətli olmaq tələbini qoyurdu. Seyid Əzimə görə məktəb müəllimində görmək istəmədiyi əsas cəhətlərdən birisi də onun bilikcə məhdud olması idi. "Elmsiz alim" şeirində:

Elmi bir kəlmədə tamam elədin,
Çarəyi – dərdi xasü-am eylədin,
Sən təki olsa alimi-fazil
Bizi hər mətləbə edər vasil.

deyə, elmsiz alimlərə acı-acı gülür. Nadan müəllimlərdən Seyid Əzim xalq üçün heç bir mənfəət gözləmirdi. O, müasir elmin və texnikanın nailiyyətlərinə yiyələnmiş, yüksək savadlı adamlar arzu edirdi. Seyid Əzim başa düşürdü ki, bu cür nadan müəllimlər gəncləri fəlakətə, cəhalətə doğru sürükləyirlər. Seyid Əzim, müəllimin ümumi elmi hazırlığına böyük əhəmiyyət verərək tələb edirdi ki, müəllim aldığı bilikləri hər hansı bir məqsəd üçün həyata tətbiq etməyi və ictimai həyatın dəyişməsi, yaxşılaşdırılması üçün onlardan istifadə etməyi bacarmalıdır.

Seyid Əzim köhnə məktəb müəllimlərinə xas olan rəsmiyyətçiliyi, uşaqlara qayğısız və laqeyd münasibəti, tələbkarlıqla həssaslığı əlaqələndirə bilməməyi, qətiyyətsizliyi və iradə zəifliyini amansızcasına tənqid edirdi. Çünki onun fikrincə bu sifətlər qorxulu, zərərli nəticələrə, müəllim və şagird arasında narazılığa səbəb olmaqla bərabər müəllimin nüfuzunu da yerə salır. "Bir qarein fəqərəsi" şeirində Seyid Əzim bunu gözəl və parlaq boyalarla ifadə etmişdir.

Bu şeirdə təsvir olunan müəllim biliklidir. O, nəcib və tərbiyəlidir. Lakin o, təlim-tərbiyə işində müvəffəq ola bilmir. Şagirdlərin yanında hörmət və nüfuzu yoxdur. Dəqiqəbaşı onu qəzəbləndirmək və incitmək üçün şagirdlər fürsət axtarırlar. Bunun səbəbi nədir? Nə üçün belə olur? Ona görə ki, müəllim rəsmiyyətçidir. O, öz tələbini uşaqların imkan və mənafeinə uyğunlaşdıra bilmir. Müəllim onların hisslərinə və mənəviyyatına həssas yanaşmır. Onu maraqlandıran işin yalnız rəsmi və xarici cəhətidir. Uşaqlara bu cür rəsmi münasibət nəinki müəllimin özünü hörmətdən salır, dərsin təsirsiz, xeyirsiz, bəzi hallarda isə hətta zərərli olmasına, uşaqlarda riyakarlıq və ikiüzlülük tərbiyə edilməsinə də səbəb olur. Uşaq yalnız üzdən müəllimin xoşuna gəlməyə və ona yaxşı görünməyə çalışır. Əslində isə müəllimdən razı qalmadığından onun tapşırıqlarına etinasız yanaşır. Bu cür rəsmiyyətçilik, uşaqların həm öz işinə və həm də müəllimə və ətrafdakı adamlara qeyri-səmimi yanaşmalarına səbəb olur.

"Müəllim haqqında tədbir" şeirində Seyid Əzim dərs prosesindəki hər cür təlaş və hay-

küyçülüyü tənqid edir.

Şeirin axırında öz oğluna nəsihətlə bu nəticəyə gəlir; hay-küyə düşməmək, hər cür təlaşa nifrət etmək lazımdır. Çünki təlaşa düşən, ağlını, düşüncəsini itirir və özünü məhv edir. Seyid Əzim bu fikrini əsaslandırmaq üçün "İki həkim" adlı maraqlı bir misal göstərir. Bu misalda Seyid Əzim zəif iradəli, tez təlaşa düşən adamın ən zərərsiz şeirlərin təsirindən belə tez məhv ola biləcəyini, mətin, cəsur, iradəli adamın isə əksinə olaraq ən qorxulu hadisələrdən salamat çıxa biləcəyini göstərir.

Seyid Əzim buradan doğru bir nəticə çıxarır. Müəllim təlaşa düşməməli, ürəkli və rəşid olmalıdır. Yalnız belə bir müəllim cəsur şəxsiyyətlər, qorxmaz və igid vətəndaşlar tərbiyə edə bilər. Lakin şeirin mənası təkcə bununla bitmir. Seyid Əzim müəllimin bir sıra müsbət sifətlərini də qeyd edir. Müəllim savadlı, ağıllı, çalışqan, xoşrəftar olmalıdır. Adama elə gəlir ki, tərbiyə-təlim işində müvəffəqiyyət qazanmaq üçün təkcə bu sifətlər kifayət edər. Lakin Seyid Əzimi bunlar təmin etmir. Bu sifətlərə sahib olan müəllimlər də bəzən öz tələblərini həddindən artıq çoxaldıb və cəza tətbiq edərək uşaqlara rahatlıq vermirlər. Uşaq zehninin hələ kifayət qədər təkmilləşmədiyini, uşaq təbiətinin oyuna və əyləncəyə mail olduğunu başa düşmürlər. Uşaqlara düzgün yanaşmadıqda, uşaq psixologiyasının xüsusiyyətini nəzərdən qaçırdıqda müəllimin hətta xeyirxah nailiyyətləri şagirdlər tərəfindən çox pis qarşılanır. Belə hallarda Seyid Əzimin göstərdiyi kimi, şagirdlər yalnız xarici cəhətdən özlərini məktəbin daxili intizamına uyğunlaşdırmağa çalışırlar.

Uşaqlara düzgün yanaşmadıqda, müəllim öz həyatını böyük qorxu altına ala bilər. Bunu aradan qaldırmaq üçün müəllim gənc nəslin tərbiyəsi ilə bilavasitə, yaxud bilavasitə əlaqədar olan elmləri mükəmməl bilməlidir. O, pedaqogikanı, psixologiyanı və başqa elmləri dərindən bilməli, uşaqları hərtərəfli öyrənməli, onlara həssas və qayğılı yanaşmalıdır.

Seyid Əzimin müəllimə olan tələblərindən çıxan nəticələr belədir:

Seyid Əzim müəllimin öz sözündə və işində ardıcıl olmamasını, onun sözü ilə işi arasındakı uçurum və uyğunsuzluğu şiddətli tənqid edir. O, müəllimdən ciddi ardıcıllıq, sözlə işin vəhdətini tələb edir. Köhnə məktəbdə hamıya örnək ola biləcək belə bir müəllimin olmadığını da Seyid Əzim yaxşı bilirdi. Ona görə də, köhnə müəllimlərdən istifadə etmək imkanından heç zaman imtina etmirdi. Lakin bununla belə o, hiss edirdi ki, bu cür müəllimlər heç vaxt xalqın ləyaqətli dostu, gənc nəslin etibarlı tərbiyəçisi ola bilməz. Bu fikir "Fəqih və oğlu" şeirində gözəl ifadə edilmişdir. Ata ilə oğul arasında söhbət gedir. Oğul gənc nəslin, ata isə köhnə nəslin nümayəndəsidir. Söhbət başlıca olaraq gənc nəsli gur tərbiyələməli olan və xalq kütlələrinin inkişafına rəhbərlik etməli olan ziyalı və üləmaların rəftar və əxlaqı haqqında gedir. Fəqihin oğlu eyni nəslin nümayəndəsi kimi bu cür adamların zərərli təsirlərinin, sözləri ilə işləri arasındakı uyğunsuzluğu hiss etdiyindən onların gənc nəsli tərbiyə etməyə layiq olmadıqlarını söyləyir. Atası da bu üləmaların qüsurunu görür, lakin oğluna hər halda həddi aşmama-

ğı məsləhət görür, bu üləmaların qüsurlarına baxmayaraq onlardan yenə istifadə etmək lazım gəldiyini söyləyir. Seyid Əzimə görə yaxşı sözü kim deyirsə desin onu eşitmək, qəbul etmək, yerinə yetirmək lazımdır. Yaxşı söz dedikdə o, məhz elmi və biliyi nəzərdə tuturdu. Üləma, yaxud müəllimin elm, maarif haqqında söylədiyi sözün böyük ictimai əhəmiyyəti olduğundan onun kim tərəfindən söylənilməsinə, söz sahibinin şəxsi əxlaq və rəftarına baxmadan qəbul etmək lazımdır. Çünki köhnə məktəbdə başdan – ayağa müsbət sifətlərə malik olan bir üləma, yaxud müəllim tapmaq çətindir. Burada bir şeyi də qeyd etmək lazımdır ki, Seyid Əzim bunu söyləyərkən onu qanun şəklinə salmayır. Onu bir prinsip kimi qəbul etmirdi. Əksinə o, gəncləri həmişə köhnə məktəb müəllimlərinin onlara verdikləri biliklərə tənqidi yanaşmağa çağırırdı. Seyid Əzim göstərir ki, əgər nəsihət verənin sözü ilə işi arasında uyğunluq olmasa, o, öz hərəkət və rəftarı ilə bu vəhdətin gözəl nümunəsini göstərmirsə, onun dediyi sözlərin heç bir təsiri olmaz.

Söz və işin vəhdətini Seyid Əzim hər bir müəllimdən tələb edirdi. Müəllim xudbin olmamalı, təkcə öz şəxsi mənafeini güdməməlidir. Müəllim ictimaiyyətçi olmalı, ictimai mənafei hər şeydən üstün tutmalıdır. Seyid Əzimin müəllim və onun sifətləri haqqında söylədiklərindən çıxan ikinci nəticə belədir.

Seyid Əzim müəllimlərdən, habelə təbiət və cəmiyyət hadisələrinə elmi surətlə yanaşmağı, onları elmi əsaslarla izah etməyi tələb edirdi. O, dərin elmi görüşlərə malik olan müəllimlərə (M.F.Axundov, Həsən bəy Zərdabi və başqalarına) o zamankı cəmiyyətdə hörmət edilmədiyindən qəzəblənirdi.

Seyid Əzim yaşadığı dövrlə barışa bilmir. O, heç bir tənə, lənət və hədədən qorxmadan köhnə aləmə qarşı ayağa qalxıb, bütün müəllimləri də bu aləmə qarşı üsyana çağırırdı.

Seyid Əzim həqiqi və ləyaqətli müəllimin idealını Həsən bəy Zərdabinin simasında görürdü. O, Həsən bəy Zərdabini həmişə “Əmiri-alişan”, “Elmi-hikmətdə saniyi-loğman”, “Sərvəri-bülənd məqam” – deyə adlandırırdı. Seyid Əzim bu təriflərin hamısında haqlı idi. O, qabaqcıl ideal müəllimin obrazını dedikcə doğru qiymətləndirmişdir.

Həsən bəy Zərdabi Azərbaycanın Piestalotsi, Disterverqi olmuşdur. O, yüksək savadlı, geniş universal biliyə malik təbiyyatçı darvinist idi. O, fəlsəfə, tarix, dil, ədəbiyyat, incəsənət sahəsində də dərin biliyə malik idi. Həsən bəy Zərdabi hər şeydən qabaq görkəmli bir jurnalist və həqiqi demokrat idi. Böyük humanist, əməkçi insanlığın halına qəlbən acıyan, vətənini, xalqını dərindən sevən Həsən bəy Zərdabi, həyatının axırına qədər xalqının mənafei və sədaqəti uğrunda fədakarcasına mübarizə aparmışdır. O, namuslu, həssas, gözəl təşkilatçı, aqitator və misilsiz ictimaiyyətçi idi. Buna görədir ki, Seyid Əzim Həsən bəy Zərdabini əsl ləyaqətli xalq müəllimi kimi qiymətləndirirdi. Budur, Şirvanda yeni tipli məktəbin açılması münasibətilə yazdığı “Həsən bəyin hüzuruna” şeirində deyilir:

“Dedilər: neylirik biz uşkolanı,
Hərnə iş ilə olsa ol dolanı,
Nə üçün biz verək bu barədə pul,
Bizə bundan nə xeyir olur məhsul.
Neylər əhvalımıza bizim rusi?

Neylirik biz o dərsi-məşhusi?
Hər uşaq getsə o dəbistanə,
Olacaq dindən o biganə.
Xud tutaq hamımız dəxi bişək
Oxuyub olmuşuq Həsənbəytək.
Bixəbər məzhəbü şəriətdən
Bisəmər qüsldən, təharətdən".

Seyid Əzim köhnə müəllimə xas olan mənfi cəhətləri tənqid edir. O, hər cəhətdən, istər bilik, dünyagörüşü, istərsə əxlaq cəhətindən başqalarına örnək ola biləcək müəllimin sifətlərini qeyd edir. Gənc nəsildən müəllimə hörmət etməyi, ona səmimiyyətlə yanaşmağı tələb edir. "Elm" adlı şeirində öz oğlu simasında bütün gənc nəslə müraciət edərək deyir:

Cəfər, ey nuri-dideyn-Seyyid!
Qönçeyi-növrəsidəyn Seyyid.
Üləma haqqında riayət qıl
Əhli-elmə həmişə hörmət qıl,
Demə bu kafər, ol müsəlmandır,
Hər kimin elmi var o insandır.

Qayğıkeş, ağıllı atanın və təcrübəli bir müəllimin bu öyüdü, hal-hazırda müəllimlərə hörmət etmək haqqında şagirdlər qarşısına qoyduğumuz tələblərə çox yaxındır. Seyid Əzim:

Sənə hər kimsə elm edər təlim,
Ona vacibdir eyləmək təzim,
Harda gördün ona salam söylə
Baş əyib qultək ehtiram eylə! -

dedikdə, bəzilərinə təəccüblü gələ bilər. Guya o, köhnə məktəbin qayda və qanununu müdafiə edir. Belə düşünmək, əlbəttə, doğru deyildir. Bu, Seyid Əzimə məxsus olan xüsusi öyüd tərzidir. O, gənclərdən ağıllı olmağı, öz işinə düşüncəli və tənqidi surətdə yanaşmağı tələb edir. Seyid Əzim başa düşürdü ki, şagird və müəllim bir-birini anlamazsa və bir-birinə hörmət etməzsə, təlim-tərbiyə prosesinin heç bir müsbət nəticəsi ola bilməz.

Seyid Əzimin müəllim haqqındakı olan fikirlərini bu cür xülasə etmək olar:

1. Gənc nəslin təhsil və tərbiyəsində müəllim yüksək və fəxri yer tutmalıdır.

2. Sinfi cəmiyyətdə müəllim müəyyən sinfin, daha doğrusu hakim sinfin ideyasını ifadə edir.

3. Köhnə müəllimlər gəncləri yeni ruhda tərbiyə etməyə qadir deyildilər. Seyid Əzim müəllimin mənfi xüsusiyyətlərini amansızcasına tənqid edir və bir sıra gözəl, parlaq misallarla onun rəsmiyyətçiliyini və xalq kütlələrindən ayrı düşdüyünü göstərir.

4. O, müəllimdən: a) ideyallılıq, prinsipiallıq, xalqa-əməkçi kütlələrə sədaqət, b) geniş bilik, bacarıq, yüksək savad, müasir elmin bütün nailiyyətlərinə yiyələnmək, v) fanatizmlə mübarizə, q) sözlə iş, fikirlə hərəkət vəhdəti, ardıcıllıq, ğ) həssaslıq və qayğıkeşlik tələb edirdi.

Seyid Əzimin müəllim haqqında fikirlərinin qısa xülasəsi belədir.

**Əhməd Seyidov,**
***pedaqoji elmləri doktoru, professor***

**"Azərbaycan məktəbi" jurnalı,**
**1 9 4 3, № 2**



# AZƏRBAYCANDA PEDAQOJİ FİKRİN İNKİŞAFINDA "AZƏRBAYCAN MƏKTƏBİ" JURNALINA ƏLAVƏLƏRİN ROLU

**Elnarə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin***
***elmlər doktoru hazırlığı üzrə dissertantı***

Azərbaycanın aparıcı pedaqoji jurnalı olan "Azərbaycan məktəbi"nin əlavələri XX əsrin ikinci yarısından nəşr olunmağa başlamışdır. 8 metodiki məcmuədən: "Azərbaycan dili və ədəbiyyat tədrisi", "Fizika və riyaziyyat tədrisi", "Kimya və biologiya tədrisi", "Tarix, ictimaiyyat və coğrafiya tədrisi", "Əmək və politexnik təlim", "İbtidai məktəb və məktəbəqədər tərbiyə", "Məktəbdə bədən tərbiyəsi", həmçinin "Русский язык и литература азербайджанский школа" məcmuəsindən ibarət olan bu əlavələr Azərbaycanda pedaqoji fikrin inkişafında mühüm rol oynamışdır. Bu əlavələrdə çap olunan tanınmış pedaqoqların, alimlərin və metodistlərin məqalələri fənlərin tədrisinin təkmilləşdirilməsinə yaxından kömək etmişdir.

Bu metodik məcmuələrin nəşri 1991-ci ilə qədər davam etmişdir.

***Açar sözlər:*** *jurnalın əlavələri, pedaqoji mətbuat, metodik məcmuə, pedaqoji fikir, nəzəri məsələlər, metodika elmi, təlim üsulları.*

***Ключевые слова:*** *дополнение к журналу, педагогическая пресса, методический сборник, педагогический мысл, теоретические вопросы, методическая наука, методы обучения.*

***Key words:*** *appendices to the journal, pedagogical press, pedagogical thoughts, theoretical issues, methods, teaching techniques.*

"Azərbaycan məktəbi" jurnalına 1954-cü ildən başlayaraq əlavə kimi çap olunmağa başlayan metodik məcmuələr məktəb təhsilinin elmi-nəzəri, pedaqoji-metodiki cəhətdən təkmilləşdirilməsində, onun inkişaf yollarının işıqlandırılmasında əsaslı rol oynamış, pedaqoji fikrin inkişafında, pedaqoji-nəzəriyyə və təcrübənin öyrənilib yayılmasında təhsil işçilərinə ən yaxın köməkçi olmuşdur. Jurnalın ətrafına pedaqogika və psixologiya sahəsində çalışan alimlər, qabaqcıl müəllimlər toplanmışdır.

"Mübahisəsiz demək olar ki, respublikada məktəb təhsilinin elmi-pedaqoji, ideya-siyasi, təşkilati cəhətlərdən və s. tərəqqi tarixi jurnalın səhifələrində əks olunmaqdadır. Jurnal məktəb və ümumiyyətlə, maarif haqqında qərarları müəllimlərə, maarif işçilərinə çatdırmaqda, bu qərarların həyata keçirilməsi yollarının işıqlandırılmasında, hamılıqla ibtidai icbari təhsildən başlamış, hamılıqla orta təhsilin həyata keçirilməsinədək lazım olan problemlərin şərhində, məktəblərimizin müxtəlif tərəqqi mərhələ-

lərində təlim-tərbiyə işlərinin məzmunca yeniləşdirilib təkmilləşdirilməsində, yeni proqram və dərs kitablarının, yeni təlim-tərbiyə forma və üsullarının şərhində, qabaqcıl pedaqoji təcrübənin yayılmasında, müəllim hazırlığında və təkmilləşdirilməsində və s. əlindən gələni əsirgəməmişdir" (M.Mehdizadə).

Əlavələr çap olunana qədər "Azərbaycan məktəbi"ndə elmi-nəzəri və pedaqoji problemlərlə yanaşı metodik məsələlərin qoyuluşuna da toxunulur və ayrı-ayrı fənlərin tədrisinə bu səpkidəki yazılarla kömək göstərilirdi. Jurnalda əsas diqqət fundamental nəzəri problemlərin qoyuluşu və həllinə yönəldiyindən ayrı-ayrı fənlərə dair geniş məsləhət və tövsiyələr üçün onun həcmi darlıq edirdi. Ona görə də jurnalda əlavə kimi metodik məcmuələrin nəşrinə ciddi zərurət duyulurdu. Yalnız bu yolla metodika elmi sahəsində əldə edilmiş təcrübənin ümumiləşdirilməsinə kömək etmək olardı.

Müharibədən sonra ölkəmizdə pedaqogika, psixologiya üzrə tədqiqatlar genişləndirilmiş, təlim üsulları, fənlərin tədrisinin elmi əsaslar üzrə qurulması məsələləri pedaqogika elminin tədqiqat obyekti olmuşdur. Aydındır ki, bütün bunlar ancaq mətbuat vasitəsi ilə məktəblərə çatdırıla bilərdi. 20-40-cı illərdə nəşr olunan bir sıra metodiki vəsaitlərin dövrü isə artıq keçmişdi. "Azərbaycan məktəbi" jurnalının təsir dairəsi ildən-ilə genişlənir, həcmi çoxalır, imkanları artır, daha çox şaxələnirdi. O vaxtadək müxtəlif pedaqoji mətbuat orqanları fənlərin tədrisi metodikasına aid nəzəri materiallara geniş yer versələr də, dövrün tələbatı daha irimiqyaslı tədbirləri gözləyirdi. Bunu isə yalnız bir jurnal ödəyə bilməzdi. Müəllimlərə metodik cəhətdən konkret kömək etmək məqsədilə hər fənnə aid xüsusi metodiki məcmuələrin buraxılması daha məqsədəuyğun sayılırdı. Çox böyük yazışmalardan, müzakirələrdən sonra "Azərbaycan məktəbi" jurnalına əlavə olaraq fənlər üzrə məcmuələrin nəşr edilməsinə tədricən razılıq verildi.

Nəticə etibarilə təhsil tariximizdə "Azərbaycan məktəbi"nin 8 əlavəsi fəaliyyət göstərmişdir. Sovet rejiminin tələbinə uyğun olaraq ilk dəfə hakim dilin taleyini düşünmək lazım gəlmişdi və 1947-ci ildə «Русский язык в нерусской школе» məcmuəsinin ilk nömrəsi çap olunmuşdu. 1970-ci ildən «Русский язык и литература в азербайджанской школе» adlanan məcmuə 1979-cu ildən müstəqil jurnala çevrildi. "Azərbaycan məktəbi"nin digər əlavələri isə müxtəlif müddətlərdə fəaliyyət göstərmişdir. 1954-cü ildən "Azərbaycan dili və ədəbiyyat tədrisi" (redaktorları Əzəl Dəmirçizadə, Ağamməd Abdullayev, Əziz Əfəndizadə) və "Fizika və riyaziyyat tədrisi" (redaktorları Abbasqulu Abbaszadə, Zahid Qaralov), 1956-cı ildən "Kimya və biologiya tədrisi" (redaktorları Rəcəb Əliyev, Əyyub İmaməliyev), 1958-ci ildən "Əmək və politexnik təlim" (redaktoru Abbasqulu Abbaszadə), 1964-cü ildən "Tarix, ictimaiyyat və coğrafiya tədrisi" (redaktorları Nizaməddin Allahverdiyev, Məzahir Quliyev), 1970-ci ildən "İbtidai məktəb və məktəbəqədər tərbiyə" (redaktoru Yəhya Kərimov), 1976-cı ildən "Məktəbdə bədən tərbiyəsi" (redaktoru Tahir Əliyev, Baloğlan Quliyev) məcmuələri nəşr olunmuşdur.

Bu məcmuələrdə fənlərin tədrisi ilə əlaqədar metodik problemlər şərh edilir, proqram materiallarının toplanması, didaktik çalışmalar, rəhbər metodik göstərişlər,

qabaqcıl müəllimlərin iş təcrübəsi və s. çap olunurdu.

Onu da qeyd etmək lazımdır ki, “Azərbaycan məktəbi”nə əlavələrin nəşri bütün keçmiş SSRİ üzrə maraqlı təcrübə idi. Artıq ana jurnal bütün fənlərə dair daxil olan məqalələrin qarşısında tab gətirə bilmirdi. Ona görə də əlavələrin nəşri mahiyyətcə günün tələbinə çevrilmişdi.

Qeyd etmək lazımdır ki, müttəfiq respublikalar arasında ilk dəfə olaraq belə bir təcrübə ittifaqda birinci idi.

Ötən əsrin 50-90-cı illəri “Azərbaycan məktəbi”nə əlavələrin ən məhsuldar dövrü olmuşdur. Bu metodik məcmuələr respublikada pedaqoji fikrin inkişaf spektrlərini genişləndirməklə yanaşı yeni yaranmağa başlayan bir elm sahəsi kimi fənlərin tədrisi metodikasının inkişafına təkan verdi. “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsi az müddətdə xüsusi metodikalar üzrə yeni ideyaların əsas daşıyıcılarından birinə çevrildi. Bu metodik məcmuənin nəşri və yayılması pedaqoji mətbuatımızı zənginləşdirdi, metodik işlərin əhatə dairəsinin genişlənməsinə şərait yaratdı və tezliklə respublikada bu sahədə böyük canlanma hiss olundu, ən yaxşı müəllimlərin zəngin iş təcrübəsi sistemli şəkildə öyrənilməyə və yayılmağa başladı. Bu sahədə qazanılmış təcrübə digər fənlər üzrə metodik məcmuələrin yaradılmasını da reallaşdırdı. Zaman keçdikcə zəngin təcrübə toplayan bu məcmuədə onlarla dəyərli məqalələr dərc olundu. Bütün bunlar isə metodik orqanların fəaliyyətinin tənzimləndirilməsi üçün şərait yaratdı. Tezliklə Azərbaycan dili və ədəbiyyat üzrə yeni metodistlər üzə çıxdı. Bakıda və rayonlarda yeni müəlliflər dəstəsi yetişdi.

“Azərbaycan məktəbi” jurnalına əlavələr (“Русский язык и литература в азербайджанской школе” – ayda bir dəfə; “Tarix, ictimaiyyat, coğrafiya tədrisi” və “İbtidai məktəb və məktəbəqədər tərbiyə” – iki ayda bir dəfə; “Azərbaycan dili və ədəbiyyat tədrisi”, “Fizika və riyaziyyat tədrisi”, “Kimya və biologiya tədrisi” və “Əmək və politexnik təlim” – üç ayda bir dəfə buraxılırdı) fənlərin tədrisi metodikasına aid məqalələr çap edir, proqram materiallarını planlaşdıraraq müəllimlərə çatdırır, təhsilin məzmunundakı bütün yenilikləri aydınlaşdırır, fənn müəllimlərinin təlim fəaliyyətinə bir növ rəhbərlik edirdilər. Təkcə “İbtidai məktəb və məktəbəqədər tərbiyə” məcmuəsinin 22000-ə yaxın abunəçisi var idi, bu fakt nəşr edilən metodik məcmuələrdən müəllimlərin səmərəli istifadə etdiklərinə, təlimin təkmilləşdirilməsi üçün faydalı mənbə kimi faydalandıqlarına parlaq sübutdur.

“Azərbaycan məktəbi” jurnalının baş redaktoru və yaradıcı heyəti, məcmuələrin ixtisas redaktorları təlim-tədris işinin təkmilləşdirilməsinə kömək məqsədi ilə müxtəlif elmi-pedaqoji, jurnalistik üsullardan istifadə edirdilər. Məcmuələrdə ayrı-ayrı mövzuların tədrisi təcrübəsi, didaktik materiallar, əyanilikdən müasir şəraitdə istifadə edilməsi yolları, proqram materiallarının planlaşdırılması, müxtəlif metodik məsləhətlər və digər təlim işinin təkmilləşdirilməsinə kömək edən materiallar müntəzəm çap edilirdi. Qabaqcıl müəllimlər metodik məcmuələrin daimi oxucusu və məqalə müəllifləri kimi fəaliyyət göstərirdilər.

“Azərbaycan məktəbi”nin əlavələrinin çap olunması pedaqoji mətbuatın əhatə dairəsinin genişləndirilməsinə rəvac verdi. “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsinin nəşri “Azərbaycan məktəbi” jurnalının ən şaxəli, ən bəhrəli budaqlarından biri kimi çox uğurlu oldu. Bu metodik məcmuənin ilk redaktoru Azərbaycan SSR Elmlər Akademiyasının müxbir üzvü, pro-

fessor Ə.Dəmirçizadəni 1955-ci ildən metodist alim Mirabbas Aslanov əvəz etdi. 1959-cu ildən 1975-ci ilədək bu vəzifəni pedaqoji elmlər doktoru, professor A.Abdullayev öz öhdəsinə götürdü və o, bu məcmuəyə 15 ildən artıq bir müddətdə başçılıq etdi. A.Abdullayev məcmuəyə yeni-yeni çalarlar gətirdi. Məqalələrdə pedaqoji meyillər gücləndirildi.

İlk illərdə beş min nüsxə tirajla yayılan məcmuənin həcmi ildən-ilə çoxalırdı. Sonrakı fəaliyyətində də metodik dairəsinə görə "Azərbaycan dili və ədəbiyyat tədrisi" həmişə başqa məcmuələrə örnək olmuşdur. Bu məcmuədə yalnız ümumtəhsil məktəblərində ana dili və ədəbiyyatın tədrisi məsələlərindən deyil, həm də təlimi rus dilində olan məktəblərdə Azərbaycan dilinin tədrisi, axşam məktəblərində qısaldılmış proqramla tədris olunan Azərbaycan dili və ədəbiyyatın tədrisinə dair materiallar dərc edilirdi. "İbtidai məktəb və məktəbəqədər tərbiyə" məcmuəsinin nəşrinədək ibtidai siniflərdə ana dilinin tədrisi məsələləri də onun üzərinə düşürdü. Bir qədər keçəndən sonra ali məktəbdə Azərbaycan dili və ədəbiyyat tədrisi məsələləri də məcmuəyə yol açdı. Az sonra ildən-ilə şəbəkəsi genişləndirilən texniki peşə məktəbləri də onlara qoşuldu. Məcmuə öz məsuliyyətini yaxşı dərk edirdi. Artıq məcmuədə xalq maarifi qarşısında qoyulan vəzifələrlə yanaşı müasir dərsə verilən tələblər, yeni pedaqoji tələblərə, qabaqcıl təcrübəyə dair məqalələrin də sayı və sanbalı artırdı. Yüksək ixtisaslı elmi pedaqoji kadrlar, metodist alimlər məhz məcmuədə gedən məqalələrlə ictimaiyyət arasında tanınırdılar. Respublikanın qabaqcıl müəllimləri də tez-tez məqalə dərc etdirirdilər. Artıq 60-cı illərdə bəzi kənd müəllimləri, o cümlədən N.Hümbətov (Şəki), Ə.İbrahimov (Kürdəmir), M.Kazımov (Lerik), M.Abdullayev (Qax), C.Məmmədov (Şirvan) və b. məcmuənin daimi müəlliflərinə çevrildilər.

Məcmuə gənc alimlərin yetişməsində də onlara yardımçı oldu. Onun səhifələrində respublikamızın, demək olar ki, bütün metodist alimləri çıxış etmək imkanı tapmışdılar. Azərbaycan dili və ədəbiyyat tədrisi metodikası sahəsində çalışan tədqiqatçılarımızın hər birinin öz sözü, öz nəfəsi duyulurdu. Onun səhifələrində metodist alimlərlə yanaşı, bir sıra psixoloq, didakt, dilçi, ədəbiyyatşünas və filosofun da məqalələri dərc olunmuşdur. Respublikamızda redaksiya tərəfindən tez-tez oxucu görüşləri keçirilir, müsahibələr aparılır, anket sorğuları təşkil olunurdu. "Suallara cavab" rubrikasını oxucular səbirsizliklə gözləyirdilər. "Konsultasiya" başlığı ilə verilən yazılar bir sıra mətləblərə aydınlıq gətirirdi. 1976-cı ildən sonra məcmuədə "Nitq mədəniyyəti məsələləri", "Metodik irsimizdən", "Xronika", "Bizim iş yoldaşlarımız" rubrikaları da açıldı.

Məcmuə Azərbaycan dili və ədəbiyyat tədrisinin ən aktual problemlərinə, ayrı-ayrı mövzuların tədrisi metodikasının təkmilləşdirilməsi, təlim prosesinin keyfiyyətinin yüksəldilməsi, təlim prosesinin tərbiyə və şagirdlərin inkişafı ilə əlaqələndirilməsi sahəsində çox iş görmüşdür. Onu da qeyd etmək lazımdır ki, Azərbaycan dili və ədəbiyyat müəllimlərimizin didaktik materiallara olan ehtiyacını ilk dəfə bu məcmuə təmin etmişdir. Müəllimlərə lazım olan bəzi zəruri materialları da (imla, ifadə mətnləri və s.) onlar ancaq bu məcmuədən götürürdülər.

İllər keçdikcə Azərbaycan dili, ədəbiyyat dərsliklərinin müasir tələblər səviyyəsində qurulmasına, sinifdənxaric işlər aparılmasına dair kəsərli və sanballı məqalələrin də sayı artırdı. Beləliklə, məcmuə müəllimlərin nəzəri biliklərlə zənginləşdirilməsinə, onların qabaqcıl iş təcrübəsinin yayılmasına da ardıcıl diqqət yetirirdi. Bütün fəaliyyəti

boyu “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsi oxucuların böyük rəğbətini qazanmışdır.

“Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsinin müəllimlərə bilavasitə əməli kömək göstərməsi dəyərləndirilməlidir. İftixarla qeyd etməliyik ki, didaktik materiallara olan böyük ehtiyac da müəllimlərə ilk dəfə məhz bu məcmuə vasitəsilə çatdırılmışdır. Orta məktəbin bütün sinifləri üçün imla və daha sonra ifadə mətnləri, əyani vəsait nümunələri, yoxlama materialları və s. ilk dəfə olaraq bu məcmuədə çap olunmuşdur. Proqram materiallarının ilk elmi planlaşdırılması da məhz bu məcmuədə yerləşdirilmişdi. “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsinin redaktorları professor A.Abdullayev, professor Ə.Əfəndizadə artıq respublikada aparıcı metodist alimlər kimi tanınırdılar.

“Azərbaycan dili və ədəbiyyat tədrisi” ölkədə yaranan qarışıqlıqla əlaqədar 90-cı illərdə öz işini dayandırdı. Bu barədə Azərbaycan SSR Xalq Təhsili nazirinin xüsusi əmri olmuşdur. Əmrdə deyilirdi: “Azərbaycan məktəbi” jurnalına əlavə nəşr edilən “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsinin əvəzinə müstəqil “Ana sözü” jurnalı nəşr etmək məqsədəuyğun hesab edilmişdir. Yeni jurnalın nəşri uzun illər respublikamızda Azərbaycan dilinin işlək dairəsinin məhdudlaşdırılmasına, xüsusilə qeyri-rus məktəblərində bu fənnin tədrisinin aşağı səviyyədə olmasına, ümumilikdə isə, Azərbaycan dilinin öyrənilməsi və təbliğinə lazımi əhəmiyyət verilməməsi kimi halların aradan qaldırılmasına kömək edəcəkdir” (Azərbaycan dili və ədəbiyyat tədrisi, 1990, №2). Əlbəttə, əmrdə jurnalın fəaliyyətinə qiymət verilməsində bir qədər haqsızlıq hiss olunurdu.

“Azərbaycan məktəbi” jurnalına əlavə nəşr olunan “Fizika və riyaziyyat tədrisi” məcmuəsi respublikanın fizika və riyaziyyat müəllimlərinə ana dilində sistemli və əməli-elmi kömək göstərən ilk məcmuə kimi 1954-cü ildən nəşrə başlamışdır.

Məcmuənin qarşısında duran vəzifələr onun birinci nömrəsində aydın ifadə edilmişdir: “... Başlıca vəzifə yeddiillik və orta məktəblərdə fizika və riyaziyyat tədrisinin yaxşılaşdırılmasında və bu fənlərin tədrisinin elmlərin müasir vəziyyəti səviyyəsinə, məktəblərin qarşısında dövlət tərəfindən qoyulan tələblər səviyyəsinə qaldırmaqda müəllimlərə kömək etməkdən ibarətdir”.

Elə ilk nömrəsindən başlayaraq məcmuənin ayrı-ayrı konkret iş sahələri də müəyyənləşdirilmişdi. Jurnal ümidverici təsir bağışlayırdı.

O illərdə pedaqoqları və metodistləri düşündürən məsələlərdən biri orta ümumtəhsil məktəblərində fizika, riyaziyyat, astronomiya, rəsmxətt, sonralar informatika kurslarının məzmununun təkmilləşdirilməsi problemi idi. Ona görə də məcmuənin ilk nömrəsindən başlayaraq bu məsələ jurnalın səhifələrində əsas yenilik kimi öz əksini tapmışdır. Bundan əlavə məcmuədə ittifaq üzrə başlıca yeniliklər və tədbirlər də müntəzəm surətdə işıqlandırılırdı. Məcmuənin hər nömrəsində görkəmli metodistlərin yazılarına müraciət olunur, yeri gəldikcə, “Математика в школе” jurnalından məqalələr də tərcümə edilərək çap olunurdu. SSRİ üzrə vahid proqram və dərsliklərin mövcudluğu şəraitində ittifaq üzrə təcrübənin öyrənilməsinə də marağı artırdı.

Metodika elminin təzəcə ayaq açdığı illərdə yeni forma və üsullar çox aktual məsələlər idi. Xüsusən riyaziyyat təliminin forma və üsullarının təkmilləşdirilməsinə məcmuədə xüsusi diqqət yetirilirdi. Onu da

deмək olar ki, bütün nömrələrdə həmin məsələyə bu və ya digər dərəcədə toxunulur, müxtəlif təkliflər irəli sürülür və oxuculara müvafiq məsləhət, tövsiyə və göstərişlər də verilirdi. Əsas diqqət bu problemlərə yönəldiyindən fizika və riyaziyyatın tədrisi ilə əlaqədar az əhəmiyyətli olan tərbiyə üzrə materiallara 1954-1960-cı illərdə o qədər də yer verilmirdi, lakin az sonra bu məsələyə də münasibət dəyişdi. Şagirdlərdə o zamankı hakim ideologiyanın baş mövzularından olan dialektik-materialist dünyagörüşünü formalaşdırmaq, onları mübariz ateistlər kimi yetişdirmək, hər bir məktəblinin yüksək ideya-siyasi hazırlığını təmin etmək məqsədi güdən materiallar müntəzəm surətdə nəşr olunurdu. Lakin bu materiallar nə qədər qabarıq verilsə də mahiyyətcə pedaqoji fikrimizin mayası inkar olunmurdu. O, ana xətt kimi pedaqoqlarımızın yazılarında öz əksini tapırdı.

İlk vaxtlarda fəndaxili və fənlərarası əlaqə yeni məsələlər idi. Ona görə də məcmuədə bu barədə çoxlu yazılar dərc edilirdi. Bu yazılarda fizika ilə riyaziyyat, fizika ilə kimya, riyaziyyatla əmək təlimi, fizika ilə əmək təlimi arasında birtərəfli və qarşılıqlı əlaqə, fizika və riyaziyyat kurslarının həyatla, praktika ilə əlaqələndirilməsinə dair fikirlər başlıca yer tuturdu. Onu da qeyd etməliyik ki, "Fizika və riyaziyyatın tədrisi" informatikanın məktəb həyatına daxil olması ilə əlaqədar son illərdə "Fizika, riyaziyyat və informatika tədrisi" adlandırılmışdır.

Məcmuədə çap olunan materiallar müəllimləri elmi yeniliklərlə də silahlandırırdı. Bunlar müəllimlər üçün də son dərəcə vacib idi və onlardan həmişə faydalanırdılar. Belə məqalələr fizika və riyaziyyat fənlərinin tədrisi xüsusiyyətlərini, təlim və tərbiyə metodlarının kompleks şəklində tətbiqini özündə əks etdirən yeni metodların sırasına daxil idi. Redaksiyanın heyətində təcrübəli alimlər vardı. SSRİ PEA-nın müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor Abbasqulu Abbaszadə, respublikanın əməkdar müəllimləri İ.Hacıyev, pedaqoji elmlər namizədi S.İmamzadə, M.Süleymanov, K.Köçərli məcmuənin nəşri və redaktəsi işində xeyli zəhmət çəkmişdilər. Sonrakı illərdə jurnala yeni yetişən qüvvələr daha çox cəlb olunurdu.

"Fizikanın tədrisinin bu günü və gələcəyi" adlı məqaləsində (Fizika və riyaziyyat tədrisi, 1989, №4) məcmuənin redaktoru professor Zahid Qaralov yazırdı: "İnanırıq ki, təbiət qanunauyğunluqlarının belə məzmunda (tam halında tədris formasında) öyrədilməsi şəxsiyyətin intellektual inkişafının təmin olunmasına, onun potensial imkanlarının açılmasına əlverişli şərait yaradır, məktəblilər dünyanı vəhdətdə və tam halında dərk edə bilərlər".

Qeyd etmək lazımdır ki, pedaqogika və psixologiyaya dair məqalələr, pedaqoji fikrin inkişaf problemləri əsasən "Azərbaycan məktəbi"ndə mərkəzləşdirildiyindən məcmuələrdə belə rubrikalar olmurdu. Məsələn, 1990-cı ildə "Fizika, riyaziyyat və informatika"nın tədrisində məqalələr belə qruplaşdırılmışdır: "Metodika və iş təcrübəsi", "Müəllimlərin özünü təhsilə kömək", "Sinifdənxaric və məktəbdənkənar iş". Bu illərdə ölkədə yaranmış vəziyyətlə əlaqədar məcmuənin bağlanması təhlükəsi də artdı. Maliyyə vəsaiti çatışmırdı. Ona görə də 1990-cı ildə həm 1-2-ci nömrələr, həm də 3-4-cü nömrələr bir nüsxədə toplanmışdı, deməli, ildə 2 jurnal çapdan çıxmışdır.

Z.Qaralovun xahişi ilə məcmuəyə redaktorluğa 1986-cı ildən prof. A.Nuruşov cəlb olundu.

"Fizika, riyaziyyat və informatika tədrisi" metodik məcmuəsi gələcəyə nikbin baxırdı. İctimai-siyasi hadisələrlə bağlı təhsil sistemində çətinliklər yaransa da məcmuənin 1990-cı il 1-2-ci nömrəsində "Fizika tədrisinin problemləri" adlı redaktor yazısında bu

ruh hiss olunurdu. Orada deyilirdi ki, redaksiyaya daxil olan çoxsaylı materialların təhlili göstərir ki, fizika tədrisinin konkret məsələlərini həll etmək üçün ziyalılarımız maraqlı axtarışlar aparırlar. Onların bir qisminin ideyalarını, konkret təkliflərini və işlədikləri materialları yığcam halda oxucularımıza təqdim edirik. Bu səpkidə müxtəlif regionlardan 22 məqalə dərc olunmuşdur. Yekun olaraq xatırladırıq ki, “Fizika, riyaziyyat və informatikanın tədrisi” metodik məcmuəsinin son nömrəsi illik kimi bir nüsxədə verilmişdir: 1991, №1-4. Bu nömrələr çapa 1992-ci ilin martında imzalanmışdır. Cəmi 8 çap vərəqidir (64 səhifə).

“Azərbaycan dili və ədəbiyyat tədrisi”, “Fizika və riyaziyyat tədrisi”nin uğurlu olması 1956-cı ildən “Azərbaycan məktəbi” jurnalına əlavə şəklində “Kimya və biologiya tədrisi” metodik məqalələr məcmuəsinin nəşrini də reallaşdırdı. Kimya və biologiya müəllimlərinin yaxın məsləhətçisi hesab olunan bu məcmuənin ildə 4 buraxılışı (hər buraxılışının həcmi 4,65 çap vərəqidir) olurdu. Məcmuədə ali məktəblərin kimya və biologiya fakültələrinin tələbələrinə kömək etmək məqsədi də izlənirdi. Bu münasibətlə məcmuədə kimya və biologiya elmləri sahəsindəki yeniliklər jurnalda ardıcıl çap olunur, yeni kimya və biologiya proqramları ilə əlaqədar olaraq ayrı-ayrı mövzuların müasir tələblər səviyyəsində tədrisi, ölkədə kimya və biologiya elmlərinin inkişafının dərsliklərə gətirilməsi, kimya və biologiya dərslərində şagirdlərə elmi dünyagörüşü, vətənpərvərlik və estetik tərbiyənin aşılanması haqqında məlumatlar verilirdi. Bu sahədə əldə edilmiş qabaqcıl kimya və biologiya müəllimlərinin iş təcrübəsi ayrı-ayrı məqalələrdə ümumiləşdirilir və təlimati xarakter daşıyan yazılar kimi dərc edilirdi.

“Kimya və biologiya tədrisi” məcmuəsində müəllimlərin elmi səviyyəsinə xidmət edən çox qiymətli məqalələr (“Atom quruluşunun Kvant mexanikası əsasında izahı”, “Dövri sistemin bəzi mübahisəli məsələləri haqqında”, “Turşu və əsaslar haqqında müasir nəzəriyyələr”, “İnsan genetikasına səyahət”, “Mendel qanunları”, “Azərbaycan sututarlarının mühüm bitki varidatları” və s.) çap olunmuşdur. Bunlardan əlavə məcmuədə müəllimlərə metodik cəhətdən kömək edən, yeni kimya və biologiya proqramlarına keçidlə əlaqədar mövzuların tədrisinə dair, mövcud təlim üsullarının təkmilləşdirilməsi, tədrisin keyfiyyətinin yüksəldilməsində fənlərarası əlaqələrin əhəmiyyəti, Azərbaycanın flora və faunasına dair ölkələrarası materialların öyrənilməsi və b. mövzulardakı məqalələr məcmuənin təlim-tərbiyədə nə qədər böyük rol oynadığını aydın göstərirdi.

Qeyd etmək lazımdır ki, az müddətdə məcmuənin əhatə dairəsi olduqca geniş və rəngarəng olmuşdur. Onun səhifələrində nəinki sadəcə metodik məqalələr, həmçinin fənlərin tədrisinə dair elmi-tədqiqat işlərinin nəticələri də öz əksini tapırdı. Odur ki, bu məcmuə respublikamızda kimya və biologiya tədrisi metodikasının inkişafına da təkan vermişdir. Təkcə bir faktı qeyd etmək lazımdır ki, 20-dən çox namizədlik dissertasiyasının ayrı-ayrı fraqmentləri məhz bu məcmuə vasitəsilə müəllimlərə çatdırılmışdır.

1990-cı ildə başqaları kimi bu məcmuə də öz işini dayandırdı. Redaktorlar R.Babayev və Ə.İmaməliyev 3-cü nömrədə sonuncu olaraq “Kimya və biologiya tədrisi” məcmuəsinin 1990-cı il 1-3-cü nömrələrində dərc olunmuş materialların siyahısını verdilər.

1958-ci ildə “Politexnik təlim” adlı məcmuə də fəaliyyətə başlamışdı. Məcmu-

ənin ilk nömrələrindən etibarən onun redaksiya heyətində: RSFSR Pedaqoji Elmlər Akademiyasının müxbir üzvü, mərhum A.Abbaszadə (redaktor), Ə.Əlizadə, Z.Osmanov, Z.Kazımzadə, A.Kreymer, M.Salamov, professor Ə.Seyidov, F.Hacıyev (redaktor müavini) kimi görkəmli alimlər və təcrübəli pedaqoqlar fəaliyyət göstərmişdir. Həmin illərdə məcmuə 2500-3000 nüsxə tirajla buraxılırdı. Onun birinci buraxılışında Azərbaycan SSR əməkdar müəllimi İ.Həsənovun "Politexnik təlimə rəhbərlik təcrübəsindən", C.Xələfovun "Sabit elektrik cərəyanı bölməsi tədrisində şagirdlərdə politexnik vərdişlərin aşılanmasına dair", Y.Zeynalovun "Əl əməyi dərslərinin təşkili və tərbiyəvi əhəmiyyəti", Q.İbadzadənin "V sinif üzrə məktəbin tədris-təcrübə sahəsində botanikadan praktik məşğələlər" adlı məqalələri, eləcə də "Yuxarı sinif şagirdlərinin müəssisələrdə müntəzəm surətdə əməyə alışdırılması", "Həndəsə dərslərində texnika elementləri" kimi tərcümə materialları da verilmişdir.

Məcmuənin səhifələrində akademik M.Mehdizadə, Ə.Seyidov, M.Muradxanov, A.Abbaszadə, C.Cəbrayılbəyli, Z.Kazımzadə və s. kimi görkəmli alimlər, Ə.İmaməliyev, S.İmamzadə, İ.Həsənov, A.Axundov, S.Əlai və b. kimi təcrübəli pedaqoqlar, metodistlər və müəllimlər vaxtaşırı müxtəlif mövzularda çıxış etmişlər. Məqalələrin məzmunu, əsasən, şagirdlərə istehsalatın elmi əsaslarını öyrətmək, onlara əmək bacarıqları və vərdişləri aşılamaq, müəllimlərin elmi, pedaqoji və metodik səviyyəsini yüksəltmək məqsədi ilə bağlı olmuşdur. Məqalələrin məzmununda məktəb təcrübəsinin öyrənilməsi, ümumiləşdirilməsi və yayılmasına da qismən yer verilmişdir.

Təlim prosesində olan dəyişikliklərlə əlaqədar məcmuənin adının dəyişdirilməsinə ehtiyac yarandı və 1967-ci ildən məcmuə "Əmək və politexnik təlim" adı altında nəşr olunmağa başladı. Burada əsas səbəb məktəblərin əksəriyyətindən istehsalat təliminin götürül-məsi ilə əlaqədar idi. Ona görə də, məcmuənin səhifələrində nəşr olunan məqalələrdə başlıca yeri istehsalat təlimi deyil, əmək və politexnik təlim tuturdu. 1967-1968-ci illərdə məcmuənin redaktoru dəyişdi. Redaktorluq təcrübəli metodist F.Hacıyevə tapşırıldı. O, özü bilavasitə məktəbdən gəldiyi üçün, dərc olunan məqalələrin də praktik xarakter daşımasına xüsusi diqqət yetirirdi. Həmin illərdən başlayaraq redaksiya heyətinin də tərkibində dəyişiklik edildi, heyətə bilavasitə, şagirdlərin əmək və politexnik təlimi sahəsində tədqiqat aparan, məktəblə sıx əlaqə saxlayan, elmi və pedaqoji hazırlığı olan pedaqoqlar daxil edildi, o cümlədən psixologiya üzrə təcrübəli alim kimi tanınan Ə.Əlizadə jurnala redaktor müavini təyin olundu. Sonralar redaktor olan İ.Mayılov, həmçinin Z.Kazımzadə, H.Sadıqov, S.İsmayılov, N.Quliyev də redaksiya heyətinin üzvü idilər.

Məcmuədə pedaqoji fikir tarixinə dair məqalələrdə (K.D.Uşinski "Əmək və onun tərbiyəvi rolu haqqında", A.Bağırov "Əmək və əmək tərbiyəsi haqqında" və b.) klassiklərin irsinin təhlilinə geniş yer verilmişdir. Uşinski "Əmək və əmək tərbiyəsi haqqında" (1974, №1), N.K.Krupskaya "Əmək politexniki məktəb" (1969, №1), "Əmək təlimi prosesində intizam tərbiyəsi" (1968, №3), V.A.Suxomlonski "Əməyin rolu haqqında" (1981, №2).

"Məktəblərimizdə əmək və politexnik təlimin inkişafı tarixində" adlı məqalədə keçilən yola nəzər salındıqdan sonra deyilirdi: "Respublika Maarif Nazirliyinin "Azərbaycan məktəbi" jurnalı, "Azərbaycan müəllimi" qəzetinin əməkdaşları əmək və politexnik təlim üzrə qabaqcıl təcrübənin öyrənilməsində, yazılmasındakı fəaliyyət-

lərini xüsusi göstərmək lazımdır” (1970, №1).

1964-cü ildən başlayaraq tarix fənninin tədrisi metodikasının inkişafı ilə əlaqədar “Azərbaycan məktəbi” jurnalına əlavə kimi “Tarix, ictimaiyyət, coğrafiya tədrisi” metodik məcmuəsi də işıq üzü gördü. Az vaxtda məcmuə tarix, ictimaiyyat, coğrafiya fənlərini tədris edən müəllimlərə kömək göstərdi. Müəllimlər məcmuənin hər bir nömrəsini səbirsizliklə gözləyirdilər. Onun oxucularının sayı getdikcə artırdı. Əgər əvvəllər məcmuə 6-7 min nüsxə tirajla çap edilirdisə, 1976-cı ildən onun abunəçilərinin sayı 10 mini ötmüşdü.

Məcmuədə respublikanın bir sıra görkəmli alimləri – Azərbaycan SSR EA-nın müxbir üzvü, professor Z.İbrahimov, tarix elmləri doktoru, professor İ.Striqunov, fəlsəfə elmləri doktoru, professor Ə.Şakirzadə, iqtisad elmləri doktoru A.Nadirov, tarix elmləri namizədləri N.Əlizadə, İ.Şükürzadə, Ə.Kərimov, coğrafiya elmləri namizədləri Ə.Əsədov, C.Məmmədov, iqtisad elmləri namizədi A.Əbilov və başqaları çıxış etmişlər. Bu alimlərin yazılarında tarix, ictimaiyyət və coğrafiya elmlərinin bir sıra nəzəri məsələləri şərh edilmiş, onları məktəblərə öyrətməyin səmərəli yolları haqqında faydalı mülahizələr söylənilmişdir”. Bu məqalələrlə müəllimlərin dünyagörüşünün genişlənməsinə kömək edən məcmuə görkəmli alimləri də müəllimlərə, şagirdlərə tanıtdırdı.

Məcmuədə o zaman mətbuatda tez-tez çıxış edən pedaqoji elmlər namizədləri, Azərbaycan DETPİ-nin baş elmi işçiləri M.Ağayev, M.Quliyev, ADU-nun dosentləri Ş.Məmmədbəyli, M.Zülfüqarov, B.Paşayev, M.Korenberq, İ.Ağayev, APİ-nin tarix və ictimaiyyət tədrisi metodikası kafedrasının müdiri, dosent N.Paşayev, D.Bünyadzadə adına Xalq Təsərrüfatı İnstitutunun dosenti S.Məcidov, H.Zərdabi adına Gəncə Pedaqoji İnstitutunun dosenti Ə.Zahidov, Xankəndindən dosent S.Zeynalov və başqaları tez-tez çıxış edir, müəllimləri maraqlandıran problemlərə şərh verirdilər. Məcmuənin səhifələrində fənlərin tədrisi metodikası sahəsində mütəxəssis alimlərə daha çox yer verilirdi.

“Tarix, ictimaiyyat, coğrafiya tədrisi” məcmuəsində xüsusilə son illərdə Azərbaycan tarixinə dair çox dəyərli materiallar dərc olunurdu. Bu da uzun illərdən bəri öz tariximizdən uzaq düşən müəllimlərimizə çox kömək edirdi. Məcmuədə dərc olunan belə məqalələr müstəqillik illəri ərəfəsində çox qiymətli idi. Məsələn, 1990-cı il 1-ci nömrədə “Azərbaycan Demokratik Respublikası” adlı məqalədə bu barədə xeyli müfəssəl məlumat verilirdi. Lakin bu yazılarda hakim ideologiyanın mənafeyi yenə də gözlənilirdi. Məqalə belə qurtarırdı: “Beləliklə, 23 ay – 1918-ci il mayın 28-dən 1920-ci il aprelin 28-dək davam edən Azərbaycan Demokratik Respublikasının fəaliyyəti dayandırıldı, Azərbaycan həyatında yeni dövr başlandı”.

Ötən əsrin 70-ci illərindən ibtidai məktəblərin həm məzmununda və həm də quruluşunda müxtəlif dəyişikliklər edildi. İbtidai təhsilin əhəmiyyəti lazımınca qiymətləndirildi. Hətta ibtidai məktəblər üçün ixtisaslı müəllimlərin hazırlanması da qərara alındı. Bu tələblər ibtidai məktəblər üçün yeni məcmuənin yaradılması ideyasını da sürətləndirdi. 1970-ci ilin yanvarından “İbtidai məktəb və məktəbəqədər tərbiyə” məcmuəsi fəaliyyətə başladı. Üçillik ibtidai təlim sisteminin tətbiqinə, yeni proqram və dərsliklərlə yenicə işə başladığımız dövrdə belə bir məcmuənin nəşri məktəbə, müəllimə göstərdikləri qayğının parlaq

ifadəsi oldu. Belə bir məcmuəsiz çoxcəhətli və mürəkkəb şəraitdə çalışan ibtidai siniflərdə təlimin məzmununu və üsullarını yeni əsaslarda qurmaq çətin olardı.

“Məcmuə ilk nömrəsindən çox düzgün və aydın yol tutdu. Onun qarşısında konkret və zəruri problemlərin həlli qoyuldu: 1) Üçillik təlim sisteminin mahiyyətini, onun ənənəvi sistemdən üstünlüyünü müəllimlərə çatdırmaq; 2) yeni proqramların məzmununu, xüsusiyyətlərini izah etmək; 3) yeni dərslikləri təhlil etmək; 4) yeni proqram və dərsliklərlə işləməyin metodikasını aydınlaşdırmaq və bunun müəllimlərin illərdən bəri alışdıqları üsul və priyomlardan üstünlüyünü sübut etmək; 5) proqram, dərslik və təlim üsullarını təkmilləşdirmək; 6) qabaqcıl təcrübəni öyrənib ümumiləşdirmək və yaymaq; 7) müəllimlərin nəzəri səviyyəsini yüksəltmək və s.” (Y.Kərimov).

Məcmuədə bu vəzifələrin həyata keçirilməsinə ardıcıl fikir verilirdi.

Məcmuənin 1-ci nömrəsindən etibarən üçillik təlim sisteminin mahiyyətinin açılmasına xidmət edən onlarla məqalə dərc olunmuşdur. Bu yazılarda deyilirdi ki, yeni sistemə formal olaraq bir il azaldılma kimi baxılmamalıdır. Yeni sistemdə məzmunca əsaslı surətdə dəyişilmələrə yol verilmiş, proqramlarda nəzəri materialların artırılmasına, çətinlik səviyyəsinin xeyli yüksəldilməsinə, sürətin artırılmasına, yeni məzmuna müvafiq üsul və priyomların seçilməsinə və onların təkmilləşdirilməsinə doğru istiqamət götürülmüşdü. Yeni proqram və dərsliklərlə işin səmərəli təşkilini təmin etmək məqsədilə məcmuədə bilavasitə proqram və dərslik müəlliflərinin məqalələri də dərc olunurdu. Yeni proqramların həyata keçirilməsi ilə əlaqədar məcmuədə müxtəlif xarakterli materiallar da öz yerini tuturdu.

Məcmuədə böyük zəhmətləri olan M.Muradxanov, N.Kazımov, Y.Talıbov, M.Həmzəyev, Ə.Qədirov, N.Sadıqov, İ.Əliyev, Z.Osmanov, Ə.Şükürov, M.Cabbarova, V.Xəlilov, H.Ələkbərov, X.Fətəliyev, A.Quliyev, B.Quliyev və başqaları kimi görkəmli pedaqoq, psixoloq və metodistlərinin məqalələri vasitəsilə yeni proqramla işləyən müəllimlərə kömək göstərmişdilər. Bundan əlavə, məcmuədə görkəmli rus, Ukrayna, Belorus pedaqoq, psixoloq və metodistlərindən A.A.Lyublinskaya, V.V.Yakovlev, B.Erdniyev, A.S.Pçyolko, L.Venqer, V.Muxina, V.P.Strezikozin, A.Savçenko, M.Yarmoloviç və başqalarının məzmunlu məqalələrinin tərcüməsi dərc olunmuşdur.

Məcmuədə məktəbəqədər tərbiyə ilə əlaqədar da xeyli material dərc edilmişdir. Bu sahədə başlıca diqqət “Uşaq bağçasında tərbiyə proqramının xüsusiyyətlərinin izahı”na yönəldilmişdir. Bununla əlaqədar olaraq məcmuədə həmin proqramla işləməyə dair metodiki göstərişlər də verilir. Uşaq bağçalarında tərbiyə işlərinin keyfiyyətinin yüksəldilməsində xidmət edəcək bir sıra tədbirlərdə məcmuənin işinə xüsusi fəallıqla yanaşılmışdır. Məcmuənin səhifələrində altı yaşlıların bağçada məktəbə hazırlanmasına həsr olunmuş materiallar dərc edilmişdir.

Məcmuədə göstərilirdi ki, indi təlim üsullarının təkmilləşdirilməsi, təlim-tərbiyə işlərinin keyfiyyətinin artırılması son dərəcə vacib bir məsələ kimi qarşıda durur. Bunları nəzərə alaraq redaksiya heyəti gələcəkdə proqram və dərsliklərin geniş müzakirəsini keçirməyi, dərsə verilən müasir tələblər, təlim üsullarının təkmilləşdirilməsi sahəsində fəaliyyəti daha da gücləndirməyi nəzərdə tuturdu. Məcmuənin qarşısında altı yaşlı uşaqların bağçada və ailədə məktəbə hazırlanması kimi mühüm vəzifə də durur. Bu sahədə tədqiqatın nəticələrinin müəllim və tərbiyəçilərə çatdırılması, şübhəsiz, yaxın illərdə altı yaşdan təlimə başlamaq üçün hazırlığı təmin edəcəkdir.

Məcmuə bir daha təsdiq edirdi ki, məqsədimiz ibtidai sinif müəllimləri və bağça tərbiyəçilərinə kömək göstərməkdir.

“Azərbaycan məktəbi” jurnalının ən gənc

əlavəsi “Məktəbdə bədən tərbiyəsi” məcmuəsi olmuşdur. 1976-cı ildən nəşrə başlayan məcmuə ildə 6 dəfə buraxılır, gənc nəslin fiziki tərbiyəsinin inkişafına xidmət edirdi.

Məcmuənin qarşısında dayanan vəzifə bədən tərbiyəsi və idman müəllimlərinin ixtisas hazırlığının yüksəldilməsinə, ideya-siyasi səviyyələrinin artırılmasına kömək etməkdən ibarətdir. Məcmuədə hərbi-vətənpərvərlik tərbiyəsi məsələlərinə də yer verilirdi.

“Məktəbdə bədən tərbiyəsi” məcmuəsinin rubrikalarından biri bədən tərbiyəsinin tədrisi məsələlərini (metodika) əhatə edir. Burada yeni proqram üzrə metodik göstərişlər, bədən tərbiyəsi proqramı və proqramın planlaşdırılması, proqramın ayrı-ayrı bölmələrinin tədrisinə aid göstərişlər, mütəhərrik oyunların təşkili, keçirilməsi, məzmunu haqqında qeydlər və digər materiallar müəllimlərə çatdırılmışdır.

Məcmuədə ölkəmizdə fiziki tərbiyənin tarixinə dair maraqlı məlumatlar da verilirdi. Professor Ə.Ağayevin, professor Y.Talıbovun silsilə məqalələri məcmuənin məzmununu dövrün tələbləri səviyyəsinə qaldıra bilmişdi. F.Rüstəmov “Azərbaycan ümumtəhsil orta məktəblərində fiziki tərbiyə nəzəriyyəsinin inkişafı” (1990, №6) məqaləsində bədən tərbiyəsinin tədrisinə tərbiyə nəzəriyyəsinin bir hissəsi kimi yanaşılmasını pedaqoji fikirlərlə əsaslandırırdı.

“Məktəbdə bədən tərbiyəsi” məcmuəsində ixtisasdan əlavə “Psixoloji məsələlər”, “Məktəb, ailə, ictimaiyyət”, “Xəbərlər, məlumatlar”, “Bizim iş yoldaşlarımız” rubrikaları da daim fəaliyyət göstərirdi. Məcmuədə akademik M.Mehdizadənin “Gənc nəslin sağlamlığı naminə”, professor Ə.Ağayevin “Bədən tərbiyəsi tədrisinin təkmilləşdirilməsi yolları”, “Ümumtəhsil məktəblərində fiziki tərbiyə və idmanın inkişafı” və digər müəlliflərin məqalələri çap olunmuşdur.

Məcmuədə metodik məqalələrlə yanaşı pedaqoji fikir tarixinə həsr olunmuş dəyərli yazılar da çap edirdi. Bu baxımdan pedaqoji elmlər namizədi S.Zeynalovun, pedaqoji elmlər namizədi İ.Mollayevin klassik pedaqoqların irsindən, onların əxlaq tərbiyəsi və fiziki tərbiyə haqqında fikirlərindən bəhs edilən məqalələri maraq doğururdu.

“Azərbaycan məktəbi” jurnalının əlavələri Azərbaycanda pedaqoji fikrin formalaşmasına əvəzsiz xidmət göstərmişdir. Onun köməyi ilə respublikada pedaqoq-alimlər dəstəsi yetişmişdir. “Azərbaycan məktəbi” jurnalı və onun əlavələri öz oxucularını dünyanın görkəmli pedaqoq və psixoloqlarının əsərləri ilə tanış etmiş, bununla da Azərbaycanda pedaqoji fikrin inkişafına öz müsbət təsirini göstərmişdir.

Göründüyü kimi “Əlavə metodiki məcmuələrin yaranması respublikada pedaqoji fikrin inkişaf spektrlərini genişləndirməklə yanaşı, metodikanın bir elm kimi inkişafının stimuluna çevrildi. xüsusi metodikalar üzrə yeni ideyaların əsas daşıyıcıları olan əlavə metodiki məcmuələr pedaqoji mətbuatın zənginləşməsində, mündəricəsinin genişlənməsində mühüm rol oynamaqla yanaşı, respublikada ən yaxşı müəllimlərin zəngin iş təcrübəsinin sistemli əks olunması, ümumiləşdirilməsi və qabaqcıl təcrübə ilə elmi ideyaların birləşdirilməsinin təmin edilməsində öz missiyasını həyta keçirdi. Zəngin təcrübə xəzinəsi olan bu məcmuələr pedaqogika nəzəriyyəçilərinin əsas elmi ideya mənbəyi olmuş, minlərlə müəllimlərin işini istiqamətləndirmiş, fəaliyyətini tənzimləmişdir.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Pedaqoji mətbuat və təlimin təkmilləşdirilməsi. //Azərbaycan məktəbi, 1976, №1.

2. Mehdizadə M. “Azərbaycan məktəbi” jurnalının 50 illik yubileyində giriş sözü. //Azərbaycan məktəbi, 1976, №10.

3. Əhmədov H. Pedaqoji irsimizin güzgü-

sü. //Azərbaycan məktəbi, 1976, №10.
4. Kazımov N. Pedaqoji fikrimizin salnaməsi. //Azərbaycan məktəbi, 1976, №10.
5. Bayramov Ə., Əlizadə Ə. “Azərbaycan məktəbi” jurnalında psixologiya məsələləri. // Azərbaycan məktəbi, 1976, №10.
6. Rüstəmov F. Azərbaycan pedaqogikaşünaslığı. Bakı, 2016.
7. “Azərbaycan məktəbi” jurnalı (1943-1991).
8. “Azərbaycan dili və ədəbiyyat tədrisi” məcmuəsi (1954-1991).
9. “Fizika və riyaziyyat tədrisi” məcmuəsi (1954-1991).
10. “Kimya və biologiya tədrisi” məcmuəsi (1956-1991).
11. “Tarix, ictimaiyyat və coğrafiya tədrisi” məcmuəsi (1964-1990).
12. “Politexnik təlim” məcmuəsi (1958-1990).
13. “Məktəbdə bədən tərbiyəsi” məcmuəsi (1975-1991).
14. “İbtidai məktəb və məktəbəqədər tərbiyə” məcmuəsi (1970-1991).
14. Azərbaycan məktəbi, 1996, №2; 1999, №6, 2010, №1yubiley materialları.

**Э.Маммедова**

**Роль приложений к «Азербайджан мектеби» в развитии педагогической мысли Азербайджана**

**Резюме**

Методические приложения к ведущему педагогическому журналу «Азербайджан мектеби» - имевшую важную роль в развитии педагогической мысли в Азербайджане, начали издаваться во второй половине XX века. Эти методические приложения издавались в следующих восьми наменованиях: “Азербайджан дили ве едебиййат тедриси”, “Физика ве рийазиййат тедриси”, “Кимя ве биология тедриси”, “Тарих, ичтимаиййат тедриси”, “Емек ве политехник тедриси”, “Мектебде беден тербийеси”, “İbtidai məktəb və məktəbəqədər tərbiyə”, həmçinin “Русский язык и литература азербайджанский школа”.

Эти сборники служили усовершенствованию преподавания отдельных предметов. Известные педагоги, ученые, методисты поделились своими ценными мыслями, которые способствовали формированию педагогической мысли в Азербайджане. Издание приложений к «Азербайджан мектеби» продолжалось до 90-х годов.

**E.Mammadova**

**The Role of appendices to the “Azerbaijan School” in the development of pedagogical thoughts in Azerbaijan**

**Summary**

The appendices to the leading journal the “Azerbaijan School" began to be published in the second half of the XX century. It consisted of 8 methodical surveys: “The History of the Azerbaijan Language and Literature", "Mathematics, Physics and Computer teaching", "Chemistry and Biology teaching", "History, Social Studies and Geography teaching", "Labour and Polytechnic training", "School Physical Education teaching" "Primary School and Preschool teaching". These appendices have played an important role in the development of pedagogical thoughts in Azerbaijan. The well-known pedagogues issued their articles which helped improve teaching practise. The issues of pedagogical surveys continued till the 90s.



# VİZUAL RESURSLAR-ZEHNİ XƏRİTƏLƏRİN TƏLİM PROSESİNDƏ YERİ VƏ ƏHƏMİYYƏTİ

**Nərminə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

Vizual resurslar: zehni xəritələrin öyrənmə prosesindəki rolu gün keçdikcə öz əhəmiyyətini artırmaqdadır. Öyrənmə zamanı vizual resurslar: zehni xəritələrin istifadə edilməsi mürəkkəb və çətin mövzuların öyrənilməsini asanlaşdırır, öyrənilənlər yaxşı yadda qalır, mücərrəd məfhumlar konkret anlayışa çevrilir. Mexaniki əzbərləmə əvəzinə, təhsilalanların başa düşərək, dərk edərək özünəməxsus öyrənməsi təmin olunur. Təhsilalanlarda mücərrədləşdirmə, ümumiləşdirmə, bütünləşdirici yanaşma, müstəqil düşünmə kimi bacarıqlar inkişaf edir. Bu baxımdan, vizual resurslar: zehni xəritələrlə bağlı daha geniş məlumat verilməsi, müəllimlərin bu sahədə maarifləndirilməsi günümüzdə vacib məsələlərdən biridir.

Məqalədə təhsilin keyfiyyət və səmərəliliyinin artmasında, təhsilalanların idrak fəaliyyətinin təmin edilməsində vizual resursların: zehni xəritələrin rolu, onların məzmunu, spesifik xüsusiyyətləri, tətbiqi ilə bağlı məsələlər vurğulanır və müvafiq təkliflər verilir.

***Açar sözlər:*** *vizual resurs, zehni xəritə, keyfiyyətli təhsil, məktəb, müəllim, şagird.*

***Ключевые слова:*** *визуальный ресурс, умственная (интеллект) карта, качественное образование, школа, учитель, ученик.*

***Key words:*** *visual resources, (the) mind mapp, quality education, school, teacher, student,*

Hazırda ölkəmizin təhsil sistemində mühüm dəyişikliklər baş verir. Bu dəyişikliklər ilk növbədə “Səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılması”nı özündə ehtiva edir (1).

Müasir yanaşmaya görə “yeni təhsil məzmunu” anlayışı konstruktiv xarakter daşıyır və təhsilin prioritet məsələlərindən biri olaraq diqqəti cəlb edir (2). “Yeni təhsil məzmunu”nda əsas məqsəd, təhsilalanların lazımsız məlumatlarla toplanmış bir məlumat anbarı deyil, əksinə, öyrəndiyi biliyi mənimsəyən, yeni qarşılaşdıqları məlumatları dərk edən, keçmiş bilikləri ilə əlaqələndirən, mühakimə etməyi və tənqidi düşünmə qabiliyyəti inkişaf etmiş olan fərdlər yetişdirməkdir (3).

Son zamanlarda ölkəmizin təhsil sistemində təhsilalanların passiv olduqları ənənəvi təhsil strategiyalarından imtina edilməkdə və təhsilalanların aktiv olaraq öyrənmə prosesində iştirak etdikləri strategiyalar əhəmiyyət qazanmaqdadır. Deyilənlər baxımından vizual resurslar: zehni xəritə-

lərin öyrənmə-öyrətmə metodu kimi gün keçdikcə əhəmiyyəti artmaqdadır.

Vizual resurslar: zehni xəritələrlə öyrənmə metodu və bunu təmin edən resursların sinif içərisində istifadəsi, anlamlı və daha yaxşı yadda qalan öyrənməyi təmin etdiyindən son dərəcə əhəmiyyətlidir.

Zehni xəritələr qeyd götürmə metodu olaraq ilk dəfə riyaziyyatçı, psixoloq və beyin tədqiqatçısı olan Buzan tərəfindən irəli sürülmüşdür. Vizual resurslar: zehni xəritələr metodu məlumatın qurulması və fərdin zehnindəki anlayışların anlamlı olmasını təmin edən istifadəli bir metoddur. Bu metod təhsilalanların əzbərləmədən öyrənmələrini və mövzuların bir-biri ilə əlaqələndirilməsini asanlaşdırır ( 4,5).

Zehni xəritələr Blumun zehni idrak mərhələləri ilə də əlaqəlidir. Bu resurslar, xüsusən anlayış, tətbiqetmə, təhlil və sintez mərhələsindəki hədəflərə çatılarkən istifadə olunduqda, hədəflərə çatmağa töhfə verə bilər. Bu konsepsiya bir çox tədqiqatçılar tərəfindən də dəstəklənir. Belə ki, zehni xəritələr beyinin potensialını aşkara çıxaran güclü bir metod, iki ölçülü vizual tədris resurslarıdır. Zehni xəritələr metodu təhsilalanların anlayaraq, öyrənmələrinin skeletini yaratmaq üçün bir metod olaraq tövsiyə edilən qrafik ekran formasıdır. O, eyni zamanda, beynin qurulmamış funksiyalarının, məlumatların, daha təsirli bir şəkildə beyinə qeyd edilməsi üçün istifadə edildiyi bir xatırlama metodudur. Bu metod materialı daha yaradıcı şəkildə öyrənməyə, daha asan xatırlamağa kömək edir (6,7,8,9).

Bu işlərin də yerinə yetirilməsi təbii olaraq beyin tərəfindən təmin edilir. Yəni qalıcı məlumatın açarı beyindir. Zehni xəritələr metoduna daha çox təsir edən sağ-sol beyin yarımkürəsi arasında əlaqənin qurulmasıdır. Beyinin iki yarımkürəsi harmoniya içində çalışdığı müddətdə təhsilalanın öyrənmə qabiliyyəti artır. Əgər təhsilalan öyrənmə çətinliyi çəkirsə, bu əsasən beyinin iki yarımkürəsinin bir-biri ilə əlaqədə olmamasından irəli gəlir. Beyinin sol və sağ hissələrinin daha yaxşı ünsiyyət qurmaları təmin olunduqda mövcud anda olduğundan daha çox məlumat öyrənilib, xatırlamaq olar. Bu faktor özlüyündə təhsilalanın müvəffəqiyyətini və özünə inamını artırır (10).

Vizual resurslar zehni xəritələr ilə əlaqədar mövcud olan konsepsiyalar içərisində müəllimlər üçün əhəmiyyətli məlumatlarla zəngin olması baxımından H. Qardnerin irəli sürdüyü "Çoxşaxəli zehni qabiliyyətlər" konsepsiyası (zəka-əqli qabiliyyətlər) daha aktual olub, son illərdə dünya psixopedaqogikasında uğurla tətbiq olunur (14). "Çoxşaxəli zehni qabiliyyətlər" konsepsiyası amerikalı psixoloq, Harvard Universitetinin professoru Hovard Qardner tərəfindən, 1983-cü ildə çap olunan "Zehnin çərçivəsində" kitabında irəli sürülmüşdür. "Çoxşaxəli zehni qabiliyyətlər" konsepsiyasına görə, hər bir şagird 8 qabiliyyətin təkrarolunmaz kombinasiyasına malikdir. Hovard Qardnerin irəli sürdüyü səkkiz zehni qabiliyyətdən biri də, vizual-məkan (visual-spatial) qabiliyyətidir.

Vizual-məkan qabiliyyəti şəkillərlə düşünmək, vizual dünyanı dərk etmək, forma və rəngləri zehnin gözləri ilə görmək, bunları bədii formalara çevirə bilmək, obrazları və şəkilləri aydın təsəvvür etmək, dinlədiklərinin beyinlərində rəsmini qurmaq, görərək və müşahidə edərək öyrənmək, şəkil çəkmək, boyamaq və modellər yaratmaq, üç ölçülü resurslar hazırlamaq, qrafik, diaqram, xəritə, şəkil və modelləri şərh etmək, asanlıqla istiqamət tapmaq və digər bu kimi bacarıqları ehtiva edir. Belə təhsilalanlar şəkil çəkməyi, mexaniki cızma-qara etməyi, hadisələrə təcrid olunmuş şəkildə yanaşmağı xoşlayır, yerləri təsvir edir, şəkillərə əsasən yadda saxlayır; əşyaları yaxşı təsvir edir, diaqramlarla və xəritələrlə

asan işləyirlər. Vizual-məkan qabiliyyəti üstün olan təhsilalanlar şəkillər və cizgilərlə düşünür, xəyalında gördükləri rəsmləri sözə çevirə bilirlər. Həmçinin öyrəndikləri məlumatları xatırlamaq üçün bu rəsmlərdən istifadə edirlər.

Zehni xəritələr çox fərqli məqsədlər üçün istifadə oluna biləcək vizual bir öyrənmə metodudur; düşüncə gücü və yaddaşın inkişaf etdirilməsində çox mühüm vasitədir; yazılı və şifahi məlumatları xatırlamağı asanlaşdırır, məlumatların müəyyən bir sistem içində mütəşəkkil olmasını təmin edir.

Zehni xəritələr-sinif şəraitində yeni bir mövzuya (bölməyə) başlayarkən təhsilalanların bilik ehtiyatının müəyyənləşdirilməsində və ya mövzu sonunda qiymətləndirmə məqsədilə, hesabat layihələrinin hazırlanmasında və qiymətləndirilməsi mərhələsində, çalışarkən kompleks məlumatlar arasındakı münasibətlərin təmin edilməsində istifadə edilə bilər. Problemlər həlletmə, planlaşdırma üçün çalışarkən zehni xəritələr idealdır. Bunu hazırlamaq üçün müxtəlif metodlardan istifadə olunması tamamilə müəllimin və təhsilalanların yaradıcılığına bağlıdır.

Zehni xəritə üçün ümumi qaydalar: Zehni xəritələr mərkəzi bir obrazla başlanır və bu obraz üçün ən azı üç rəng istifadə etmək kifayətdir. Onu hazırlamaq üçün rəsm bacarığının olması lazımdır. Obrazlar açıq və müxtəlif böyüklüklərdə ola bilər. Mərkəzi obrazdan yayılan, skeletini yaradan xətlərin üstünə sözlər yazılmalıdır. Hər bir xətt üçün tək bir söz istifadə etməli və xətlərin uzunluğu sözlərin uzunluğuna görə nizamlanmalıdır. Yayılan xətlər mümkün qədər üfüqi edilməlidir. Belə olduğu halda xətlərin üstlərindəki sözlərin oxunması asanlaşır. Sözlərin böyük hərflərlə yazılması və düz olması məqsədəuyğundur. Beləliklə, onlar daha asan oxunacaq və xatırlanacaqdır.

Əsas sözləri vurğulamaq üçün ən sevilən rənglərin istifadə edilməsi faydalı ola bilər. Xətlərin qalınlığı əhəmiyyətlərinə görə nizamlanmalıdır. Zehni xəritənin mərkəzinə yaxınlaşdıqca xətlər qalınlaşmalı, bir-birilə birləşdirilməlidir: fikirlər halqalar, qıvrımlar və oxlardan istifadə etməklə bir-biri ilə əlaqələndirilməlidir.

Ənənəvi qiymət alma metoduna qarşı zehni xəritələr. Zehni xəritələr sözlərlə yanaşı, rəng, ölçü və vizual obrazı ehtiva edir. Ağ rəngli A4 kağızlara və bir düjün qədər rəngli yumşaq uclu qələmlərdən istifadə edilərək, çəkilməsi daha münasibdir. Zehni xəritələrin ənənəvi qiymət alma üsuluna görə bir çox üstünlükləri vardır: vaxt qazandırır; diqqətinin mühüm məsələlər üzərində yönəlməsinə imkan verir; beyinin və yaradıcılığın maksimum istifadə edilməsini təmin edir; xatırlama gücünü artırır.

Hər bir təhsilalanın fərdi fərqliliklərinin təlim prosesində diqqətə alınması öyrənməyə böyük töhfə verə bilər. Belə ki, zəkası yüksək olan şagird üçün mövzunun bir dəfə izah edilməsi kifayət edir. Zəka səviyyəsi aşağı olan digər şagird isə eyni mövzunu bir neçə dəfə təkrarladıqdan sonra qavraya bilir. Yuxarıda da qeyd olunduğu kimi, təhsilalanlarda fərqli zəka qabiliyyətləri mövcud olduğundan, onlar bəzi fənlərdən geri qala, əvəzində isə onun digər fənlərlə bağlı qabiliyyətləri daha üstün ola bilər. Bu baxımdan müəllim (öyrədən) təhsilalanı (öyrənəni) qabiliyyətli olduğu sahələrdə ən yüksək səviyyəyə çatana qədər inkişaf etdirrməyə çalışmalı, geri olduğu sahələrdə isə onu məcbur etməməlidir. Başqa cür desək, təhsilalanın sahib olduğu qabiliyyətlər və bu qabiliyyətlərin səviyyələri təsbit edilərək, hər bir qabiliyyətin məhdudluğuna uyğun işlər görülməlidir. Əks halda, təlim prosesi yalnız müvəffəqiyyətsizliklə, ya da müəllimin xəyal qırıqlığı ilə nəticələnər. Bu vəziyyət təhsilalanın ruhi istiqamətdən pozulmasına da səbəb ola bilər. Müəllim

(öyrədən) təhsilalanın müvəffəqiyyəti ilə zəkası arasında mənalı əlaqənin olduğunu göz önündə saxlamaqla birlikdə, hər müvəffəqiyyətsizliyin də, zəkadan qaynaqlanmayacağı gerçəyini nəzərə almalıdır.

Təhsilalanlarda vizual resurslar zehni xəritələrlə işləmək bacarığını inkişaf etdirməyin yollarını tapmaq lazımdır. Hər bir təhsilalan ruhlandırıldıqda, dəstək və düzgün təlimatlar aldıqda bu istiqamətdə qabiliyyətini lazımi səviyyədə inkişaf etdirə bilər. Sadəcə, bu xüsusiyyətlərin üzə çıxması, lazımi bacarıqların formalaşdırılması üçün təhsilalanlara müvafiq şərait yaradılmalıdır.

Təhsilalanlarda idrak fəallığının təmin edilməsində, təhsilin keyfiyyət və səmərəliliyinin yüksəldilməsində təlim-tədris prosesində vizual resurslardan-zehni xəritələrdən istifadə edilməsi bir problem kimi diqqəti cəlb edir. Günümüzdə bu istiqamətdə təlim strategiyalarının yaradılması xüsusi aktuallıq kəsb edir.

Məqalədə təhsilalanlarda idrak fəallığının təmin edilməsində vizual resursların zehni xəritələrin əhəmiyyəti ilə bağlı məsələlərə toxunulur, tətbiqi ilə əlaqədar faydalı tövsiyələr verilir.

Məqalədə təlim zamanı istifadə olunan vizual resurslar zehni xəritələrdən danışılır. Məqsəd fənn müəllimlərinə təhsilalanlara zehni xəritələrlə işləmək vərdişlərinin qazandırılması və inkişaf etdirilməsi istiqamətində kömək etməkdir.

***Rəyçi: dos. İ.Cavadov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası //Azərbaycan məktəbi, 2013, №5.

2. Abbasov Ə. Təhsilin yeni məzmunu barədə. Bakı: Təhsil problemləri, №,77-78, 16-23 oktyabr, 2016-cı il.

3. Məmmədova N. Yeni kurikuluma uyğun müasir tədris resurslarının yaradılması. "Təhsilin inkişafı üzrə Dövlət Strategiyası: persperktivlər və vəzifələr" kitabı. ARTPİ. Bakı: Mütərcim, 2015.

4. Brinkmann, A. (2003). Graphical Knowledge Display – Mind Mapping and Concept Mapping as Efficient Toolsin Mathematics Education. Mathematics Education Review, 16, 35–48.

5. Budd, W. (2004). Mind Maps as Classroom Exercises. Journal of Economic Education, Winter, 2004.

6. Bütüner, S. (2006). Açılar ve üçgenler konusunun ilköğretim 7. sınıf öğrencilerine v diyagramları ve zihin haritaları kullanılarak öğretimi. Yayınlanmamış yüksek lisans tezi, Balıkesir Üniversitesi Fen Bilimleri Enstitüsü,Balıkesir.

7. Buzan, T. (1996). The Mind Map Book. New York: Plume Books.

8. Cəbrayılov İ. Müasir təhsil: axtarışlar və perspektivlər. Bakı: Mütərcim, 2013.

9. Kalaycı, N. (2002). İki boyutlu öğrenme ve öğretme araçları. Öğretim teknolojileri ve materyal geliştirme (2.Baskı) (67-80) ( Ed. H. İbrahim Yalın ve diğ) Ankara: Nobel Yayıncılık.

10. Townsend, R. (2003). Öğrenme Zenginliği. İstanbul: Sistem Yayıncılık.

11. Abi-El-Mona, I. ve Adb-El-Khalick, F. (2008). The Influence of Mind Mapping on Eighth Graders' Science Achievement. School Science and Mathe-matics, 108(7), 298-312.

12. Farrand, P., Hussain, F. ve Hennessy, E. (2002). The Efficacy of The Mind Map Study Technique. Medical Education, 36, 426-431.

13. Goodnough, K. ve Woods, R. (2002). Student and teacher perceptions of mind

mapping: A, New Orleans, LA middle school case study. 11.th The Annual Meeting of the American Educational Research Association (1- 5 April).

14. H.Qatdner Howard Gardner's Multiple İntelligences. Educational Leadership Vol. 54, No. 6, March 1997. http://www.businessballs.com/howardgardnermultipleintelligences.

**Н.Мамедова**

**Визуальные ресурсы: место и важность в процессе обучения умственных карт**

**РЕЗЮМЕ**

С каждым днем визуальные ресурсы: в роле процесса обучения и его содержания растут и имеют большое значение. Изучение и использование визуальных средств:умственных (интеллектуальных) карт в процессе обучения облегчает изучение сложных и трудных тем, учащиеся хорошо осваивают более глубоко запоминная пройденное. Вместо механического запоминания, сознательное понимание учащим обеспечивает своеобразное обучение. Всеобщий подход, обобщение учащихся заключается в разработке самостоятельных навыков мышления. В связи с этим, визуальные ресурсы, умственных (интеллектуальных) карт в роле процесса обучения, дает более подробную информацию о учителях в этой области, и является сегодня столь важным.

В статье приведены примеры повышения качества и эффективности образования, обеспечения когнитивной деятельности учащихся, визуальных ресурсов, умственных (интеллектуальных) карт в роли процесса обучения и их содержания, особенности, основные моменты и соответствующие предложения по вопросам, связанным с их применением.

**N.Mammadova**

**The place and importance of visual resources-mind map in the learning process**

**Summary**

Visual resources: the role of mind maps in the learning process is increasing its significance day by day. Visual resources in the learning process: using mind maps facilitates the study of complex and difficult issues, the learned are well remembered, is becoming a concrete understanding of abstract concepts. The unique study of learners are provided by understanding instead of the mechanical memorization. Learner’s skills as abstract thinking, generalization, independent thinking are improved. In this regard, giving for more information on visual resources-mind maps are one of the most important issues today.

In the article is stresses issues related to the application, theme, features of visual resources in the increasing quality and efficiency of education and is giving relevant offers.



# DƏRSLƏRİN MÜASİR TƏLİM METODLARI İLƏ TƏŞKİLİNƏ DAİR

**Orxan Soltanov,**
*Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasının baş müəllimi*

***Açar sözlər:*** *fəal təlim, dərs metodları, təlim üsulları, dərsin quruluşu.*
***Ключевые слова:*** *активное обучение, методы обучения, построение урока.*
***Key words:*** *an active training, the methods of the classes, the method of the training, the stucture of the lesson.*

Azərbaycan təhsilinin məzmununda ciddi dəyişikliklər olmuşdur. Əvvəllər tədris prosesində biliklərin şagirdlərə hazır şəkildə mənimsədilməsi tələb olunurdusa, indi şagirdlərin özünün tədris olunan mövzu ətrafında müstəqil fikir yürüdə bilməsinə, bir-birinin biliyinə qiymət verməsinə, fiziki hazırlığını inkişaf etdirərək kimin nəyə qadir olduğunu aşkar etməsinə, bilik və bacarıqlara müstəqil olaraq yiyələnməsinə daha çox diqqət yetirilir.

İnkişaf etmiş ölkə kimi Azərbaycanda da xalqın sağlamlığının möhkəmləndirilməsində fiziki tərbiyə və idman önəmli yer tutur. İnsanın hərtərəfli inkişafı, şagirdlərin və gənc nəslin Vətənin müdafiəsinə və hərbi xidmətə hazır olmasında fiziki tərbiyə dərslərinin yüksək səviyyədə tədris olunması çox böyük əhəmiyyətə malikdir. Tədqiqatlar göstərir ki, fiziki tərbiyə dərsləri müasir təlimlə inteqrasiya edildikdə şagirdlərin dərsə marağı daha da artır və şagirdlərin fiziki inkişafı ilə bağlı real nəticələr əldə olunur. Belə ki, fiziki tərbiyə dərslərində fəal təlim metodu kimi motivasiyanın sübut, dəlil yaradılmasıdır ki, bu da olduqca mühüm əhəmiyyət daşıyır. Motivasiya dərsin başlanğıc mərhələsidir. Fəal dərs motivasiyadan başlanır. Müəllim motivasiyanı düz qura bilirsə, dərsin mahiyyəti də öz istiqamətini tapır. Bu zaman ayrı-ayrı idman növlərində Azərbaycanı müxtəlif beynəlxalq yarışlarda uğurla təmsil etmiş idmançıların, dünyada tanınmış atletlərin idman həyatının nümunə göstərilməsi və ya sadəcə sağlam və mütənasib bədən quruluşuna malik olmağa həvəsləndirməyə istiqamət verən motivasiya dərsdə şagirdi düşündürür onda məntiqi və idraki təfəkkürə əsaslanan fikirlər yaranmasına səbəb olur. Fiziki tərbiyənin yeni məzmununda fəal təlim metodları ilə yanaşı, hərəki qabiliyyətlərdən sürət, sürət-güc, əyilgənlik, çeviklik, qüvvə və dözümlülük xüsusi bir xətt kimi nəzərdə tutulur. Hərəki qabiliyyətlərin formalaşdırılması şagirdin fiziki cəhətdən hərtərəfli hazırlığını təmin edən yeganə şərtdir. Ümumtəhsil məktəblərində şagirdlərin ayrı-ayrı yaş dövrləri müxtəlif hərəki qabiliyyətlərin inkişafı üçün ən əlverişli dövr hesab olunur. Bu yaş dövrlərində (11-12 yaş) fiziki hərəkətlər vasitəsi ilə hər hansı hərəki qabiliyyətin

inkişaf etdirilməsi imkanları vardır. XXI əsrin əvvəllərinədək cəmiyyətdə dominant rol oynayan ənənəvi təhsil sistemində təhsilalanlara bir obyekt kimi yanaşılıb, təhsildə avtoritar idarəetmə üsullarına üstünlük verilsə də, Azərbaycanda müstəqillik qazandıqdan sonra demokratik, müstəqil ölkənin əsas prinsiplərinə uyğun yeni, müasir tələblərə cavab verən təhsil sisteminin qurulmasına başlandı. Ənənəvi təhsil sistemi dövrünü başa vurduqdan sonra təhsildə təkamül yolu ilə, yeni keyfiyyət dəyişiklikləri aparılmaqla tədricən, öz yerini yeni sosial, şəxsiyyətyönümlü təhsil sisteminə verməyə başladı.

Tədris-təlim prosesində yeni texnologiyaların tətbiqi, pedaqoji prosesin idarə edilməsində yeni yanaşmalardan istifadə, keyfiyyətli sinif-dərs sisteminin qurulmasına geniş imkanlar yaradılmışdır. Sinif-dərs sisteminin keyfiyyət təminatında ənənəvi dərslərdən fərqli olaraq, müasir dərsin təşkili həlledici rol oynayır. Bu halda sinif mühitində son dərəcə əhəmiyyətli dəyişikliklər baş verir, öyrədənlə öyrənən arasında, şagirdlərin öz aralarında və məktəblə valideynlər arasında müasir tələblərə cavab verən qarşılıqlı əlaqələr qurulur. Müasir təlim metodlarından biri olan interaktiv təlim üsullarından və İKT-dən geniş istifadəyə yeni imkanlar yaranır. Belə ki, motivasiyanın aparılmasında şəkillər, suallar, cədvəllər və digər internet resurslarından istifadə İKT vasitəsi ilə çatdırılır. Bütün ali təhsil müəssisələrinin, məktəblərin internetə qoşulması, kompüterləşdirilməsi işləri demək olar ki, fəal dərsin səmərəli təşkil edilməsinin əsas vasitələrindəndir. Digər fənlərdə olduğu kimi fiziki tərbiyə dərslərini də tədris edərkən İKT-nin geniş imkanlarından istifadə edərək proyektorların köməyi ilə dərslərin qurulması, maarifləndirici məlumatların ötürülməsi informasiya texnologiyalarında resurslardan istifadənin göstəricisidir. Həmçinin nümunəvi dərslərin, idman məşğələlərinin, yarışların keçirilməsinin kütləvi informasiya vasitələri ilə mətbuatda işıqlandırılması, televiziya vasitəsi ilə maarifləndirici bədən tərbiyəsi və idman haqqında məlumatların ictimaiyyətə çatdırılması da məqsədə uyğundur. Bir məsələni də qeyd etmək istərdik ki, bəzən valideynlər məktəblərdə övladlarının fiziki tərbiyə dərslərində iştirak etməməsini qeyd edirlər və buna səbəb kimi uşaqların tərləyərək soyuqlamasını bildirirlər. Belə hallar şagirdlərin prosedur qaydalardan düzgün istifadə etmədikləri nəticəsində baş verir. Bunun üçün idman jurnallarında və qəzetlərdə mətbuatda çıxışlar etmək, məqalələr dərc etmək və valideynlərlə maarifləndirici treninqlər keçirmək, canlı olaraq dərslərin nümayiş etdirmək vacib məsələlərdəndir. Müasir təlim metodları idraki və kommunikativ fəaliyyətin elə bir formasıdır ki, tədris olunan mövzunun mənimsənilməsinə proses iştirakçılarının hər biri öz töhfəsini verir. Bu prosesdə yalnız müəllimlə şagirdlər deyil, həm də şagirdlər öz aralarında söhbət və dialoji münasibətdə olurlar. İnteraktiv metodlar biliklərin şagirdlərə hazır şəkildə verilməsini deyil, bu bilikləri daha çox onların özlərinin köməyi ilə birlikdə axtarıb tapmalarını nəzərdə tutur. Təlim prosesində müəllim təşkiledici, əlaqələndirici, istiqamətverici və məsləhətverici, şagirdlər isə təcrübəçi, tədqiqatçı və yaradıcı subyektlər kimi fəaliyyət göstərirlər. Fiziki tərbiyə dərsi - fənnin məzmun xətlərinin tədrisini təmin edən pedaqoji proses olub aşağıdakı hissələrdən ibarətdir:

Giriş hissə: dərsdə həyata keçiriləcək

standartlarla əlaqəli olub informasiya təminatı və nəzəri biliklərin, motivasiyanın yaradılmasından;

Hazırlayıcı hissə: sıra, ümuminkişaf etdirici hərəkətlər və xüsusi hazırlayıcı hərəkətlərin vasitəsi ilə şagird orqanizminin əsas fiziki yükünün icrasına hazırlanmasından;

Əsas hissə: inkişafı nəzərdə tutulan hərəki qabiliyyət (və ya hər hansı idman növünün texniki elementlərinin öyrədilməsi, möhkəmləndirilməsi və təkmilləşdirilməsi) üçün lazım olan fiziki yükün zəruri həcmdə və intensivlikdə yerinə yetirilməsindən ibarətdir.

Tamamlayıcı hissə: orqanizmin funksional sistemlərinin dərsdən əvvəlki vəziyyətinə qaytarılması üçün tənəffüs və bərpaedici hərəkətlərin icrası, dərsin yekunlaşdırılması və qiymətləndirilməsi üçün istifadə olunur.

Müasir təlim metodları dedikdə fiziki tərbiyə fənn kurikulumunun tədris olunmasında təlimin forma və üsulları, məzmun standartları da nəzərdə tutulur. Belə ki, məzmun standartların seçilməsi dərsin mövzusuna müvafiq olaraq onun məzmununun məntiqi tərtibinə xidmət edir. Fiziki tərbiyənin dövlət standartlarında verilmiş standartların bəziləri bir dəfə, bəziləri isə bir neçə dəfə dərsin mövzusuna daxil edilir. Məsələn, (1.1.1. hərəkətlərin bədən quruluşuna və qamətin korreksiyasına təsiri haqqında qısa informasiya verir) alt standartı demək olar ki, bütün tədris vahidləri (hərəki qabiliyyətlər) üçün ayrılmış dərslərin birincisinə daxil edilir. Çünki ayrı-ayrı hərəki qabiliyyətlərin inkişafına istiqamətlənmiş hərəkət kompleksləri bir-birindən hərəkətin strukturuna, intensivliyinə, təkrarların sayına və s. göstəricilərə görə fərqləndiyi üçün onların orqanizmə, əzələ və digər funksional sistemlərə təsiri də müxtəlif olacaqdır. Başqa sözlə desək, qüvvə istiqamətli fiziki yükün orqanizmə təsiri sürət və ya dözümlülük istiqamətli fiziki yükün təsirindən əhəmiyyətli dərəcədə fərqlənəcəkdir. Bu baxımdan da müxtəlif istiqamətli fiziki yükün orqanizmə təsiri (1.1.1. hərəkətlərin bədən quruluşuna və qamətin korreksiyasına təsiri haqqında qısa informasiya verir) haqqında hər bir hərəki qabiliyyətin tədrisi zamanı informasiya vermək zərurəti yaranır.

Fiziki tərbiyə dərslərinin tədrisi formaları da təlimin məqsədinə müvafiq olaraq kollektiv, qrup, cütlər və fərdi təşkil edir. Bununla yanaşı, seçilmiş dərs formasına müvafiq olaraq tam ciddi reqlamentləşdirilmiş, hissə-hissə öyrətmə, söz, əyani, oyun, yarış kimi təlim üsullarından da istifadə olunur. Dərs prosesində istifadə olunan təlim metodları hərəki qabiliyyətlərin inkişaf etdirilməsi ilə yanaşı, hərəki bacarıq və vərdişlərin, eləcə də idraki proseslərin fəallaşmasına kömək etməlidir. Bu, xüsusən ibtidai, ümumi orta və tam orta təhsil mərhələsi üçün daha zəruridir. Mürəkkəb quruluşlu oyunların icrası və ya hərəki fəaliyyətin yenidən qurulması, şagirdin əvvəlcədən şüurlu, düşünülmüş planı əsasında öz fəaliyyətini çevik tənzimləmək bacarığına əsaslanır. Belə təkrarlamalar psixomotor fəaliyyətin səmərəliliyinin tədricən artmasına gətirib çıxarır. Belə ki, fiziki tərbiyə dərslərində kombinələşmiş oyunların dəfələrlə təkrarlanması bacarıq və vərdişlərin əldə etməsinə gətirib çıxarır. Bəzən bu oyunlar uşaqlarda yorğunluq yaratsa da, hərəki fəaliyyətini inkişaf etdirir. Bu baxımdan fiziki tərbiyə dərslərində fəal, məntiqi hərəkətli oyunlar, və yarışların daxil edilməsi, fəal təlim metodlarından istifadə şagirdlərin diqqətini aktivləşdirir, emosional vəziyyətlərini və

maraqlarını artırır.

Lakin, yadda saxlamaq lazımdır ki, bu kimi oyunlar əlavə, köməkçi metod kimi çıxış edir. Belə ki, fiziki hərəkətlərin icrası, informasiya təminatı və nəzəri biliklərin kifayət qədər yaxşı mənimsənilməsi şagirdlərin diqqətini artırır. Fiziki tərbiyə dərslərində istifadə olunan oyunların ardıcıllığı əvvəlcədən planlaşdırılmalıdır. Oyunların seçimi dərsin qarşısında duran pedaqoji məsələlərdən asılı olmalıdır. Burada sinfin hazırlılığı da az rol oynamır. Dəqiq bilmək lazımdır ki, şagirdlər nəyi bacarır və nəyi etmək gücünə malikdirlər. Belə ki, oyunların harada keçirilməsindən, avadanlıq və ləvazimatların təlim resurslarının düzgün seçilməsindən asılıdır. Oyuna bu və ya digər hərəkət elementini daxil etdikdə, nəzarət etmək lazımdır ki, oyunun gedişatında əsas hərəkət strukturu pozulmasın. Deməli, yeni təlim metodları ilə qurulan təlim prosesi (müasir dərs) rəqabətədavamlı şəxsiyyətin inkişafı kimi ümumbəşəri dəyərləri reallaşdırır, təlim prosesində fundamental, eyni zamanda praktik yönümlü bilik və bacarıqlar aşılayır, kamil insanın, vətənini, millətini sevən rəqabətəqabil şəxsin formalaşmasını təmin edir.

XXl əsrin hazırkı mərhələsində Azərbaycan təhsil sistemi qarşısında çox mühüm problemlər durur. Müasir təlim prosesinin (müasir dərsin) əsas məqsədi tədrisin səmərəliliyini artırmaq, öz düşüncəsi, ağlı, potensial enerjisi, güclü məntiqi ilə fənləri dərindən mənimsəyən və onu tətbiq etməyi bacaran, hər cür situasiyalarda işin məğzini tutub çıxış yolunu tapmağı bacaran yüksək intellektli gənclər yetişdirməkdir. Bu məqsədləri yerinə yetirmək üçün fəal-interaktiv təlim metodlarından istifadə edərək, təlim prosesi (müasir dərslər) belə aspektdə qurulmalı, keyfiyyətli tədris-təlim prosesinin təşkili təmin edilməlidir.

***Rəyçi: dos. B.Quliyev***

## İstifadə edilmiş ədəbiyyat

1. “Azərbaycan Respublikası Ümu-mi Təhsilin Milli Kurinkulumu”. Bakı, 2006.

2. Abiyev A., Hüseynov F. və b. “Bədən tərbiyəsi fənni üzrə standart”. Bakı, Kamran MMC, 2005.

3.B.Quliyev. Bədən tərbiyəsi proqramları. “Məktəbdə bədən tərbiyəsi” məcmuəsi. 1979, №6.

**О.Солтанов**

**Организация уроков с помощью новых методов обучения**

**Резюме**

В статье показаны современные методы обучения и организации уроков физической культуры в V-VI классах. Проведение уроков физической культуры новыми учебными методами, использование методов и учебных форм ИКТ. Создание мотивации и разработка у школьников физической подготовки.

**O.Soltanov**

**Organizing lessons by new teaching methods**

**Summary**

The modern metohds and organizations at the lesson of physical culture in V-VI classes are stated in this article. Giving the lessons of the physical culture by meons of modern methods, the applicotion of UKT educationol forms and methods, cretion of the motivatior and the development of physicol training of the pupils.



# İNFORMASİYA TEXNOLOGİYALARI TƏTBİQİNİN MÜASİR VƏZİYYƏTİ

**Samir Həsənov,**
***Azərbaycan Respublikası Təhsil Nazirliyi,***
***5 nömrəli Bakı Peşə Liseyinin İstehsalat təlimi ustası***

***Açar sözlər:*** *informasiya və kommunikasiya texnologiyaları, informasiya cəmiyyəti, internet.*

***Ключевые слова:*** *информационно – коммуникационные технологии, информационное общество, интернет.*

***Key words:*** *information and communication technology, information society, web.*

İnformasiya-kommunikasiya texnologiyaları ölkənin sosial-iqtisadi həyatında mühüm rol oynadığı kimi, onun tətbiqi, təhsil sahəsində də daha qabarıq şəkildə nəzərə çarpır. Mövcud informasiya və rabitə sahələrinin intensiv və yüksək səviyyədə inkişafını, yeni xidmət növlərinin, o cümlədən internetin ölkəmizdə təşəkkül tapması və genişlənməsi ilə səciyyələndirmək olar.

Bilavasitə təhsil və onun ayrılmaz istiqaməti olan peşə təhsili sistemində informasiya cəmiyyətinə keçid və onun qurulması, intellektual potensialın inkişafı sayəsində neft sektorundan sonra prioritet sahə hesab olunan informasiya və kommunikasiya texnologiyaları sahəsi ölkənin sosial-iqtisadi həyatına və təhsil sferasına son illər daha ciddi nüfuz etmişdir. Müasir dövrdə və gələcək perspektivdə İKT-nin əhəmiyyəti qarşılıqsız olaraq ön plana keçir.

Müasir informasiya texnologiyaları, ölkənin hərtərəfli inkişafı, əhalinin intellektinin yüksəldilməsi, həmçinin dünyada baş verən inteqrasiya proseslərinə daha aktiv cəlb olunması istiqamətində respublikamızın qarşısında yeni imkanlar açılır. Son illər ərzində respublikada rabitə və informasiya texnologiyaları sahəsinin inkişafının sürətləndirilməsi, təhsil sferasında da özünü göstərməkdədir və bu məqsədlə mühüm işlər görülmüşdür. Mövcud potensialdan səmərəli istifadə edilməsi, onun inkişaf etdirilməsi, informasiya texnologiyaları sahəsinin formalaşdırılması, təşkili, texniki və kadr baxımından modernləşdirilməsi, və nəticədə informasiya cəmiyyətinə keçidin təmin edilməsinə yönəlmiş mühitin yaradılması təhsil sektorunda aparılan fəaliyyətin ana xəttini təşkil edir.

Peşə təhsili müəssisələrində informasiya texnologiyalarına və xidmətlərinə olan tələbatı ödəmək, paytaxtla regionlar arasında mövcud olan fərqi aradan qaldırmaq məqsədilə internet xidmətinin təşkili nəticəsində, yüksəksürətli qoşulma üsulun-

dan istifadə etməklə internetə çıxış imkanı yaradılmışdır. Konveyer üsulu ilə kompüter istehsal edən ilk kompüter zavodu (K×R) Mingəçevir şəhərində istifadəyə verilmişdir.

Ölkəmizdə enerji sahəsindən sonra informasiya texnologiyaları sektoru daha çox inkişaf etmiş sektordur. Bu gün informasiya texnologiyaları sahəsinin genişləndirilməsi, inkişafı və peşə təhsili sistemində geniş tətbiq olunması üçün böyük imkanlar mövcuddur. Cəmiyyətimiz bu imkanlardan maksimum bəhrələnərək, bu sahəyə inteqrasiyanı özünün ən başlıca vəzifəsi olaraq görür.

Hazırkı dövrdə respublikamızın peşə təhsili sistemində yüksək intellektual səviyyəli və cəmiyyətin digər sahələrində olan kadrlarla rəqabət apara bilən dinləyicilərin yetişdirilməsi mühüm əhəmiyyət kəsb edir. Bu dinləyicilərin İKT-nin imkanlarından geniş və səmərəli istifadə etməsi üçün digər sahələrin gənc kadrları ilə yanaşı onlar da ölkəmizdə həyata keçirilməsi planlaşdırılan "Xalq kompüteri" layihəsindən uğurla yararlanırlar.

Mütəxəssislərin fikrincə, bu layihə-nin reallaşması respublika miqyasında informasiya texnologiyalarının genişmiqyaslı tətbiqinə və ümumiyyətlə, təhsil sektorunun inkişafına yeni təkan verəcəkdir. İnanırıq ki, Azərbaycanın iqtisadi nüfuzunu artıracaq yüksək səviyyəli kadrların hazırlanmasında peşə təhsili müəssisələrinin rolu daha da artacaqdır.

Peşə təhsili müəssisələrinin fəaliyyə-tinin səmərəliliyinin yüksəldilməsi, həm-çinin onların öz aralarında əlaqələrinin asanlaşdırılması və sərbəstləşdirilməsi məqsədi ilə informasiya-kommunikasiya texnologiyalarından istifadə edilməsi müasir dövrün reallıqlarındandır.

Respublikamızın təhsil sistemində və o cümlədən peşə təhsili sahəsində informasiya-kommunikasiya texnologiyalarından istifadənin ümumi səviyyəsi qənaətbəxşdir və onun müasir səviyyədə formalaşdırılması üçün zəmin mövcuddur. BMT-nin 2008-2015-ci illər üçün olan İKT-yə dair hesabatında Azərbaycan 182 ölkə arasında 89-cu yeri tutmuşdur və bu göstərici vəziyyəti əyani nümayiş etdirir. Ölkənin inkişafı naminə informasiya-kommunikasiya texnologiyaları üzrə Milli Strategiya hazırlanmış (2003-2012-ci illər) və bu strategiyanın həyata keçirilməsi ilə həmin dövrdən sonrakı illərdə müxtəlif sahələrin inkişaf etdirilməsi üzrə qəbul edilmiş çoxsaylı Dövlət Proqramlarında İKT-nin tətbiqinə, sahədə idarəetmənin səmərəliliyinin, göstərilən xidmətlərin daha keyfiyyətli təşkilinə yönəlmiş məqsədyönlü tədbirlər nəzərdə tutulmuşdur. Bu işlər kompleks şəkildə bir-birini tamamlayaraq, az bir vaxtda dünyanın inkişaf etmiş dövlətləri səviyyəsinə yüksəlmək üçün zəmin yaratmışdır.

Azərbaycan Respublikası Prezidentinin 2004-cü il 29 dekabr tarixli 172 nömrəli Fərmanına uyğun olaraq, Respublikanın təhsil sistemində və o cümlədən peşə təhsili sahəsində informasiya təhlükəsizliyinin təmin edilməsi üzrə çoxsaylı tədbirlər həyata keçirilmiş və bu sahədə olan keyfiyyət göstəriciləri və internet informasiya resurslarından istifadəyə olan diqqət xeyli artırmışdır.

Demək olar ki, peşə təhsili müəssisələrinin əksəriyyəti internet informasiya resurslarına malikdirlər və onlardan tələbələri məlumatlandırmaq, təhsilin keyfiyyətini artırmaq və digər informasiya xarakterli xidmətlər göstərmək üçün istifadə edirlər. 2000-ci ildən başlayaraq dövlət qurumlarında "gov.az" domenindən istifadə edilir və bu informasiya resurslarının sistemli qaydada təşkilinə və istifadəsinə şərait

yaradılır.

Artıq abituriyentlərin və magistrlərin qəbul imtahanlarına ərizələrinin verilməsi, elektron məktubla müxtəlif dövlət orqanlarına müraciətlərin edilməsi, məlumatların alınması həyatımızın reallığıdır. Bir çox sahələrdə yaradılmış informasiya sistemləri ölkə ərazisindəki sahədaxili bütün qurumları əhatə edir. Təhsil, sosial müdafiə və digər sahələrdəki mövcud sistemlər bunlara misaldır.

2005-ci ilin iyul ayından həyata keçirilməsinə başlanmış və Azərbaycan hökumətinin və BMT-nin İnkişaf Proqramının birgə layihəsi olan "Milli E-İdarəçilik şəbəkəsi" (AzDataCom) Bakı və Sumqayıt şəhərləri, Abşeron rayonu və Gəncə şəhəri istiqamətində olan 8 bölgə üzrə informasiya xidmətləri göstərməkdədir. Bu layihənin tam başa çatması nəticəsində respublikanın bütün bölgələrini əhatə edəcək şəbəkə infrastrukturu yaradılacaq və regionlarda İKT-dən istifadə imkanları daha da artacaqdır.

Yuxarıda deyilənlərə əsaslanaraq deyə bilərik ki, İKT-nin tətbiq edilməsi, təhsil sistemində, həmçinin onun bir qolu olan peşə təhsili sahəsində çalışan tələbələrin və mütəxəssislərin öz aralarında və dövlət orqanları ilə təmaslarının sadələşdirilməsinə, daha münasib formaya çevrilməsinə və çevik həyata keçirilməsinə əlverişli şərait yaradacaqdır.

Azərbaycanda İKT-nin inkişaf dinamikası, beynəlxalq qurumlarla uğurlu əməkdaşlıq nümunələri, yüksək texnologiyaya əsaslanan iqtisadiyyatın formalaşması üzrə qarşıya qoyulan vəzifələr, dövlət siyasətinin tərkib hissəsi kimi İKT sahəsinə göstərilən böyük diqqət və qayğı ölkəmizin yaxın gələcəkdə yüksək texnologiyalar sahəsində böyük uğurlar qazanacağına zəmanət verir.

***Rəyçi: dos. Ş.Balakişiyev***

## İstifadə edilmiş ədəbiyyat

1. Qurbanov A., Hüseynova A., Məmmədov E. Kompüter texnikası və proqramlaşdırma. Bakı, 2010.

2. Abbasova Y. Verilənlərin, biliklərin strukturu və modeli (mühazirələr).

3. Əliyev Ə., Əliyev A., Kazımov C. İnformatikanın əsasları. Bakı, 2008.

4. Əliyev Ə., Kazımov C. Kompüterin arxitekturası və əməliyyat sistemləri. Bakı: BDU, 2007.

5. Mənsimov K., Feyziyev F., Aslanova N. Kodlaşdırma nəzəriyyəsi. Bakı: Bakı Dövlət Universiteti, 2009.

**С.Гасанов**

**Современное состояние применения информационных технологий**

**Резюме**

Информационные и коммуникационные технологии играют важную роль в социально-экономической жизни страны, а также его применение в области образования можно увидеть более четко. Существующие информационные и коммуникационные поля, а также высокий уровень интенсивного развития, новых услуг, в том числе в Интернете и могут быть охарактеризованы формирования и расширения.

Образование и профессиональная система обучения, которая является неотъемлемой частью прямого перехода к

информационному обществу и его создания, после того, как нефтяной сектор за счет развития интеллектуального потенциала информационно-коммуникационных технологий рассматривается в качестве приоритетных направлений социально-экономической жизни и сфере образования в последние годы проникла более серьезным. Важность ИКТ в наше время, так и в долгосрочной перспективе пропуском на первый план в качестве безвозмездного.

Современные информационные технологии, всестороннее развитие страны и улучшение интеллекта людей, а также более активное участие в интеграционных процессах в мире, открывает новые возможности в стране. В последние годы развитие информационных и коммуникационных технологий в стране, которая проявляется в сфере образования и значительная работа была проделана с этой целью. Использование существующего потенциала, его развития, информационных технологий, формирование организации с точки зрения технических и людских ресурсов модернизации, и в конечном итоге переход к информационному обществу в сфере образования для обеспечения среды является основным направлением деятельности.

**S.Hasanov**

**The current state of the use of information technologies**

**Summary**

Information and communication technologies play an important role in socio-economic life of the country, as well as its application in the field of education can be seen more clearly. Existing information and communication fields, and a high level of intensive development, new services, including the Internet and can be characterized by the formation and expansion. The importance of ICT in modern times, and in the longer term pass to the fore as gratuitous. Modern information technologies, the country's comprehensive development and improvement of people's intellect, as well as a more active involvement in integration processes in the world opens up new opportunities in the country. In recent years, development of information and communication technologies in the country, manifested in the sphere of education and significant work has been done to this end. The use of the existing potential, its development, information technologies, forming the organization in terms of technical and human resources modernization, and eventually transition to an information society in the education sector to ensure the environment is the main line of activity.



# MƏKTƏBƏQƏDƏR HAZIRLIQ QRUPLARI TƏHSİL ÜÇÜN TÖHFƏDİR

**Tünzalə Bağırova,**
***Şamaxı şəhəri, E.Hüseynov adına 2 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *uşaq, nailiyyət, təlim, inkişaf, məktəbəqədər hazırlıq, qoyulan tələblər, müəllim.*

***Ключевые слова:*** *ребёнок, достижение, обучение, развитие, дошкольное воспитание, поставленные требования, учитель.*

***Key words:*** *child, achievement, traning, development, preschool teaching, demands required, teacher.*

Məktəbəqədər təhsil təhsilin ilk pilləsi olmaqla uşaqların erkən yaş dövründən intellektual, psixi inkşafını, sadə əmək vərdişlərinə yiyələnməsini, istedad və qabiliyyətinin üzə çıxarılmasını, sağlamlığın qorunmasını, estetik tərbiyəsini, təbiətə və insanlara həssas münasibətin formalaşmasını təmin edir. Danılmaz həqiqətdir ki, maddi sərvətlərin insan kapitalına çevrilməsinin təməli məhz məktəbəqədər təhsil müəssisələrində qoyulur. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında qeyd edilmişdir: "Təməl bacarıqlar uşaqlıq dövrünün ilk illərindən əldə edildiyinə görə uşaqların zehninin erkən yaş dövründən inkişaf etdirilməsi vacibdir. Bu səbəbdən məktəbəqədər təhsilin inkişafı dövlət siyasətində əhəmiyyətli yer tutur". Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 11 iyul 2016 – cı il tarixli 271 nömrəli qərarı məktəbə hazırlıq təhsilinin icbariliyinin təmin olunmasına istiqamətlənmişdir. Məktəbəqədər yaşlı uşağın təhsili onun inkişafının süni surətdə tezləşməsinə deyil, zənginləşdirilməsinə xidmət etməlidir.

Məktəbə hazırlığın əsas məqsədi beşyaşlı uşaqların tələb və imkanlarını nəzərə almaqla onların məktəbə hazırlıq mərhələsində inkişafı, tərbiyəsi və təhsili prosesini təşkil etməkdir. Məktəbə hazırlığın vəzifələri uşaqlarda oxumaq həvəsinin, onların məktəbə müsbət emosional münasibətinin inkişaf etdirilməsi və möhkəmləndirilməsi, uşaqların məktəbə müvəffəqiyyətlə adaptasiya olunması üçün onlarda şəxsi – sosial xüsusiyyətlərin formalaşdırılmasıdır.

Verilən vəzifələrin həyata keçirilməsi ilk növbədə müəllimin üzərinə düşür. 5 yaşlı uşaqlarla işləyən müəllimin məktəbə hazırlığın təşkili qaydalarını bilməsi çox vacibdir. Bunları aşağıdakı kimi qruplaşdırmaq olar:

- məktəb təliminə hazırlanan uşaqların psixoloji və psixofizioloji xüsusiyyətlərin öyrənilməsi;
- məktəbəqədər yaşlı uşaqların müvəffəqiyyətli təhsil və tərbiyəsinin təşkili əsaslarının müəyyənləşdirilməsi;
- gələcək birinci sinif şagirdlərinin şəxsi keyfiyyətlərinin aşkara çıxarılması;
- uşaqların inkişafının izlənilməsi üçün müşahidə gündəliklərinin aparılması;
- istedadlı uşaqların aşkara çıxarılması, onların potensial imkanlarının inkişaf etdirilməsi məqsədi ilə hər bir uşağın fərdi –

psixoloji xüsusiyyətlərinin öyrənilməsi istiqamətində müvafiq işlərin aparılması.

Uşağın məktəb təliminə hazırlığı zamanı, hər şeydən əvvəl, onun aşağıdakıları əhatə edən fiziki, şəxsiyyətyönümlü, intellektual və sosial hazırlığı nəzərdə tutulmalıdır. Bunun üçün bir sıra tələblərin nəzərə alınması çox mühimdir:

1 - ci tələb: 5 yaşlı uşaqların fərdi xüsusiyyətləri, bəzilərində görmə yaddaşı, digərlərində emosional, başqasında mexaniki yaddaş daha yaxşı inkişaf edir. Hazırlıq zamanı uşağın bütün yaddaş formalarının inkişafına diqqət etmək lazımdır. Bununla belə düşüncə fəaliyyətinə və başadüşmə, anlama qabiliyyətinin inkişafına xüsusi diqqət yetirilməlidir.

2 – ci tələb: Məktəbəqədər hazırlıq zamanı 5 yaşlı uşaqlar yeni biliklər öyrənməyə çox meyilli olurlar. Bu yaşda olanlar:

• 10 – a qədər saymağı, toplamanı, çıxmanı, bacarmalı;

• həndəsi fiqurları – kvadrat, düzbucaqlı, dairə, üçbucaq, romb, kub, və s. fərqləndirə bilməli;

• “ + ” , “ - ” , “ = ” , “ › ” , “ ‹ ” , işarələri bilməli;

5 yaşında uşağın söz ehtiyatının 3000 sözə qədər olmağı nəzərə alınmaqla onlar 5 - 6 sözdən ibarət cümlələr qura bilməlidirlər.

3 – cü tələb: Psixoloqlar qeyd edir ki, uşağın şəxsiyyəti 5 -7 yaş arası formalaşır. Bu dövrdə valideynlər və müəllimlər uşaqda düzgün hesab etdiyi xüsusiyyətləri inkişaf etdirə bilərlər. Bunun üçün ən gözəl vasitə uşağa nümunə olmaqdır. Bu yaşda olanlar duyğularını açıq-aşkar bəlli edir, dost seçirlər. Onlarda təxəyyül formalaşmağa başlayır. Bəziləri bunu uşağın yalanı kimi qəbul edirlər. Lakin onu yalan yox, uşağın fantaziyası kimi qəbul etmək lazımdır.

4 – cü tələb: Hər bir uşağın izləmə gündəliyi olmalı, onların təlim və tərbiyədə irəliləyişlərini qeyd etmək vacibdir. İnkişafın izlənilməsi və dəyərləndirilməsi uşaqların ümumi inkişafına və təlimin səmərəliliyinə təkan verərək, onların təlim fəaliyyətlərini təkmilləşdirir. Erkən yaşlı uşaqların normal inkişafı üçün onların fəaliyyətinin müntəzəm izlənilməsi vacib şərtlərdəndir. İzlənilmədə əsas məqsəd uşaqların xüsusi ehtiyaclarını üzə çıxarmaqla, onların inkişaf dinamikası haqqında düzgün qərarların verilməsi, inkişafda geriqalmalar müşahidə olunan uşaqların xüsusi ehtiyaclarının təmin olunmasıdır. Uşaqların inkişafının izlənilməsi fasiləsiz proses olmaqla yanaşı müşahidə və məlumatların toplanması, qeydlərin aparılması, nəticələrin sənədləşdirilməsi və uşaq haqqında məlumatların bölüşməsidir.

5 – ci tələb: Məktəbəqədər yaş dövründə uşaqların potensial imkanlarının inkişaf dövrü olduğundan onların istedadı aşkar olunur. Təbii ki, müəllimlər istedadlı uşaqları aşkara çıxarıb, onlara dəstək olmalıdırlar.

6 – cı tələb: Hər şeydən əvvəl, məktəb təliminə hazırlığı zamanı uşağın fiziki, şəxsiyyətyönümlü, intellektual və sosial hazırlığı nəzərdə tutulmalıdır.

Məktəbəqədər hazırlığın təşkili üçün qoyulan tələblərə əsaslanaraq qeyd etmək lazımdır ki, 5 yaşda məktəbə qədəm qoyanları körpə deyil, uşaq adlandırmaq olar. Bu isə uşaqların məktəbəqədər dövrü adlanır. Bu dövrdə qoyulan tələblərə əsaslanaraq uşağın ümumi inkişafı, yaş səviyyəsinə uyğun bilik ehtiyatına malik olması, özünəxidmət vərdişlərinə yiyələnməsi, ünsiyyətə girə bilmək bacarığı, nitqə yiyələnməsi, eləcə də, oxumağa arzu və marağının artırılmasına nail olmaq lazımdır. Burada qavrayış, diqqət, hafizə, təfəkkür, nitq, iradə və s. kimi əsas psixi funksiyaların inkişaf səviyyəsi xüsusi yer tutur.

Bəs məktəbdə psixoloji hazırlıq üçün bütün bu qeyd olunanların inkişaf səviyyəsi necə olmalıdır?

Burada birinci növbədə sensor (duyğu və qavrayışın) inkişafının müvafiq səviyyədə olması zəruridir. Uşağın qavrayışının seçiciliyi, mənalılığı, predmetliliyi lazımi səviyyədə olmalıdır. Məktəbə daxil olan uşaq cisimlərin və onların xassələrinin identikliyini müəyyənləşdirməyi bacarmalıdır. Təcrübə göstərir ki, çox vaxt məktəbə daxil

olan uşaqlarda bu cür bacarıq, başqa sözlə, qavradıqları cisimləri məqsədəuyğun təhlil və fərqləndirmə bacarığı formalaşmadığına görə təlimdə ciddi çətinliklərlə qarşılaşırlar. Ona görə də təlim fəaliyyəti prosesində uşaqlarda həmin bacarıqları formalaşdırmaq, onları müşahidə etməyə alışdırmaq zəruridir. Uşağın qavrayışının seçiciliyi, mənalılığı, predmetliliyi lazımi səviyyədə olmalıdır.

Təhsildə əsas dəyər uşaqdır. Məktəbəqədər yaş dövrü isə təkcə məktəb həyatına hazırlıq mərhələsi deyil, eyni zamanda insan həyatının ən məsuliyyətli, ən mühüm yaş dövrüdür ki, bu dövrdə insanda bütün mənəvi dəyərlərin təməli qoyulur.

Məktəbəqədər təhsilin keyfiyyəti uşaqların təlim və tərbiyə prosesinin vəziyyəti və nəticəliliyi ilə müəyyən edilir. Müasir təhsildə uşağın fərdi inkişafını qəbul edən ən təbii yanaşma şəxsiyyətyönümlü yanaşma hesab olunur. Şəxsiyyətyönümlü model uşaqların emosional, sosial və idraki inkişafına eyni dərəcədə əhəmiyyət verir. Belə yanaşma uşağın nəinki ibtidai təlimində, eyni zamanda uzunmüddətli perspektivdə daha yaxşı nəticələr verir. Belə ki, uşaqlar təşəbbüskar, yaradıcı, müstəqil, özünə inamlı böyüyürlər. Əsas onu anlamaq lazımdır ki, hər bir gələcək birinci sinif şagirdində müvafiq daxili mövqe formalaşdırılsın.

Beləliklə, məktəbəqədər hazırlıq kursları müəllimlərə uşaqların inkişafını, bacarıqlarını, ehtiyaclarını və maraqlarını müntəzəm olaraq izləməklə nailiyyətlərini dəyərləndirmək üçün geniş imkanlar yaradır. Müəllimlər dəyərləndirmənin nəticələri əsasında öz tədris fəaliyyətlərini elə planlaşdırmalıdırlar ki, təlim və təlimdənkənar fəaliyyət zamanı uşaqların stimullaşmasına, psixofizioloji, emosional, idraki qabiliyyətlərinin təkmilləşməsinə nail ola bilsinlər.

***Rəyçi: prof. M.İlyasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Məktəbəqədər təhsilin dövlət standartı və proqramı. 11 iyul, 2016.

2. Cəfərova L. Məktəbəqədər təhsilin bəzi xüsusiyyətləri. 24 oktyabr, 2013.

3. Məktəbəqədər tədris və təlimdən gözlənilən nəticələr: keyfiyyət standartları. Nyu Cersi, 2004.

**Т .Багирова**

**Группа дошкольного обучения, вклад в образование**

**Резюме**

В статье говорится о развитии дошкольного образования, о том, как современное интерактивное обучение даёт толчок развитию мышления, самостоятельной деятельности детей раннего возраста, и о том, что оно играет большую роль в ускорении их развития, а также в развитии интеллекта детей. Указываются условия и требования необходимые при учёте наблюдения и оценивания проведённого с целью психофизиологического, эмоционального развития, в целом, повышения интеллекта детей раннего возраста.

**T.Bagirova**

**Preschool training groups contribute to education**

**Summary**

The article describes the development of pre-school education and the role of modern interactive teaching in the cognitive development, autonomy and intellectual enhancement of pre-schoolers. The autor gives her view on the importance of conditions and requirements for monitoring and evaluating pre-schoolers psycho-physiological” emotional and intellectual development.



# ŞAGİRDLƏRİN İDRAK FƏALLIĞININ ARTMASINDA İKT-NİN ROLU

**Ülviyyə Ələkbərova,**
***Hacıqabul şəhər 8 nömrəli humanitar fənlər təmayüllü məktəb-liseyin müəllimi***

Məqalədə müasir məktəbdə İKT-nin rolundan danışılır. Bu sahədə görülən işlər xatırlanır və İKT-nin dərsdə tətbiqinə dair şərhlər verilir.

***Açar sözlər:*** *informasiya texnologiyası, idrakın inkişafı, tətbiq, pedaqoji qabiliyyət.*
***Ключевые слова:*** *информационные технологии, развитие технологии, применение, педагогическая способность.*
***Key words:*** *information technology, development of knowledge, application, teaching ability.*

İKT-dən istifadə müasir cəmiyyətdə təhsilin vacib köməkçilərindən birinə çevrilmişdir. İnformasiya texnologiyalarının inkişafı tədris prosesində əvvəlki texnologiyalardan fərqli olaraq görülməmiş imkanlar açmışdır.

Yeni kompüter texnologiyaları fənlərin tədrisi prosesinə yeni keyfiyyətlər gətirir, həm də ümumilikdə təhsil sisteminin idarə olunmasında əhəmiyyətli rol oynayır. İndi cəmiyyətin tələbi budur ki, təhsilalanlar zəruri İKT biliklərinə və bacarıqlarına malik olmalıdırlar. Onlar elektron tədris vəsaitlərindən, multimedia və interaktiv alətlərdən istifadə etməyə yiyələnməlidirlər. Bu mənada ölkə Prezidentinin Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında Ümumtəhsil məktəblərinin İKT ilə təminatı planı Proqramı” ümumtəhsil inkişafında çox böyük tarixi əhəmiyyət kəsb etmişdir. İKT vasitələrinin pedaqoji inkişafı o qədər genişdir ki, bütün fənlərin tədrisində ondan istifadə etmək olar. Ona görə də, təhsil sahəsinin informasiyalaşdırılmasına inkişafın tələbi kimi yanaşılmalıdır.

Hazırda ictimai həyatımızın bütün sahələrində informasiya-kommunikasiya texnologiyalarının rolu gündən-günə artır. Dünyada insanların əksəriyyəti müxtəlif məqsədlər üçün kompüterdən istifadə edirlər. Kompüterin təhsil sahəsinə inteqrasiyası və uğurlu tətbiqi isə təkcə onların əldə edilməsindən deyil, həm də istifadəçilərin onlardan nə dərəcədə tanış olmalarından asılıdır. İKT-nin inkişafı hər bir ölkənin intellektual və elmi potensialının əsas göstəricilərindən biridir.

Bu gün pedaqoji prosesin təşkilində səmərəliliyin artırılmasında kompüter texnikası son dərəcə mühüm imkanlara malikdir. Çünki ənənəvi təlim üsulları didaktik problemləri tam həll etməyə qadir deyil. Şagirdlərin şəxsi keyfiyyətlərinin nəzərə alınmasında, onların təhsildə fəal iştirakının

təmin edilməsində yeni təhsil sistemi mühüm rol oynayır.

Azərbaycan Respublikasında da informasion cəmiyyətin qurulması və kompüterləşmə sahəsində uğurlu addımlar atılmışdır. Bu sahədə həyata keçirilən dövlət siyasətinin ümdə vəzifələrindən biri İKT-nin cəmiyyətin müxtəlif sahələrində, xüsusilə də təhsil sistemində geniş tətbiqi məsələsidir.

Bu məqsədlə ölkəmizdə aparılan təhsil islahatları ilə əlaqədar olaraq əsaslı işlər görülmüş: orta ümumtəhsil müəssisələri kompüter və pedaqoji proqram vasitələri (PPV) ilə təchiz edilmiş, müəllimlərin xeyli hissəsinin kompüter savadına yiyələnməsi təmin olunmuşdur.

Təsadüfi deyil ki, ümummilli lider Heydər Əliyev tərəfindən İKT-nin 2012-ci illərə qədər cəmiyyətin müxtəlif sahələrində tətbiqi ilə bağlı "Azərbaycan Respublikasının inkişafı naminə informasiya və kommunikasiya texnologiyaları üzrə Milli Strategiya" (2003-2012-ci illər) adlı sənəd qəbul edilmişdir.

İKT biliyinə mükəmməl yiyələnməyin ən yaxşı yolu isə təbii ki, orta məktəbdən başladığı üçün bu siyasətin mühüm vəzifələrindən biri İKT-nin təhsilə tətbiqidir.

İKT-dən məktəblərdə müxtəlif məqsədlər üçün istifadə oluna bilər. Bunlardan biri də şagirdlərdə idrak fəallığının artırılması, onlarda müstəqil fikirliliyin təmin olunmasıdır. Şagirdin aldığı bilik o zaman möhkəm olur ki, şagird biliyə maraq göstərir, aldığı biliyin məntiqini dərk edir, təhlillər, müqayisələr, ümumiləşmələr aparır. Bu isə şagirdi yaradıcı fəaliyyətə sövq edir.

Şagirdlərdə idrak fəallığının artması bir tərəfdən müəllimin sövqedici üsullarına əsasən, digər tərəfdən də müasir informasiya texnologiyalarının tətbiqi ilə əldə edilə bilər. İnformasiya texnologiyalarının tədris və öyrənmə prosesinin səmərəliliyində rolu ona görə əhəmiyyətlidir ki, o, əyaniliyi ifadə edir. Şagirdlər aldıqları məlumatlara və biliklərə dair fakt və hadisənin, prosesin, əşyanın, təsvirlərin həqiqi, yaxud oxşar surətlərinin göz önündə canlandırılması şagirdlərdə həm təlimə maraq və məsuliyyət oyadır, həm də onları yaddaşlarında daha möhkəm saxlayırlar. Üstəlik, şagirdlər fakt və hadisələrdən daha yaxşı baş çıxarır, biliyi şüurlu şəkildə mənimsəyir, aldıqları bilikləri təcrübəyə daha fəal tətbiq edirlər. Bundan başqa informasiya texnologiyaları az vaxt ərzində çoxlu informasiya verməklə vaxta qənaət etmiş olur, eyni zamanda şagirdlərin gündəlik qiymətləndirilməsinə kömək edir.

İKT-nin tətbiqi zamanı dərsin məqsədi əsas götürülməli, ona uyğunlaşdırılmalı, müəllim proqramı aydın və maraqlı şəkildə öyrətməyə, inkişaf etdirməyə çalışmalıdır. Bu sahədə informasiya texnologiyaları müəllimin ən yaxşı köməkçisidir.

Qlobal dünyanın informasiya bolluğu şəraitində məktəbin, təhsilin vəzifəsi dəyişir. Ağılın, intellektin inkişaf etdirilməsi ön plana keçir. Dünyanın təhsil məkanında sadəcə bilik, bacarıqlar deyil, dəyərlər, səriştələr şəxsiyyətin inkişafında mühüm atributlar kimi qəbul edilir. Buna görə digər ölkələr kimi Azərbaycan Respublikasında da təhsil sahəsində islahatlar aparılmışdır. Ulu öndər Heydər Əliyev demişdir:

"Fərdi təhsil sistemində islahatların əsas məqsədi ondan ibarətdir ki, Azərbaycan təhsil sistemi dünya təhsil sisteminin standartlarına uyğunlaşsın".

Azərbaycan Respublikası özünün təhsil sistemini dünyanın ən qabaqcıl ölkələrinin təhsil prinsiplərindən istifadə etməklə təkmilləşdirir, məzmun və struktur dəyişiklikləri aparır. Son dövrlərdə beynəlxalq miqyasda əldə olunan nailiyyətlərimiz, şagirdlərin qazandıqları uğurlar apardığımız təhsil islahatlarının qlobal xarakterinin dərin özül

üzərində olduğunu sübut edir. Müasir dərs, müasir təhsil sisteminin inkişafında kurikulumlar hazırlanır və dərsin keyfiyyətinə müsbət mənada təsir göstərir. Dərslərin səmərəli və keyfiyyətli keçməsində valideyn münasibəti də ön plana çəkilir. Pedaqoji qabiliyyət həlledici rol oynayır.

Məktəbə həvalə olunmuş ümumtəhsil vəzifələrinin bir hissəsi coğrafiya fənninin üzərinə düşür. Coğrafiya fənninin tədrisində əyani vəsaitlərin rolu böyükdür.

Əyani vəsait olmadan coğrafiya dərsini mənimsətmək qeyri-mümkündür. Sinifdə əyani vəsait çox olduqda şagird dərsi daha da dərindən mənimsəyə bilir. Dərsin keyfiyyətli keçməsində kompüter vasitəsi ilə disklərə tamaşa etmək, onu müzakirə etmək, bu fənnə şagirdlərdə maraq yaratmaq üçün qiyabi dünyaya səyahətə çıxmaq əsas sayılır. Ən böyük məqsəd, yaşadığımız planetdə baş verən hadisələri müasir İnformasiya-Kommunikasiya Texnologiyaları vasitəsilə şagirdlərə mənimsətməkdir. Müəllim şagirdlərdə analitik, məntiqi tənqidi, yaradıcı təfəkkürün inkişafında əvəzolunmaz rola malikdir.

Azərbaycan təhsilində aparılan yeni islahatın şəxsiyyətyönümlü xarakterdə olması gənc nəslin hərtərəfli bilik və bacarıqlara malik vətəndaş kimi formalaşmasını tələb edir. İnformasiya əsri adlanan XXI əsrin müəllimi daima axtarışda olmalı, gənc nəsli cəmiyyət üçün məntiqi təfəkkürə malik müstəqil düşünməyi, münasibət bildirməyi bacaran şəxsiyyət kimi yetişdirməlidir. Əgər müəllim özü ilə yeniliklər, yeni ideyalar gətirərsə uşaqların inkişaf etdiyi vətəndaş kimi formalaşdığı təhsil mühitində təkcə təlim prosesinin iştirakçıları deyil, o cümlədən məktəbin administrasiyası, valideynlər də dəyişir, inkişaf edir.

Məhz buna görədir ki, cəmiyyətin gələcəyi bu gün məktəb partaları arxasında əyləşən uşaqlarından, onların vətəndaş mövqeyindən, vətənin taleyinə görə daşıdıqları məsuliyyət hissindən asılıdır. Bütün bunları nəzərə alsaq deyə bilərik ki, İKT-nin təhsilə tətbiqi şagirdlərin formalaşmasına təsir edən, onların idrak fəallığının artmasına kömək edən yüksək mahiyyətli məsələdir.

***Rəyçi: p.ü.f.d. E.Məmmədova***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. Bakı, 2009.

2. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.

3. Təhsilin konseptual problemləri. Bakı, 2008.

4. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). Kurikulum, 2010, №3.

5. Məmmədov Ə., Məmmədov F. Fiziki idrakda formallaşdırma və onun idraki funksiyaları. Azərbaycan məktəbi, 2017, №1.

6. Ахмедова Т. Проблемы информатики в школе. Fizika, riyaziyyat və informatika tədrisi, 2017, №1.

**У.Алекперова**

**Роль ИКТ в увеличении познавательных способностей у учащихся**

**Резюме**

В статье описывается роль ИКТ в школе. Напоминаются проделанные работы в этой области, а также комментируется использование ИКТ на уроках.

**U.Alakbarova**

**The role of ICT in developing students’ cognitive activity**

**Summary**

The article deals with the formation of a student identity based on the teacher's own experience.



# MƏKTƏBDƏ METODİKİ İŞLƏRİN TƏŞKİLİ

**Hikmət Camalov,**
***Abşeron-Ceyranbatan peşə liseyinin fənn müəllimi, peşə hazırlığı üzrə metodkomissiyanın sədri***

Məqalədə peşə liseylərində metodiki işlərin təşkili və idarə olunmasından bəhs edilir. Müəllif öz fikirlərini gündəlik təcrübə ilə əsaslandırmışdır.

***Açar sözlər:*** *prioritet, istehsalat təlimi ustaları, metodşura, açıq dərs.*
***Ключевые слова:*** *приоритет, мастер обучения производству, методсовет, открытый урок.*
***Key words:*** *priority, industrial training masters, methodical council, open lessons.*

Ölkəmizdə həyata keçirilən təhsil siyasətinin prioritet istiqamətlərindən biri də peşə təhsili pilləsinin modernləşdirilməsi və inkişafı, müasir tələblər səviyyəsində kadr hazırlığı prosesini yaxşılaşdırmaqdır. Azərbaycanda müasir sosial-iqtisadi infrastrukturun yaradılmasında texniki peşə təhsilinin müstəsna rolunu nəzərə alaraq, bu təhsil pilləsində bazar iqtisadiyyatının tələblərinə uyğun sənət və peşələr üzrə ixtisaslı kadr hazırlığını təmin etməkdir.

Təcrübə göstərir ki, peşə liseylərində çalışan ixtisas fənn müəllimlərinin və istehsalat təlimi ustalarının metodik yardıma daha çox ehtiyacları olur. Belə ki, hər hansı bir ixtisas fənn müəllimi və ya istehsalat təlimi ustasının peşə biliyi yüksək, lakin metodik hazırlığı zəifdirsə, onda həmin müəllimin və ya istehsalat təlimi ustasının dərslərində peşələrin mənimsənilməsi qənaətverici olmur. Bazar iqtisadiyyatı şəraitində hər bir sahibkar çalışır ki, onun işə götürdüyü hər kəs peşəsini kamil bilsin, ona tapşırılmış işləri sərbəst yerinə yetirsin. Ona görə də, buna məsul olan şəxslərin, yəni peşələrin sirlərini öyrədən müəllim və ustaların mükəmməl peşə biliyi və eyni zamanda mükəmməl pedaqoji və metodiki hazırlığı olmalıdır. Kamil sənətkarı yalnız bu iki hazırlığı özündə cəmləşdirən usta və müəllim yetişdirə bilər. Ona görə də liseyimizdə təşkil olunan metodik işlərin günün və zamanın tələblərinə uyğun qurulmasına ardıcıl diqqət yetirilir. Sovetlərdən qalan peşə təhsilində fəaliyyət göstərən müəllimlər və istehsalat təlimi ustaları ənənəvi təhsildən də faydalanırlar. Amma elə məsələlər var ki, onlara yenidən nəzər salmaq lazım gəlir, aktuallıq daşımayan bir çox stereotiplərdən yaxa qurtarmaq tələb olunur. İqtisadiyyatımızın bir çox sahələri yeniləşmiş, müasirləşmiş texnologiyalara söykənmişdir. Təhsil sahəsi və onun bir pilləsi olan ilk peşə-ixtisas təhsili də zamanla ayaqlaşaraq dəyişilməyə, təkmilləşməyə möhtacdır. Ölkəmiz müstəqillik əldə edəndən sonrakı ötən müddət ərzində təhsildə, o cümlədən peşə təhsilində yeniləşmə

istiqamətində az işlər görülməyib. Bu yeniləşmələr ixtisas fənn müəllimlərindən və istehsalat təlimi ustalarından pedaqoji bacarıqlarının təkmilləşdirilməsini tələb edir. Liseyimizin müəllimləri və ustaları bu məqsədlə mütəmadi olaraq ixtisasartırma kurslarına göndərilir və həmin kurslarda öz pedaqoji ustalıqlarını artırırlar. Əbəs deyil ki, onlar ixtisasartırma kurslarından pedaqoji hazırlıqla qayıdırlar. Bu fikirləri söyləməyi bizə imkan verən səbəb kurslardan qayıtdıqdan sonra həmin müəllimlərin dərslərinin dinlənilməsi və təlimlərdəki müsbət istiqamətlərin müşahidə edilməsidir. Müşahidələr göstərir ki, müəllimlərimiz dərslərdə fəal təlimə çox böyük üstünlük verirlər, çünki fəal təlimdə əsas cəhətlər müəllim tərəfindən şüurlu surətdə problemlərin həlli prosesində şagirdlərin fəal tədqiqatçı mövqeyinin stimullaşdırılması, şagirdlər üçün yeni və eyni zamanda zəruri olan biliklərin əldə olunmasına şəraitin yaradılmasıdır. Şagirdlər də bu cür təlimə çox böyük maraq göstərirlər. Doğrudan da, müəllimlərimizin böyük əksəriyyəti çalışırlar ki, dərslərini dünya təhsil sistemində daha çox istifadə edilən və yüksək səmərə verən müasir təlim texnologiyalarına istinadən qursunlar.

Liseyimizdə metodik işlərlə lisey metodşurasında birləşməklə ümumtəhsil fənləri və ixtisas fənləri üzrə metodkomissiyalar məşğul olur. Hər metodkomissiya da öz növbəsində bir neçə fənn metodbirləşmələrini özlərində cəmləşdirir. Metodşuraya təlimata uyğun olaraq liseyin tədris istehsalat işləri üzrə direktor müavini rəhbərlik edir, metodkomissiya sədrlərini isə liseyin pedaqoji şurası seçir və təsdiq edir. Metodşura qrafikə əsasən öz yığıncaqlarını keçirir. Bu yığıncaqlarda metodşuranın və metodkomissiyaların işləri müzakirə olunur, müəllimlərə və istehsalat təlimi ustalarına metodiki və pedaqoji tövsiyələr verilir, pedaqoji aləmdə baş verən yeniliklərlə onlar tanış edilir, onları maraqlandıran digər məsələlərə aydınlıq gətirilir. Qeyd etmək istəyirəm ki, müəllimlərimiz və istehsalat təlimi ustalarımız hər hansı bir mövzunun müzakirəsində fəal iştirak edirlər. Bununla yanaşı metodşuranın və metodkomissiyaların işləri hər müzakirədən sonra qiymətləndirilir. Ən azından anket sorğular keçirilir. Məsələn, bugünkü müzakirədən yeni nə öyrəndiniz? Nə sizə daha maraqlı göründü? Müzakirəni səmərəli hesab etdinizmi? və s. Müzakirələrə çıxarılan məsələlər çalışılır ki, müəllimlərin və istehsalat təlimi ustalarının ehtiyaclarına ünvanlansın.

Metodkomissiyalar tərəfindən hər bir müəllimdən və istehsalat təlimi ustasından nələrə ehtiyaclarının olması öyrənilir, sistemləşdirilir və onların həlli yollarına dair işlər görülür.

Ən vacib işlərdən biri də müəl-limlərin açıq dərslərinin təşkili və keçirilməsidir. Açıq dərs cədvəlinin tərtibi və təsdiqi ən vacib məsələlərdəndir. Cədvəl dərs ilinin əvvəlində metodbirləşmələrin təqdimatına əsasən liseyin tədris istehsalat işləri üzrə direktor müavini tərəfindən tərtib olunur və məktəbin münasib bir yerindən asılır. Müəllim nəzərdə tutulan açıq dərsin planını əvvəlcədən tərtib edir. Planda dərsin məntiqi quruluşu, didaktik prinsipləri, əsas anlayışlar, o cümlədən aşılanacaq bacarıq və vərdişlərin həcmi özünün dəqiq və yığcam ifadəsini tapmalıdır. Müəllim plan əsasında dərsə ciddi hazırlaşmalı, ən səmərəli vasitə və metodlardan bacarıqla istifadə etməyə çalışmalıdır. Bu zaman vacib olan odur ki, dərsi dinləyəcək müəllimlər onun başlanmasına bir saat qalmış metodmərkəzdə toplanırlar və açıq dərsi deyəcək müəllimlə aşağıda qeyd olunan suallar ətrafında söhbət-sorğu aparırlar:

• Bugünkü dərsin məqsədi nədir?
• Məqsədi həyata keçirmək üçün hansı

üsul və vəsaitləri işə cəlb edəcəksən?

• Uğur qazanacağına əminsənmi?

• Nədə çətinlik çəkəcəyini düşünürsənmi?

Suallara verilən cavabların müqabi-lində söhbət-sorğunu həyata keçirən müəl-limlər dərs deyəcək yoldaşlarının öz qüvvəsinə inamını artıran tövsiyələr verirlər. Qeyd edək ki, belə bir işin təşkil olunması fənn müəllimlərinin öz dərslərinə daha inamlı olmasına şərait yaradır. Çünki belə müşahidələrin mahiyyətində humanizm, insanpərvərlik, qayğıkeşlik, əməkdaşlıq prinsipi dayanır. Açıq dərs keçirildikdən sonra dinlənilən dərsin müzakirəsi aparılır. Açıq dərslər müzakirə edilərkən bütün proses qeydə alınır, sənədləşdirilib məktəbdə saxlanılır. Bu sənədlərdən faydalanmaq və təcrübə mübadiləsi məqsədilə istifadə olunur. Bu dərslərin məqsədi müəllimi yoxlamaq və işinə qiymət vermək deyil, qabaqcıl təcrübəni öyrənməkdir.

İndi isə sizləri liseyimizin metodşurasının vəzifəsinə daxil olan başlıca məsələlərlə tanış edək:

• Qabaqcıl idarəetmə və təlim texnologiyalarının istehsalata tətbiqi;

• Planlaşdırma işlərinin təkmilləşdirilməsi;

• Nəzarət və qiymətləndirmə işlərinin forma və növlərinin təkmilləşdirilməsi;

• Təhliletmə və araşdırma bacarıqlarının təkmilləşdirilməsi;

• Proqram, dərslik və dərs vəsaitlərinin müzakirəsi, qiymətləndirilməsi;

• Metodkomissiyaların işlərinin fəallaşdırılması;

• Qabaqcıl iş təcrübəsinin öyrənilməsi, ümumiləşdirilməsi və yayılması;

• Kompüter texnologiyasının təlimə gətirilmə imkanlarının öyrənilməsi və s.

Liseyimizdə metodşura metodik işləri təşkil etməklə yanaşı müəllimlərin daim öz üzərilərində işləmələrinə, ixtisaslarının artırılmasına, imkan və bacarıqlarının inkişaf etdirilməsinə nəzarət edir və buna çalışır. Metodşura və eyni zamanda metodkomissiyalar qabaqcıl təcrübənin öyrənilməsinə və yayılmasına böyük önəm və yer verirlər. Bu istiqamətdə xeyli işlər görülmüşdür və bu istiqamətdə işlər davam etdirilir. Hər bir kollektiv üzvünün ən son və ümdə məqsədi ölkə iqtisadiyyatı üçün gərəkli peşə biliklərinə, bacarıq və vərdişlərinə mükəmməl yiyələnmiş kadrlar hazırlamaqdır. Bu cür nəticələrə sahib olmaqdan ötrü hər bir təlimin nəticəyönümlülük, şəxsiyyətyönümlülük, inteqrativlik prinsipləri əsasında qurulmasının təmin edilməsinə nail olmaq lazımdır. Peşə təhsilinin məzmunundan irəli gələn işlərin həyata keçirilməsi günün aktual məsələləridir.

***Rəyçi: dos. K.Məcidov***

**Г.Джамалов**

**Организация и управление методических работ**

**Резюме**

В статье говорится об организации и управлении методических работ в профобразовательных лицеях. Автор обосновывал свои мысли ежедневной практикой.

**H.Jamalov**

**Organization and management of methodical work**

**Summary**

The article is about the organization and management of methodical work in the vocational high schools. The author bases his ideas with everyday experiences.

***Arxivimizdən***

# NAXÇIVAN: MAARİF TARİXİMİZİ VƏRƏQLƏRKƏN

Naxçıvan ildən-ilə inkişaf edən, güclü iqtisadiyyata və yüksək mədəniyyətə malik bir diyara çevrilmişdir. O, indi Şərqin qapısında həqiqətən sönməz bir mayak kimi parlayır, səadət arzusu ilə yaşayan xalqlara azadlıq və qurtuluş yolu göstərir.

Naxçıvan torpağı tarixən çox qısa bir müddət ərzində öz köhnə simasını tamamilə dəyişmişdir. Elm, texnika, maarif və mədəniyyət misilsiz bir sürətlə inkişaf edərək yüksək səviyyəyə qalxmışdır. Naxçıvan indi başdan-başa savadlılar ölkəsinə çevrilmişdir. Onun kəndləri, şəhərləri nura qərq olmuşdur.

Naxçıvanda ilk məktəb 1837-ci ildə açılmışdır.

Mürtəcelərin belə məktəblərin yaradılmasını gözləri qətiyyən götürmürdü. Buna görə də onlar rus-azəri məktəblərində oxuyanları el içində rüsvay etməyə çalışır, orada dərs deyənləri “kafir”, “yolundan azmış” adamlar kimi qələmə verirdilər. Mürtəce ünsürlərin bu müqavimətinə, təqib və fitvasına baxmayaraq, 1837-1900-cü illər ərzində Naxçıvan qəzasının və Şərur nahiyəsinin ayrı-ayrı kəndlərində 17 məktəb yaradılmışdı. Bu məktəblərdə oxuyanlar isə çar dövlət idarələrindəki işləri görmək üçün hazırlanırdı.

Lakin bununla belə, çar hökuməti əhalinin savadlanması, məktəbin, müəllimin ehtiyacı üçün qayğı göstərmirdi. Xalqın mənafeyinə uyğun olan məsələlər dövlət dairələrini maraqlandırıb narahat etmirdi. Yaradılmış tək-tük məktəblər isə acınacaqlı halda idi. Məsələn, Ordubad şəhər məktəbinin xüsusi binası olmadığı üçün məktəb Ə.Rzayevin mülkündə yerləşirdi. Sahibkar məktəb üçün hər ay xeyli pul alırdı. Bina məktəb üçün yararlı deyildi. Məktəbin müdiri İrəvan təhsil dairəsinə göndərdiyi raportunda bu haqda belə yazmışdı: “Hazırkı şəraitə görə məktəbin yerləşdiyi bina tələbi qətiyyən ödəmir, kifayət qədər sinif otağı yoxdur, siniflərin çoxu kərpic, qalanları isə torpaq döşəməlidir. Siniflərin çoxunda soba yoxdur, olan sobalar da təmir edilməmişdir. Bütün siniflərə qışda soba qoymaq lazımdır. Bu da darısqal siniflərdə çox yer tutur... Məktəbdə yer olmadığından dərslər mənim evimdə keçilir”...

Çar Rusiyası dövründəki məktəblərin dözülməz vəziyyətdə olmasına dair arxiv sənədlərinə əsasən çoxlu konkret misal çəkmək mümkündür. Buradan da çar hökumətini, yerli xanların, bəylərin məktəblərə necə münasibət bəslədikləri özlüyündə aydındır. Çar hökuməti və yerli hakimiyyət orqanları xalqın maariflənməsinə fikir vermir, onu cəhalət içərisində boğurdu.

Naxçıvanda 1920-ci ildən sonra əhalinin maariflənməsi üçün böyük tədbirlər həyata keçirilməyə başlandı. Naxçıvan İnqilab Komitəsi və Xalq Komissarlar Sovetinin 1920-ci il 20 avqust tarixli xüsusi dekreti ilə ciddi maliyyə çətinliklərinə baxmayaraq, uşaqların oxuması üçün xeyli vəsait ayrıldı. Naxçıvan İnqilab Komitəsinin 1920-ci il 10 oktyabr tarixli qərarına əsasən xalq maarif şöbəsi də yaradıldı. Bu şöbə yeni məktəblər açır, gecə kursları təşkil edirdi. Naxçıvanda maarifi, mədəniyyəti inkişaf etdirməkdə maarif şöbəsinə hərtərəfli kömək göstərilirdi. Maarif məsələlərinin nizama salınması günün çox vacib məsələlərindən biri idi. Buna görə də yeni məktəblərin təşkilinə başlamaq məsələləri müəyyənləşdirildi. 1921-ci ildən etibarən yeni məktəblər yaranmağa başladı. Yeni məktəblərə zəhmətkeş xalqın balaları cəlb edildi. Az vaxt ərzində bu məktəblərə olan maraq olduqca artdı. Təkcə 1921-22-ci dərs ilində 144 sinifli 58 məktəb yaradıldı ki, bu da çar Rusiyasının Naxçıvandakı 93 illik hakimiyyəti ərzində açılan məktəblərin sayından xeyli artıq idi. Təkcə ayrı-ayrı məktəblərin sayına görə

deyil, orada oxuyan uşaqların sayına və təhsil üsuluna görə də yeni məktəblər böyük üstünlüyə malik idi. İlk məktəblərdə 4351 uşaq oxuyurdu ki, bunların da 100 nəfəri qızlardan ibarət idi.

Ölkədə təkcə azəri məktəbləri deyil, digər məktəblər də yaradılmağa başlandı. Başqa sahələrdə olduğu kimi, maarif sahəsində də qarşıya ciddi çətinliklər çıxırdı, xüsusən ixtisaslı kadrlar yox idi. Məktəblərin miqdarına görə müəllimlərin sayı çox az idi. 58 məktəbdə cəmi 86 müəllim çalışırdı.

Onu da qeyd etmək lazımdır ki, bu məktəblər təkcə uşaqlara savad verməklə qalmırdı. Yeni məktəblər həm də Sovet hakimiyyətinin təbliğatçısı rolunu oynayırdı. 1922-ci ilin avqust ayında çağırılan Naxçıvan müəllimlərinin ölkə qurultayı müəllimlərin qarşısında duran çox mühüm və böyük vəzifələri müəyyənləşdirdi. Qurultaydan bir qədər əvvəl isə məktəbləri pedaqoji kadrlarla təmin etmək məqsədi ilə Bakıda və Naxçıvanda qısamüddətli kurslar yaradıldı. Bu kurslarda ilk müəllimlər nəsli tərbiyələndirilib yetişdirildi. Qurultay bir sıra mühüm məsələləri həll etməli idi. Qurultay xalq maarifinin gələcək inkişafını müəyyən edən mühüm qərarlar qəbul etdi. Qurultayın qərarına əsasən 1922-ci il noyabrın 1-dən etibarən Naxçıvanda müəllimlər seminariyası fəaliyyətə başladı. Bu seminariya 1923-cü ildə Naxçıvan pedaqoji texnikumuna çevrildi. Seminariya və pedaqoji texnikum Naxçıvanın ictimai həya-tında çox mühüm rol oynadı. Məktəblərin kadrla təmin edilməsi xeyli dərəcədə yaxşılaşdı.

Məktəblərin şəbəkəsi durmadan genişləndirilirdi. 1924-1925-ci dərs ilində məktəblərin sayı 75-ə çatdırılmışdı. Bu məktəblərə 6575 zəhmətkeş uşağı cəlb olunmuşdu. 1929-cu ildə isə məktəblərin sayı 98-ə çatmış, onlara 10441 şagird qəbul olunmuşdu. Bununla da çar hökumətinin 100 ildən artıq bir müddətə görə bilmədiyi bir iş 9 il ərzində yerinə yetirildi. Müəllimlərin sayı ildən-ilə artdı. 1929-cu dərs ilində müəllimlərin sayı 277 nəfərə çatdırılmışdı ki, bu da inqilabdan əvvəlki müəllimlərin sayından təxminən 3 dəfə artıq idi.

Yeni həyata qədəm qoymuş əhalinin mədəni səviyyəsinin yüksəldilməsi üçün mədəni-maarif ocaqları şəbəkəsini genişləndirmək lazım gəlirdi. Bu sahədə də inqilabdan əvvəl bir iş görülməmişdi. Naxçıvan şəhərində cəmi bir klub fəaliyyət göstərirdi. Tezliklə Naxçıvanda 3 klub, 4 qiraətxana və 1 kitabxana yaradıldı. Bu mədəni-maarif ocaqları da zəhmətkeşlərin tərbiyə yerinə çevrildi. Məktəblərin sayının artırılması kimi, mədəni-maarif ocaqlarının sayının çoxaldılması da daim partiya və hökumətin diqqət mərkəzində dururdu. Buna görə də 1929-cu ildə 8 yeni klub, 6 qiraətxana, 2 teatr yaradıldı. İqtisadiyyatda olduğu kimi, maarif-mədəniyyət sahəsində də çox böyük dönüş yarandı.

İbtidai icbari təhsilin həyata keçirilməsinə və mədəni inqilab üçün şərait yaradılmasına başlandı. Böyük dövlət əhəmiyyəti olan icbari təhsili həyata keçirmək üçün külli miqdarda vəsait ayrıldı. Təkcə onu qeyd etmək kifayətdir ki, icbari təhsili həyata keçirmək məqsədi ilə 1929-30-cu dərs ilində 20 yeni məktəb açmaq qərara alınmışdı. Bundan başqa, bir neçə ibtidai məktəb yeddiilliyə çevrildi. Kəndli gənclər məktəbləri təşkil olundu. Əhalinin savadlandırılmasında ümumtəhsil kurslarının rolu az olmadı. Fəhlələrin istehsalatdan ayrılmadan təhsil alması təmin edildi. Ə.Qarayev adına Ordubad ipək fabrikində, duz mədənində fəhlələr üçün ümumtəhsil kursları təşkil olundu. Bu kurslarla bərabər qısa və uzunmüddətli kurslar, həmkarlar ittifaqı xətti ilə fəhlələr və muzdurlar üçün yeni məktəblər də yaradıldı. Mədəni inqilabın həyata keçirilməsində ümumtəhsil məktəbləri ilə birlikdə bütün bu tədbirlərin yerinə yetirilməsi çox böyük rol oynadı.

İndi muxtar respublikamızda 207 ümumtəhsil məktəbi vardır. Onların 68-i ibtidai, 85-i səkkizillik, 51-i orta, 3-ü isə internat-məktəbdir, bundan başqa, indi beş fəhlə

gənclər və 7 kəndli gənclər məktəbi, 4 əyani-qiyabi şöbə, 1 uşaq idman məktəbi, gənc texniklər stansiyası, 5 pionerlər evi, uşaq mədəniyyət parkı və 24 birləşmiş uşaq bağçası – körpələr evi fəaliyyət göstərir. 18 məktəbyanı internata 369 şagird cəlb edilmişdir. Muxtar respublikanın ümumtəhsil məktəblərində 50 minə yaxın şagird təhsil alır ki, bu da xalq təsərrüfatı planında nəzərdə tutulduğundan xeyli artıqdır. Məktəblərimizdə 2730 müəllim çalışır, bu rəqəm 1912-ci ildə Naxçıvan və Şərur qəzalarında çalışan müəllimlərin sayından təxminən 30 dəfə artıqdır. Müəllimlərimizin 1092 nəfərinin ali təhsili vardır. Bu müəllimlərin 800 nəfərə qədərini qadınlar təşkil edir. Muxtar respublikanın məktəblərində çalışan müəllimlərin 36 nəfəri Azərbaycan SSR-in, 95 nəfəri isə Naxçıvan MSSR-in əməkdar müəllimi fəxri adına layiq görülmüşdür.

Müəllimlərimizin tərbiyə edib yetişdirdiyi gənclərdən 250 nəfərə qədəri elmin müxtəlif sahələri üzrə doktorluq və namizədlik dissertasiyası müdafiə etmişdir.

Yeni məktəb proqramlarının tətbi-qindən irəli gələn vəzifələri dərk edən, qabaqcıl təcrübəni öyrənib yaradıcılıqla öz işinə tətbiq edən müəllimlərimiz çoxdur. Keçən dərs ilində muxtar respublikamızda 86 məktəbin, 909 müəllimin ikilliksiz işləməsi buna misal ola bilər.

Öz işini yaxşı quran, təlim-tərbiyə sahəsində müvəffəqiyyətlər əldə edən məktəblərimizdən Şərur rayonundakı Muğanlı, Ordubad rayonundakı M.T.Sidqi adına 1 nömrəli, Şahbuz rayonundakı Kolanlı məktəblərinin və bir çox başqalarının adını fərəhlə qeyd etmək lazımdır. Həmin məktəblər və bir sıra başqa məktəblər şagirdlərin təlim-tərbiyəsində yüksək nailiyyətlər qazanmışdır. Məktəblərdə Azərbaycan dili, rus dili, fizika, riyaziyyat, kimya, biologiya fənlərinin tədrisi xeyli yaxşılaşmışdır.

Şərur rayonundakı Muğanlı kənd ibtidai məktəbinin müəllimi M.Seyidov öz işini günün tələbləri səviyyəsində qurmuş, şagirdlərə dərin bilik verməyə nail olmuşdur. O, pedaqoji ədəbiyyatı ardıcıl izləyir, iş təcrübəsinə dair dövri mətbuatda çıxış edir. Buna görə də onun dərs dediyi şagirdlər yüksək mənimsəməyə nail olurlar. Naxçıvan şəhərindəki 1 nömrəli tam orta məktəbin kimya müəllimi E.Qasımova ixtisasını yaxşı bilir, şagirdlərinə müstəqil təcrübə aparmaq bacarığı verir. Keçən dərs ilində aparılan buraxılış imtahanları bunu bir daha sübut etdi. İmtahan biletlərinə və əlavə suallara şagirdərin verdikləri cavablar proqram materiallarını onların dərindən mənimsədiyini nümayiş etdirdi. Belə müəllimlərimiz çoxdur. Onların hər biri haqqında ayrıca danışmaq olar.

Qabaqcıl müəllimlərin təcrübəsinin ümumiləşdirib yayılmasında, müəllimlərin ixtisasının artırılmasında Naxçıvan Müəllimləri Təkmilləşdirmə İnstitutu böyük rol oynayır. Təkcə keçən dərs ili ərzində ayrı-ayrı kurslarda və seminarlarda 620 nəfər müəllim və məktəb rəhbəri öz ixtisasını təkmilləşdirmişdir. İnstitut gənc riyaziyyatçıların, fiziklərin və kimyaçıların respublika olimpiadasını keçirmişdir.

Yubiley ilini iftixarla qarşılayan müəllimlərimiz pedaqoji ustalıqlarını, ixtisaslarını gündən-günə artırır, şagirdlərin tərbiyəsinə daha böyük qayğı və həssaslıqla yanaşırlar. Onların səmərəli əməyi nəticəsində təkcə bu il 1814 şagird orta təhsili başa vurmuşdur. Orta məktəbi qurtaranlardan 17 nəfəri qızıl, 28 nəfəri isə gümüş medalla təltif olunmuşdur. Minə qədər gənc isə axşam, qiyabi orta təhsil alanların sayı nə qədər çoxalmışdır. VIII sinifləri qurtaranların əksəriyyətinin IX sinifdə öz təhsilini davam etdirməsi sevindirici haldır. Bu il məktəblərimizin IX siniflərində 2550 əvəzinə, 2615 şagirdin oxuduğu deyilənə misal ola bilər.

Məktəblərin maddi-texniki bazasının möhkəmləndirilməsi şagirdlərin təlim-

tərbiyəsini günün tələbləri səviyyəsində qurmağa imkan vermişdir. Keçən dərs ili müddətində məktəblərimizin 72-də fizika, 51-də kimya, 16-da evdarlıq, 21-də maşınşünaslıq, 6-da elektrotexnika, 35-də digər tədris kabineti və emalatxanası fəaliyyət göstərmişdir. Kabinet və emalatxanalarda 1180 şagird yeri düzəldilmişdir. Bundan başqa, muxtar respublikamızda olan məktəblərin 135–də tədris-təcrübə sahəsi yaradılmışdır. Fənn kabinetləri və emalatxanalar xeyli zənginləşdirilmişdir.

Əldə edilmiş müvəffəqiyyətlərin möhkəmləndirilməsi, şagirdlərin kommunistcəsinə tərbiyələndirilməsi işində yeni nailiyyətlər əldə edilməsi, avqust müşavirələrində aşkara çıxarılan nöqsan və kəsir cəhətləri aradan qaldırılması üçün 1967-68-ci dərs ilinə mütəşəkkil hazırlıqla başlanmışdır. Bu il məktəblərimizdə təhsil alcaq 49979 şagirdin hamısının parta arxasında əyləşməsi təmin edilmişdir. Təhsildən kə-narda qalan, məktəbdən yayınan şagirdlərin olmaması üçün qabaqcadan lazımi tədbirlər görülmüşdür.

Muxtar respublikamızda şagird kontingenti sürətlə artır. Buna görə də hələ ilin əvvəlindən yeni məktəb və əlavə sinif otaqları tikmək üçün bir sıra tədbirlər yerinə yetirilmişdir. 1967-ci ildə muxtar respublikamızda məktəb və digər uşaq tərbiyə müəssisələrinin tikintisi üçün 900 min manatlıq vəsait ayrılmışdır. Hazırda Ordubad və Culfa şəhərlərində hərəsi 964, Bənəniyar kəndində 640, Dəstə kəndində 53 yerlik yeni məktəb binaları, Culfa şəhərində 140, Şərur qəsəbəsində 90 yerlik uşaq bağçası tikilir. Naxçıvan şəhərində 960 yerlik məktəb və 140 yerlik uşaq bağçası binalarının tikintisinə başlanmışdır. Yeni dərs ili ərəfəsində Naxçıvan şəhərində 964 yerlik orta məktəb, 140 yerlik uşaq bağçası – körpələr evi istifadəyə verilmişdir. Hər il olduğu kimi, bu il də maarifpərvər kolxozçuların və ictimaiyyətin köməyi ilə çoxlu məktəb binası və əlavə sinif otağı, köməkçi bina şagirdlərin sərəncamına verilmişdir. Zəhmətkeşlərin köməyi ilə 4 məktəb binası və 2970 yerlik 114 sinif otağı tikilmişdir.

Təlimin keyfiyyətini yüksəltmək məqsədi ilə yeni dərs ilində 10 məktəbdə texniki təlim vasitələrindən tam istifadə etmək üçün xüsusi kabinetlər təşkil olunub müxtəlif kino-aparatlar, maqnitafon və başqa cihazlarla, tədris filmləri ilə təchiz edilmişdir. Yaxın 4 il ərzində bütün orta və səkkizillik məktəblərdə belə kabinetlər yaratmaq nəzərdə tutulmuşdur.

Son illərdə muxtar respublikamızda müəllim kadrlarına böyük ehtiyac hiss edilirdi. Bunu aradan qaldırmaq üçün bu il Naxçıvan şəhərində APİ-nin filialı təşkil olunmuşdur.

Ölkəmizin ayrılmaz parçası olan Naxçıvan, onun iqtisadiyyatı, xalq maarifi inkişaf edir. Xalq maarifi işçilərimiz, müəllimlərimiz xalq balalarının dövrün yeni adamları kimi tərbiyə olunmaları üçün bundan sonra da var qüvvəsini əsirgəməyəcəklər.

**Məmməd Bəktaşi,**
**"Azərbaycan məktəbi" jurnalı,**
**1 9 6 7, № 11**

**Redaksiyanın qeydi:** Məqalənin müəllifi o zaman Naxçıvan MSSR maarif naziri vəzifəsində işləyirdi. O uzun müddət Naxçıvan MTİ-nin direktoru olmuşdur. Onun adı təhsilimizin veteranları sırasında fəxarətlə çəkilir. M.Bəktaşi Azərbaycan maarifinin ən görkəmli nümayəndələrindən biridir. Məmməd müəllimin xatirəsi nəinki Naxçıvanda, bütün Azərbaycanda əziz tutulur. Allah ona rəhmət eləsin.

**Redaksiya**

# AZƏRBAYCAN MAARİFİNİN GÜZGÜSÜ

“Azərbaycan məktəbi” jurnalı, Azərbaycanda xalq maarifinin inkişafına əməli xidmət göstərmiş ən dəyərli dövri mətbuat orqanı hesab olunur.

Jurnalın mövcud olduğu müddətdə göstərdiyi xidmətin bir neçə mühüm istiqamətini qeyd edə bilərik. Onlardan:

Birincisi, Azərbaycanda pedaqoji və psixoloji fikrin inkişaf dinamikasının məqbul səviyyədə işıqlandırılması.

İkincisi, Azərbaycanda təhsil quruculuğu təcrübəsinin ümumiləşdirilməsi və sistemlə çap edilməsi.

Üçüncüsü, təlim və tərbiyə nəzəriyyələrinin formalaşdırılmasına kömək edən tədqiqatların əsas ideyalarının ardıcıl işıqlandırılması.

Dördüncüsü, Azərbaycanın yaradıcı və zəhmətsevər maarifçilərinin xalqa ətraflı tanıdılması.

Beşincisi, təhsili idarəetmənin müxtəlif yollarının, forma və metodlarının çox geniş işıqlandırılması.

Altıncısı, məktəb, ailə və ictimaiyyətin təlim-tərbiyədə əlbir fəaliyyətinin yolları barədə geniş materialların əks olunması.

Yeddincisi, yüksək ixtisaslı elmi-pedaqoji kadrların yetişməsinə yardım.

Səkkizincisi, pedaqoji kadrların hazırlanması, təkmilləşdirilməsi və yenidən hazırlanması problemləri üzrə ardıcıl materialların, təkliflərin işıqlandırılması.

Doqquzuncusu, xarici ölkələrdə xalq maarifi üzrə biliklərin maarifçilərimizə təqdim olunması.

Onuncusu, pedaqoji və psixoloji biliklərin, qabaqcıl pedaqoji iş təcrübəsinin, dünyanın mütərəqqi təhsil quruculuğu nailiyyətlərinin, maariflənmək mədəniyyətinin sistemli təbliği.

Azərbaycanda maarifin və pedaqoji fikrin tarixini öyrənməklə məşğul olan mütəxəssislərimizin araşdırmalarının əsas nəticələrini öz səhifələrində ardıcıl çap etməklə, jurnal həqiqi mənada bir dəyərli salnamə yaratmışdır. Belə ki, xalqımızın tarixinin müxtəlif mərhələlərində böyüyən nəsillərin hansı yollarla və necə tərbiyə edilmələri barədə ümumi bir mənzərəni görmək imkanını gerçəkləşdirmişdir.

Məlum olduğu kimi, Azərbaycanda xalq maarifinin dövlət səviyyəsində sistemli təşkili XX əsrə aiddir. Lakin böyüyən nəsillərin təlim-tərbiyəsinə, inkişafına, dünyanı dərk etməsinə qayğı çox qədimlərdən başlamışdır. Təəssüf ki, bu barədə nailiyyətlər xəzinəsinin hələlik cüzi hissəsini öyrənə bilmişik.

Jurnal elmi pedaqogikanın, pedaqoji psixologiyanın, fənlərin tədrisi metodikasının yaranmasında, inkişafında və təbliğində xüsusi fərqlənmişdir.

Jurnalın xalqın maariflənməsində əməli köməyini, xalq maarifinin inkişafı üzrə ayrı-ayrı dövrlərdə irəli sürülmüş vəzifələrlə necə ayaqlaşdığını xatırlamaqla da duya bilərik. Belə ki, iyirminci illərdə kütləviliklə savadsızlığın ləğvi tələbi irəli sürülmüşdür. Jurnal ümummilli əhəmiyyətli işə fəal qoşuldu. Otuzuncu illərdə icbari ibtidai təhsili həyata keçirmək vəzifəsi irəli sürüldü. Jurnal fəaliyyətini bu istiqamətə yönəltdi.

Qırxıncı illərdə icbari 7 illik təhsilə keçmək vəzifəsinin yerinə yetirilməsində jurnal geniş fəaliyyət göstərdi.

Əlli – altmışıncı illərdə icbari 9 və 11 illik təhsil sisteminə keçid geniş ölçüdə aparıldı. Jurnal bu sistemə keçidə elmi-pedaqoji istiqamət verdi, faydalı təcrübənin öyrənilib yayılmasında çox səmərəli iş apardı.

Yetmişinci illərin əvvəllərindən başlayaraq, jurnal, təhsilin elmi-nəzəri problem-

lərinin həllinə kömək göstərən tədqiqat nəticələrinin çapına daha çox yer verdi.

Hamılıqla 11 illik təhsilin həyata keçirilməsinə, məktəb şəbəkəsinin genişləndirilməsinə, təhsil-tərbiyə müəssisələrində keyfiyyətin artırılmasına xüsusi qayğı göstərildi.

Təhsil sisteminin təkmilləşdirilməsi, pedaqoji işin keyfiyyətinin artırılması, ali təhsilli kadrların sayının çoxalması, bunlarla bərabər pedaqoji və psixoloji elmlərin inkişaf sürətinin artması jurnalın da işini çoxaldırdı. Ona görə də, jurnala əlavə kimi fənlər üzrə 1947-1972-ci illər arasında 8 adda metodik məcmuələr yaratmaq zərurətə çevrildi. Müxtəlif vaxtlarda yaradılmış "İbtidai məktəb və məktəbəqədər tərbiyə", "Fizika, riyaziyyat və informatika", "Azərbaycan dili və ədəbiyyat tədrisi", "Tarix, coğrafiya, ictimaiyyat tədrisi", "Kimya və biologiya tədrisi", "Əmək və politexnik təlim", "Məktəbdə bədən tərbiyəsi" (sonralar adlarında qismən dəyişikliklər aparılmışdır) yarandı.

Bu tədbir imkan verdi ki, "Azərbaycan məktəbi" jurnalı pedaqogika nəzəriyyəsi və tarixi problemlərinə, məktəbşünaslıq məsələlərinə aid materialların işıqlandırılmasına daha çox yer ayıra bilməz.

"Azərbaycan məktəbi" jurnalı Azərbaycan maarifinin uzun müddət fəaliyyətinin həqiqi tarixi, onun güzgüsü olmaqla yanaşı, hər bir pedaqoqun, məktəb rəhbərinin də həyatının, uğurlarının və müvəffəqiyyətsizliyinin həqiqi göstəricisi sayıla bilər.

"Azərbaycan məktəbi" jurnalı fəaliyyəti dövründə bütün Azərbaycan ziyalılığının ən etibarlı yol yoldaşı olmuşdur. Respublikada yetişmiş 1000 nəfərdən çox pedaqoji və psixoloji elmlər namizədi və doktorun hər biri özünün formalaşması, elmi fəaliyyəti üçün "Azərbaycan məktəbi" jurnalına minnətdardır.

Bizcə, eyni ilə "Azərbaycan məktəbi" jurnalı da şərəflənməsində, yaşamasında, uğurlar qazanmasında mühüm rolu olan yaradıcı ziyalılarımıza, gözəl müəllimlərimizə minnətdardır. Çünki onun məzmunu həmin insanların əməyinin nəticəsidir.

Jurnal ziyalılığın inkişafına, ziyalılarımız isə jurnalın fundamental maarif bilgiləri xəzinəsinə çevrilməsinə qarşılıqlı xidmət göstərmişdir.

1900-1993-cü illərdə xalq maarifini fəlakətə uğratmış naşı, səriştəsiz, dağıdıcı qüvvələr – inqilabçı ölkə rəhbərlərinin cinayətləri "Azərbaycan məktəbi" jurnalından və ona əlavə metodik məcmuələrdən də yan keçmədi. "Maarifi inqilabi yolla dəyişəcəyik!" şüarı altında jurnalların nəşrini dayandırdılar, onları maliyyələşdirməkdən imtina etdilər. Bu, təkcə onların maarifdən baş çıxarmaq qabiliyyətsizliklərindən deyil, eyni zamanda bəşəriyyətin inkişaf qanunauyğunluqlarından xəbərsizliklərindən irəli gəlirdi.

"Azərbaycan məktəbi" jurnalının 1990-cı ildən indiyə qədər özünü saxlamasını onun yaradıcı kollektivinin, redaksiya heyətinin şərəfli əməyi kimi qiymətləndirməliyik. Onlar bilirdilər ki, maarif mətbuatının bağlanması maarifin ölümünü yaxınlaşdıran addımdır. Odur ki, öz güclərinə, maarifçi alimlərimizin müdafiəsinə arxalanmaqla jurnalın çapını dayandırmalıdırlar.

Maarif sistemi özünün köklü islahatını gözləyir. Bu prosesdə maarif mətbuatının rolu nəzərə alınmalıdır.

İndi Azərbaycanın elə bir mərhələsidir ki, hər şey: iqtisadi-siyasi sistem, mülkiyyət formaları kökündən dəyişir. Qloballaşan dünya prosesləri Azərbaycanın da həyatını idarə edir. Dünyanın mötəbər birlikləri Azərbaycanda gedən dəyişmələrə fəal surətdə qoşulur və təkan verir. Dünya dövlətləri ilə yeni münasibətlər qurulur. İslam elmi və tərbiyəsi insanların həyatına, mənəviyyatına daxil olur.

**Zahid Qaralov,**
***pedaqoji elmlər doktoru, professor***

**"Azərbaycan məktəbi" jurnalı,**
**1 9 9 9, № 6**

# BİZƏ YAZIRLAR

**Göyçay RTŞ-nin metodisti, filologiya üzrə fəlsəfə doktoru Əkbər Əlioğlu “Müəllim nüfuzu”** adlı məqaləsini ömrünün 38 ilini müəllimlik peşəsinə həsr etmiş bir ziyalı müəllim olan, şair təbiətli təbiət vurğunu Səfayə müəlliməyə həsr etmişdir. Səfayə müəllimə Aran torpağının gözəl guşəsində - Göyçayda dünyaya göz açmış, ilk təhsilini də elə burada almışdır. O, şəhər 2 saylı tam orta məktəbin həm məzunu olmuş, həm də ilk dəfə əlində jurnal müəllimlik fəaliyyətinə bu məktəbdə başlamışdır.

Hələ məktəbli ikən onun ən böyük arzusu həkim olmaq, bütün canlıların əşrəfi olan insanların sağlamlığı qayğısına qalmaq idi. Lakin qismət onu Bakı Dövlət Universitetinin biologiya fakültəsinə apardı. O burada öz təhsilini müvəffəqiyyətlə başa vurub, bioloq kimi öz doğma məktəbinə müəllim kimi qayıtdı. İllər keçdikcə gənc müəllimə öz sənətinin ucalığını dərk edib bu sənətin vurğunu oldu. Axı həyat, canlı aləm haqda öyrənən biologiya elmi, həm də təbabətin gizli sirlərinin açarını özündə saxlayırdı. Müəllimlik peşəsinin nə qədər nüfuzlu olması, cəmiyyətdə xüsusi hörmətə layiq olması, bu sənəti onun gözündə daha da ucaldırdı. S.Seyidova işlədiyi kollektivdə müəllim və şagirdlərin sevimlisi idi, bu da ona xüsusi fərəh və xoşbəxtlik hissi gətirirdi. Keçdiyi dərsləri daha yüksək səviyyədə qurmağa, savadlı gənclər yetişdirməyə çalışan müəllimə öz yüksək insani keyfiyyətləri ilə hamının sevimlisinə çevirilmişdi. Bütün bunlar nəzərə alınaraq 2015-ci ildən etibarən RTŞ-nin etimadı ilə S.Seyidova irəli çəkilərək RTŞ-də biologiya fənni üzrə metodist vəzifəsinə təyin olundu. Öz metodiki tövsiyə və göstərişlərinə, gənc kadrlara göstərdiyi yüksək qayğısına görə o, rayon biologiya müəllimləri arasında da yüksək nüfuza sahib olmuşdur.

S.Seyidova onlarla həkim, bioloq yetişdirmişdir. Onlardan həkim kimi fəaliyyət göstərən E.İbrahimovu, S.Abdullayevanı, M.Əliyevi, İ.Əzimovu və başqalarını misal göstərmək olar. Müəllim kimi fəaliyyət göstərənlər də az deyil. Biologiya müəllimləri Ə.Mehriban, M.Günel, Ə.Aynur və s. isə biologiya elminin sirlərini öz şagirdlərinə öyrətməklə öz müəllimlərinin yolunu davam etdirirlər.

Metodist S.Seyidova həm də poeziyaya bağlı bir insan kimi onlarla şeir müəllifidir. Onun şeirləri vətənə sevgi, valideynlərə hörmət, milli-mənəvi dəyərlərimizə dərin ehtiram ruhunda yazılardı. S.Seyidova öz şeirlərində Vətən sevgisinin ən ali sevgi hissi olduğunu əks etdirir.

“Qələbə gözləyirik”, “Əsgər məktubu”, “Vətənimdir Azərbaycan” və s. adlı şeirləri onun vətənpərvər olduğunu bir daha təsdiq edir.

Lakin hamı kimi onun da qəlbinin ən ağrılı yeri Qarabağ həsrətidir. O, öz arzusunu belə qələmə almışdır:

Bu gün intizardadır şəhidlərin ruhları,
Alınacaq düşməndən onların qisasları.
Ucalar Qarabağda Azərbaycan bayrağı,
Sevinib şadlıq edər Azərbaycan torpağı.

Damarlarında Azərbaycanlı qanı axan hər bir kəs bu arzuya amin deyib, o xoşbəxt günlərin gələcəyi günü səbirsizliklə gözləyir.

S.Seyidovanın şeirlərindən birində olduğu kimi;

Dolub səbir kasamız, haqsızlığa dözmürük,

torpağımız uğrunda şəhidlikdən bezmişik.

Ali Baş Komandanın əmrini gözləyirik,
Irəli Azərbaycan, qələbə gözləyirik!

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşı Mətanət Abbasova "Şagirdlərdə tənqidi təfəkkürün inkişafı"** adlı məqaləsində yazır. Şagirdləri yaşadığımız dövrün və cəmiyyətin tələblərinə uyğun yetişdirmək vəzifəsi də məktəbin üzərinə düşür, çünki məktəb təhsil sistemində bir çox sosial funksiyaları yerinə yetirmə baxımından, şəxsiyyətin sosiallaşması, təlim-tərbiyəsi və inkişafı nöqteyi-nəzərdən çox vacib nüvədir.

İnformasiya cəmiyyətində şagirdlərin fikirlərini ifadə edə bilməsi, səbəb-nəticə əlaqəsinə bağlı olaraq düşünməsi və yeni biliklərə yiyələnməsi, qazandıqları yeni biliklərlə təhsilin növbəti üst məqamına qədəm qoyması zəruridir.

Əqli prosesin yeni üslubu olan tənqidi təfəkkür keçən əsrin 80-ci illərindən Amerikada, 90-cı illərindən isə Avropa ölkələrində formalaşmağa başlamışdır. Tənqidi təfəkkürün vəzifələri bunlardır:

- Müəyyən etmək: mətn və ya nitq konkret olaraq kimin dəyərlər toplusunu və istiqamətlərini özündə əks etdirir.
- Hökmün birmənalı olduğunu şübhə altına almaq.
- Öz düşüncələrində vicdanlı və ədalətli olmaq.
- Yanlış nəticələrə gətirib çıxara bilən mənfi yanaşmaları müəyyən etmək.
- Hadisələrə qərəzli yanaşmadan qaçmaq.
- Həmişə yoxlanması mümkün olan faktları şəxsi münasibətdən və ehtimallardan fərqləndirməyi bacarmaq.
- Şifahi və yazılı nitqin məntiqi ardıcıllığındakı çatışmazlığı şübhə altına almaq.

Tənqidi düşüncə bütün dünyada vicdan azadlığını tənzimləyən bir vasitədir. Bu cəhətdən körpə uşaqların namaza öyrədilməsi və dini ayinləri kor-koranə yerinə yetirməsi qəbul edilən deyil. Biz onun tərəfindəyik ki, hər bir kəs müqayisələr aparmaqla, yaxşını pisdən, düzü əyridən seçməklə obyektiv varlığı dərk etsin. Hagemanna görə tənqidi fikirlər, ədalətli və dəqiq yanaşma aydın və məntiqi düşüncə yolunu təşkil edir və nizama salır.

• Yaradıcı fikirlər. Bu, məsələlərin həlli və inkişaf üçün vacibdir. Hagemann deyir: "Əgər siz bu barədə fikirləşirsinizsə, hər şey sizin yaradıcı fikirlərinizlə başlayır: toxunduğunuz hər şey, yolunuzun üstündəki binalar belə. Odur ki, bizim liderlik fəaliyyətimizdə yaradıcı olmaq son dərəcə vacibdir".

• Problemlərin həlli. Problemləri tez aradan qaldırmaq üçün problemlərin həllində, qərarları dəyərləndirən zaman mümkün qədər cəld olmaq lazımdır.

• Qərar qəbul etmək. Bu, adətən, sərt qərarların qəbul olunması və hesabata hazırlıq üçün bir sınaqdır.

Ümumiyyətlə, tənqidi sona qədər dinləmək, eşitmək və dözümlə qarşılamaq özü bir bacarıqdır, sənətdir. Bəzən yersiz, lazım olmayan tənqidlərə də rast gəlinir. Lakin bunlar bir çox hallarda qərəzli, şəxsi simpatiya və antipatiyadan doğur. İstənilən tənqiddə inkişaf istəyi, arzusu varsa, bu artıq qəbulolunandır.

Tənqidi təfəkkür bir sıra səbəblərə görə vaxt tələb edir. Hər hansı bir yeni informasiya haqda diqqətlə düşünməzdən əvvəl, insana bu mövzu barədə artıq nə düşündüyünü və nəyə inandığını müəyyən etmək üçün vaxt lazımdır. Şəxsin öz fikirlərini aydınlaşdırması bir sıra əvvəlki fikir, inam, ziddiyyət və təcrübələrin tədqiqinə gətirib çıxarır.

Dərketmə və öyrənmə (təhsil) prosesinə cəlb etmənin zəif olduğu yerdə tənqidi təfəkkür yoxdur. Şagirdlər tənqidi düşünməyə həvəsləndiriləna və dərketmə prosesinə qoşulana qədər tənqidi təfəkkürü yaxın buraxmırlar.

Təhsilin keyfiyyətini yüksəltmək üçün pedaqoji-metodiki bacarıqları, fənn üzrə bilikləri artırmaq, innovativ təlim metodologiyasının və resursların mənimsənilməsi üçün hər bir müəllimi ixtisasartırma tədbirlərinə cəlb etməklə, təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılmasının vacibliyi,öz həllini gözləyən vacib məsələlərdir.

**Respublikanın əməkdar müəllimi Zülfiyyə Vəliyeva "Milli mənlik şüurunun formalaşması təhsil-tərbiyə prosesinin qarşısında dayanan mühüm vəzifə kimi"** məqaləsində milli-mənlik şüuruna yiyələnmək üçün təhsilalanlarla aparılan işlərdən söhbət açır. Müəllif qeyd edir ki, hər bir uşaq, yeniyetmə və gənc milli ruhda tərbiyə almalı, zəngin tariximizə bələd olmalıdır.

İstedadlı, zəkalı dahilər də ilk təhsilini məktəbdə alıb. Belə şəxsiyyətlər bütün zəka sahibləri olan insanlar ilahi qüdrətin əlamətlərinin əsas daşıyıcılarıdırlar. Belə şəxsiyyətlər bütün xalqların fəxridir. Azərbaycan xalqı belə şəxsiyyətləri yetişdirməli və onların ənənələri gənc nəslə miras qalmalıdır. Müəllif fikrini yekunlaşdıraraq qeyd edir ki, xalqımızın gələcəyi olan gənc nəsil öz dahilərini, zəkalı insanlarını tanımalı, onlardan öyrənərək böyük tarixi hadisələrin iştirakçısı olmalıdırlar. Sağlam gənc nəsil yalnız böyük şəxsiyyətlərin nümunəsində tərbiyə olunub, yetişir.

**Suraxanı rayonundakı 114 nömrəli tam orta məktəbin müəllimləri Səbinə Cəfərova, Sədaqət Əsədova, Südabə Abdullayeva** Azərbaycan ictimaiyyətinə tanış olan görkəmli alimlər haqqında məqalələr yazmışlar. Müəllimlərin həmin şəxsiyyətlər barədə xoş sözləri oxucu münasibəti kimi dəyərləndirilməlidir. Lakin çox təəssüf ki, jurnalın profilinə uyğun olmayan məqalələr jurnalda dərc olunmur. Yaxşı olar ki, həmin müəllimlər öz ixtisaslarına uyğun sahələrdən, iş təcrübələrindən bəhs edən məqalələr yazsın. Jurnalda belə şəxsiyyətlər haqqında məqalələr isə, əsasən, həmin sahədə elmi potensialı imkan verən müəlliflər tərəfindən yazılır. Bu da çox zaman rəsmi yubileylərlə bağlı olur.

"Azərbaycan məktəbi" elmi-nəzəri və pedaqoji jurnaldır. Jurnalın son səhifələrində müəlliflərə məsləhətlər də verilmişdir. Jurnalımız profilə uyğun məqalələrin yolunu gözləyir.

**ARTİ-nin böyük elmi işçisi Günel Əhmədova "İntellektual problemli kiçikyaşlı məktəblilərin görmə yaddaşının xüsusiyyətləri və onun diaqnostikası"** adlı məqaləsində elmi-psixoloji, tibbi-pedaqoji problemlərə toxunmuşdur. İntellektual problemli uşaqlara, o cümlədən məktəbəqədər yaşlı uşaqların görmə yaddaşının müayinəsi, qısamüddətli görmə yaddaşın həcmini müəyyən edən metodla "fiquru tanı" metodikası və b. məsələlər barədə maraqlı fikirlər söylənmişdir. Məqalədə deyilir: "Körpəlik dövründə uşaqlarda hafizənin ilkin təzahürləri müşahidə olunur. Körpədə ilk şərti reflekslər iki həftəlikdə qida qıcıqlandırıcılarının təsiri altında yaranır. Beş aylıqda körpədə bütün analizatorların iştirakı ilə şərti reflektor rabitələr yaranır ki, bu da hafizə proseslərinin təşəkkülünə imkan verir. Uşaqlarda hafizənin ilkin forması tanı-

madan ibarət olur. Onlar ətrafındakı simaları, əşyaları tanıyır və onlara qarşı emosional reaksiya göstərirlər. Niyyətli, ixtiyari yadasalma uşaqlarda ilk dəfə 3-4 yaşlarında müşahidə olunur ki, bu da uşağın oyunda, hər hansı digər fəaliyyət növündə fəal iştirakı ilə şərtlənmiş olur (qaydaların, şərtlərin, sözlərin və s. yada salınması)".

Məqalə belə yekunlaşır: "Yaddaşın müxtəlif növlərinin diaqnostikası və inkişafı uşaqarın ümumi psixi inkişafına müsbət təsir göstərir. Bu baxımdan da, şərh edilən metodikalardan istifadə olunması xüsusi didaktik əhəmiyyət daşıyır".

**ADPU-nun "Pedaqoji təhsilin prob-lem-ləri" elmi-tədqiqat laboratoriyasının kiçik elmi işçisi Sevinc Kərimova "Ali Pedaqoji təhsildə keyfiyyətin idarə olunmasına müasir yanaşmalar"** adlı məqaləsində Azərbaycanın ali təhsil müəssisələrində mütəxəssis və elmi-pedaqoji kadr hazırlığından bəhs edir. Müəllif təhsilin keyfiyyəti, təhsildə tərbiyə məsələlərinin qoyuluşu və həlli problemlərinə toxunur. Müəllif yazır: "Təhsilin məqsədinə qoyulan tələb və müddəalar onun məzmununda öz əksini tapmalıdır. Yəni təhsilin məzmunu təhsilalanlarda müasir tələblərə və şəraitə uyğunlaşma, rəqabətqabiliyyətli olma, infromasiya cəmiyyətində yaşayıb fəaliyyət göstərmə, ünsiyyət yaratma bacarığı olan, yüksək intellektual səviyyəyə və praktiki iş qabiliyyətinə, yeni texnologiyalara yiyələnən yaradıcı şəxsiyyət və vətəndaş yetişdirməyə qadir olmalı, cəmiyyətin yüksək səviyyəli və rəqabət qabiliyyətli kadr potensialına olan tələbatının ödənilməsi üçün real zəmin yaratmalıdır. Təhsilin məzmununa və təhsil prosesinin təşkilinə dair ümumi tələblər Qanunla və digər normativ-hüquqi aktlarla tənzimlənir. Təhsilin məzmunu müəyyən tip tədris müəssisələrində öyrənilmək üçün seçilmiş bilik, bacarıq və vərdişlər sistemidir. O, tədris planı, proqram (kurikulum), dərslik və dərs vəsaitlərində tərtib olunur. Bu sistemlər pedaqoji prosesin tərkib hissəsini təşkil edir. Pedaqoji proses şəxsin təhsili, təlimi, tərbiyəsi ilə bağlı sistemli, fasiləsiz, planlaşdırılmış fəaliyyəti əhatə edir. Pedaqoji prosesin keyfiyyət göstəricisi təhsil, təlim və tərbiyənin vəhdəti və planlı təşkilindən asılıdır. Öyrədən və öyrənənin qarşılıqlı münasibətlərinin ahəngdarlığı, bu prosesdə ümumi məqsədin, qanunauyğunluq və prinsiplərin, forma və metodların işlənməsi, yenilənməsi, mövcud tələblərə cavab verməsinə diqqət edilməsi vacibdir. Təhsil, təlim və tərbiyə prosesləri özlərinə məxsus spesifik xüsusiyyətlərə malik olsa da, hamısı ümumi bir məqsədə - şəxsiyyətin inkişafına xidmət edir.

Pedaqoji prosesin fəaliyyət sahəsi olan təlim – öyrətmək prosesidir. Təlim prosesinin xarakteri, məzmunu və təşkili formaları cəmiyyətin tələbi ilə, elmi-texniki tərəqqinin təsiri ilə müəyyən olunur. Təlim elə təşkil edilməlidir ki, tələbə müşahidələr aparsın, faktlar toplasın, onları mücərrəd təfəkkürdə təhlil etsin, fikri əməliyyatlar aparsın, problemləri həll etsin, nəzəri biliklərini həyata və çalışmalara tətbiq etsin, müstəqil, yaradıcı düşünmək və işləmək bacarıqlarına yiyələnsin. Təlim üç başlıca funksiyanı yerinə yetirir: öyrətmək, tərbiyə etmək və inkişaf etdirmək. Təlim prosesi öyrətmə fəaliyyətinin bütün ünsürlərini özündə əks etdirir".

**Hazırladı: Səfər Əhmədbəyli,**
***"Azərbaycan məktəbi" jurnalının əməkdaşı***